Jurnal 25.04.2007-ci ildə
Azərbaycan Respublikası
Ədliyyə Nazirliyi
Mətbu nəşrlərin
reyestrinə daxil edilmişdir.
Reyestr № 2212

---

On 25.04. 2007, the journal was included in the register of Press publications of the Ministry of Justice of the Azerbaijan Republic. Registration No. 2212

Azərbaycan Mətbuat Şurası

Azerbaijan Press Council

---

**Redaksiyanın ünvanı**
AZ1073, Bakı şəh.,
Mətbuat prospekti, 529,
“Azərbaycan” nəşriyyatı,
6-cı mərtəbə

**Editorial address**
AZ1073, Baku,
Matbuat avenue, 529,
“Azerbaijan” Publishing House,
6-th floor

**Tel.:** +994 50 209 59 68
+994 55 209 59 68
+994 99 809 67 68
+994 12 510 63 99

**E-mail**
elmmerkezi@aem.az

## Beynəlxalq indekslər / International indices

ISSN: 2663-4619
e-ISSN: 2708-986X
DOI: 10.36719

**Assoc. Prof. Dr. Aydan KHANDAN**, Baku State University / Azerbaijan
**Assoc. Prof. Dr. Elchin BAYRAMOV**, Baku State University / Azerbaijan
**Assos. Prof. Dr. Iosefina BLAZSANI-BATTO**, Romanian Language and Cultural Center / Romania
**Dr. Agshin ALIYEV**, Beijing Foreign Studies University / The Republic of Chine
**Dr. Rovshan RAMIZOGHLU**, Seljuk University / Turkey

### Natural sciences section

**Prof. Dr. Vagif ABBASOV**, Institute of Petrochemical Processes of ANAS / Azerbaijan
**Prof. Dr. Onur URAL**, Seljuk University / Turkey
**Prof. Dr. Georgi DUKA**, Moldova Academy of Sciences / Moldova
**Prof. Dr. Nikolay BRIKO**, First Moscow State Medical University named after I.M.Sechenov / Russia
**Prof. Dr. Mehmet KARATASH**, Nejmettin Erbakan University / Turkey
**Prof. Dr. Ibrahim JAFAROV**, ANAS / Azerbaijan
**Prof. Dr. Elshad GURBANOV**, Baku State University / Azerbaijan
**Prof. Dr. Matanat AFANDIYEVA**, National Institute of Sports Medicine and Rehabilitation / Russia
**Prof. Dr. Eldar GASIMOV**, Azerbaijan Medical University / Azerbaijan
**Prof. Dr. Duygu KILICH**, Amasya University / Turkey
**Prof. Dr. Nuran ABDULLAYEV**, University of Cologne / Germany
**Prof. Dr. Afat MAMMADOVA,** Baku State University / Azerbaijan
**Prof. Dr. Zohrab GARAYEV**, Azerbaijan Medical University / Azerbaijan
**Prof. Dr. Shahana HUSEYNOVA**, Technical University of Berlin / Germany
**Prof. Dr. Ibrahim MAMMADOV**, Baku State University / Azerbaijan
**Prof. Dr. Mehmet UNLU**, Marmara University / Turkey
**Prof. Dr. Ilham KAZIMOV**, Scientific Surgery Center named after M.Topchubashov / Azerbaijan
**Prof. Dr. Rajesh KUMAR**, Ministry of Textiles, Central Silk Office / India
**Prof. Dr. David MENABDE**, Kutaisi State University / Georgia
**Prof. Ali AZGANI**, University of Texas at Tayler / USA
**Assoc. Prof. Dr. Shakar MAMMADOVA**, Baku State University / Azerbaijan
**Assoc. Prof. Dr. Bilal BUSRA,** Ali Jinnah University / The Islamic Republic of Pakistan
**Assoc. Prof. Dr. Fuad KERIMLI**, Baku State University / Azerbaijan
**Assoc. Prof. Dr. Mahiyaddin MEHDIYEV**, Mingachevir State University / Azerbaijan
**Assoc. Prof. Dr. Ramiz AHLIMANOV**, Baku State University / Azerbaijan
**Dr. Svetlana GORNOVSKAYA**, Beloserkovsk National Agrarian University / Ukraine
**Dr. Asif MANAFOV**, Institute of Zoology of ANAS / Azerbaijan
**Dr. Elchin HUSEYN**, Azerbaijan State University of Oil and Industry / Azerbaijan
**Dr. Fuad RZAYEV**, Zoology Institute of ANAS / Azerbaijan

### Exact sciences section

**Prof. Dr. Yusif MAMMADOV**, Baku State University / Azerbaijan
**Prof. Dr. Masud AFANDIYEV**, «Helmholtz» Scientific Research Center / Germany
**Prof. Dr. Garib MURSHUDOV**, Research Institute of Molecular Biology / Great Britain
**Prof. Dr. Arzu SARDARLI**, First Nations University of Canada / Canada
**Prof. Dr. Eldar VALIYEV**, National Technical University / Ukraine
**Prof. Dr.Yalchin AFANDIYEV**, The University of Texas at Austin / USA
**Prof. Dr. Maarif JAFAROV**, Baku State University / Azerbaijan
**Assoc. Prof. Dr. Saadat KARIMI**, Royal Institute of Technology / Sweden
**Assoc. Prof. Dr. Yusif SHUKURLU**, Shaki Regional Scientific Center of ANAS / Azerbaijan

### Technical sciences section

**Prof. Dr. Aminagha SADIGOV**, Institute of Management Systems of ANAS / Azerbaijan
**Prof. Dr**. **Khalil KALANTAR**, Tohoku University / Japan
**Prof. Dr. Garib JALALOV**, Institute of Geology and Geophysics of ANAS / Azerbaijan
**Prof. Dr. Shahnaz SHAHBAZOVA**, Azerbaijan Technical University / Azerbaijan
**Prof. Dr. Jalaladdin MAMMADOV**, Azerbaijan State Agrarian University / Azerbaijan
**Prof. Dr. Valeriy LISENKO**, All-Russian Metrological Service Research Institute / Russia
**Prof. Dr. Yasin RUSTAMOV**, Institute of Soil Science and Agrochemistry of ANAS / Azerbaijan
**Assoc. Prof. Dr. Elov BOTIR**, Tashkent State University of Uzbek Language and Literature named after A.Navai / Uzbekistan

# HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR

## HUMANITIES AND SOCIAL SCIENCES

DOI: https://doi.org/10.36719/2663-4619/83/7-13

**Bənövşə Güloğlan qızı Məmmədova**
Azərbaycan Dillər Universiteti
filologiya üzrə fəlsəfə doktoru
benovshem.m@gmail.com

## TONİ MORRİSON VƏ ELİS UOKERİN DİL KİMLİYİNDƏ AFROAMERİKAN İDENTİKLİYİNİN TƏSİR İZLƏRİ HAQQINDA (MORFOLOJİ DİALEKTİZMLƏR)

**Xülasə**

Məqalədə görkəmli ABŞ qadın yazıçılarının – Nobel mükafatçısı Toni Morrisonun və Pulitser mükafatçısı Elis Uokerin dil kimliyi araşdırılır. Məlumdur ki, hər iki yazar afroamerikan idientikliyinə malik olduğundan onların əsərlərinin dilində bu və ya digər şəkildə onların müəllif dil kimliyi və identikliyi ifadə tapırdı. Müəlliflərin afroamerikan identikliyi morfoloji səviyyə kimi, identiklik ifadəsi üçün bir o qədər də açıq olmayan səviyyəyə də sirayət etmişdi. Hər iki müəllifin əsərlərinin dilində Black English-ə xas olan morfoloji dialektizmlər geniş şəkildə yer verilmişdir. Məlum olur ki, Black English üçün xarakterik olan kontominasiya faktlarından, feili təsrif "sadələşməsi" hallarından geniş istifadə olunmuşdur. Onu da qeyd etmək lazımdır ki, əksər hallarda morfoloji dialektizmlər ayrı-ayrı obrazların dil kimliyinin səciyyələndirməsi üçün istifadə edilir və bilavasitə müəllif dialektində geniş şəkildə yer verilmir.

***Açar sözlər:*** *dil kimliyi, afroamerikan dialekti, afroamerikan identikliyi, morfoloji dialektizmlər, lakonikləşmə*

**Banovsha Guloghlan Mammadova**

## Toni Morrison and Alice Walker on the influence of Afro-American identity on linguistic identity (Morphological dialectics)

**Abstract**

The article examines the linguistic identity of prominent American women writers − Nobel laureate Toni Morrison and Pulitzer laureate Alice Walker. It is known that since both writers have an Afro-American identity, their author language identity and identity were expressed in one way or another in the language of their works. The authors' Afro-American identity permeated a level less open to identity expression, such as a morphological level. Morphological dialectisms characteristic of Black English are widely included in the language of the works of both authors. It turns out that the facts of contagion, the "simplification" of the verb, which are characteristic of Black English, were widely used. It should also be noted that in most cases, morphological dialectisms are used to characterize the linguistic identity of individual characters and are not widely included in the author's dialect.

***Keywords:*** *language identity, Afro-American dialect, Afro-American identity, morphological dialectisms, laconicization*

### Giriş

"Black English"dən yararlanmış afroamerikan mənşəli qadın yazarları obrazlarının identikliyinin qabardılması üçün qrammatik dialektizmlərdən geniş şəkildə istifadə etmişlər. Bu dialektizmlər sırasında xüsusi növ morfoloji elementlər var ki, bir çox aspektlərinə görə xüsusi maraq doğurur. Belə ki, onların işlənmə tezliyi və işlənmə mövqeləri ilə bağlı təhlillər, ümumilikdə afroamerikan simfonik dil kimliyinin identikliyi ilə bağlı bir çox məqamlara aydınlıq gətirilməsinə kömək edir. Söhbət "qısaltma" və

qrammatik "sadələşmələrdən" gedir. Əslində hər iki tendensiya birmənalı şəkildə eyni bir intensiyanın gerçəkləşdirilməsinə xidmət edir: afroamerikan "ingiliscəsi" ingilis dilinin lakonikləşdirilməsi və "sürətləndirilməsi" kimi linqvopraqmatik mərama hədəflənir.

Tədqiqatçılar Black English-in qısaltmalara meyilliliyinin çox təbii izahını təqdim edirlər. Məlum olur ki, müasir afroamerikanların əcdadları öz quldar keçmişində ixtisarlarla, qısaltmalarla danışmaq zərurəti duyurdular və bu zərurət bilavasitə onların həyat şəraitlərinin obyektiv reallıqları ilə şərtlənirdi. Həmin obyektiv reallıqların acı fəsadları afroamerikanlıların ünsiyyətinin aşağıdakı prinsiplərini ortaya qoymurdu:

1) Quldarlar afrikalıların "sözləşib" ağalarına qarşı etiraza qalxa bilməmələri üçün ayrı-ayrı qəbilə nümayəndələrini qul kimi satın alırdılar ki, bu da onların öz aralarında intensiv ünsiyyəti çətinləşdirirdi. Bu baxımdan, T.A.Yudina ABŞ araşdırmaçılarının maraqlı bir fikrini xatırladaraq qeyd edir ki, əgər afroamerikalıların öz aralarında danışa biləcəkləri yerli (Afrika) ortaq dili olmasaydı, quldarlıq quruluşu bu qədər uzun sürə bilməzdi. Deməli, afroamerikalılar ehtiyacdan ingilis dilini öyrənmək məcburiyyətində qalırdılar;

2) Bəzən bu ünsiyyət ağdərili sahibkarın qəzəbi ilə qarşılaşırdı. Bu kimi vəziyyətlərdən yayınmaq üçün və lazımi *"həyati vacib"* informasiyanı hərfi mənada *"arxalarında dayanmış ağ ağanın – təhlükə mənbəyinin dayanması*" səbəbi ilə məlumatın, xəbərin tez, lakonik və "*ağ sahibkarın anlaya bilməyəcək şəkildə*" ötürülməsi ehtiyacı yaranırdı (kursiv bizimdir. – B.M.) (Yudina, 2012:47). Bu baxımdan, ingilis dilindəki "lakonikləşmə" tendensiyalarının ilk olaraq, Black English formatında intensivlik qazanmasının çox məntiqi izahı ortaya çıxır: dil daşıyıcıları öz limbik sistemlərinin təhlükə obyektinə qarşı təbii reaksiyası kimi, nitqlərində "qaçırdılar". Məlumdur ki, limbik sistemimiz təhlükə anında üç reaksiya ortaya qoyur: 1) qaç, 2) vur; 3) don (Navarro, Karlins, 2018:49-61). Real olaraq, öz ağdərili ağalarından qaçıb qurtula bilməyən qaradərili qullar özlərini çətinlikdən, anlaşılaraq (nə daşıdıqlarının başa düşülərək) təqib olunmaqdan qorumaq üçün çıxış yolunu, "nitqlərinin qaçışında, tələsməsində" görürdülər.

Black English sahəsində tədqiqatlardan məlum olduğu kimi, bir çox hallarda afroamerikan dialektində *to be* forması dəyişməz qalır və ya ümumiyyətlə, "buraxılır". Məsələn: *He be always fooling around* və *He a friend* (3). Bu qrammatik özəllik afro-amerikan dialekti üçün o dərəcədə qabarıq xarakterikliyə malikdir ki, E.Uoker və T.Morrisonun əksər əsərlərində bu qəbildən faktlara kütləvi şəkildə yer verilir. Nümunələrə diqqət edək: *I don't think it so funny* (Walker, 2014:97); *Cause she the only one you ever love, she say, sides me* (Walker, 2014:67); *It not her fault somebody kill her, he say. It not! It not*! (Walker, 2014:26); *You mine* ; *It more like patting another piece of wood* (Walker, 2014:26); *You too dumb to keep going to school, Pa say* (Walker, 2014:15); *She smart too though, I think* (Walker, 2014:26); *You forgetting how little it is," said her mother You lucky* (5); You kidding? (6).

Göründüyü kimi, bu nümunələrdə *to be* feilinin *bəzi* formaları "ixtisar edilmişdir". Dilçilər *bu qəbildən ixtisar və ya "sadələşdirmələri"in Black English-in ən səciyyəvi xüsusiyyətlərindən* olduğunu və onun səciyyəviliyinin XXI əsrin əvvəllərindəki afroamerikan dialekti üçün öz xarakterikliyini qoruyub saxladığını vurğulayırlar. Konkret olaraq, müasir afroamerikan hip-hop mədəniyyətinə aid mətnlərdə *to be* feil formasının müasir vəziyyətinin "ixtisara" meyilliliyinə diqqət çəkən V.Kupina bunun bilavasitə Black English-in təzahürü kimi ortaya çıxdığını vurğulayır. Dilçi ona da diqqət çəkir ki, *to be* feilinin müasir zaman formalarından fərqli olaraq, keçmiş zaman *was* və *were* formaları öz işləkliyini qoruyur, habelə cəmdə olan subyektə "təhkim edilmiş" *to be* feilinin indiki zamanının istifadə hallarına da yer verilir. *Bütün digər hallarda afroamerikan dialekti "ixtisara" və lakonikliyə meyillik nümayiş etdirir* (kursiv bizimdir. – B.M.) (Kupina, 2018:385). Maraqlıdır ki, E.Uoker Standart English-da danışan Netti obrazından fərqli olaraq, bu kimi "təhrif edilmiş" istifadə hallarına istisnasız olaraq, Sili obrazının dil kimliyinə yer vermişdi. *My mama dead* (Walker, 2014:9); *He seen Nettie in church* (Walker, 2014:11); *She too young.... She the oldest anyway She too old to be living here at home. And she a bad influence on my other girls* (Walker, 2014:14); *They carrying on just like you know they would* (Walker, 2014:129); *Make Albert let me sleep with you from now on, while you here, I say* (Walker, 2014:75).

Nümunələrdə izləyə biləcəyimiz kimi, Netti obrazının Standart English-ə adaptasiya olunmuş dil kimliyində yalnız ədəbi dil normasına uyğun istifadə halları yer almışdır. *She* ***is*** *the most industrious of all Tashi's father's widows, and her fields* ***are*** *praised for their cleanliness, productivity and general attractiveness* (Walker, 2014:86); *But always, no matter what* ***I'm*** *doing,* ***I am*** *writing to you. Dear Celie,*

*I say in my head in the middle of Vespers, the middle of the night, while cooking, Dear, dear Celie. And I imagine that you really do get my letters and that you* ***are*** *writing me back: Dear Nettie, this* ***is*** *what life* ***is*** *like for me* (Walker, 2014:83).

Onu da qeyd edək ki, E.Uokerin və T.Morrisonun əsərlərinin dilinin təhlili afroamerikan dil kimliyinə adekvatlığının başqa bir cəhətdən də biruzə verir. Belə ki, eynilə V.Kupinanın daha öncə iqtibas gətirilən fikrində deyildiyi kimi, *was* və *were* formalarının afroamerikan dialektində işləkliyinin qorunub saxlanması tendensiyası hər iki yazarın əsərlərinin dilində mühafizə olunur. Yəni bu cəhətdən afroamerikan dialekti Standart English-ə uyğunluq nümayiş etdirir.

E.Uokerin "The Color Purple" romanında 428 dəfə *was* formasından, 115 dəfə *were* formasından istifadə edilmişdir. Müqayisə üçün deyək ki, T.Morrisonun "The Bluest eye" romanında *was* formasından 783 dəfə, *were* formasında isə 231 dəfə; "The Beloved" romanında isə *was* formasından 1760 dəfə, were formasından isə 305 dəfə; "Song of Solomon" romanında *was* formasından 1980, *were* formasından isə 441 dəfə; "God Help the Child" romanında *was* formasından 609, *were* formasından isə 153 dəfə istifadə olunmuşdur. E.Uokerin və T.Morrisonun əsərlərinin dilində işlənmə tezliyi göstəricilərindəki fərqlilik onunla izah edilir ki, E.Uokerin romanın, əsasən iki şəxsin məktublaşmalarına istinad etdiyindən burada müəllif təhkiyəsinə yer verilmir, məktublaşan tərəflərdən birinin dil kimliyi isə bilavasitə Black English daşıyıcılığı ilə seçilir.

Onu da qeyd edək ki, maraqlıdır ki, "afro-amerikan sosial-etnik dialektinin morfoloji-sintaktik spesifikasını" araşdırmış tədqiqatçılar bu dialektdə geniş şəkildə təzahür tapmış *to be* feilinin "buraxılması" kimi halların Yamayka və Qayana ərazilərində yayılmış kreol dillərinin analoji qrammatik məna ifadəsi modelləri ilə səsləşdiyini diqqət çəkmişlər (Maksimvao, 2004; 24). Yeri gəlmişkən, qeyd edək ki, Black English-in yaranması tarixini "siyasi linqvistika" aspektindən izləmiş A.A.Cioyeva burada üç ehtimalın mövcud olduğuna diqqət çəkmişdir:

1) Kreol dil faktoru ehtimalı: bu fərziyyəyə görə, ağdərili quldarların danışdığı ingilis dili ilə Afrikadan gətirilmiş qulların Qərbi-Afrika dillərinin sintezi əsasında ingilis leksikasının, Afrikan fonetikası və intonasiyasına "oturdulması" nəzərdən keçirilir;

2) Cənub dilaketləri faktoru: Məlumdur ki, bu dialektlərinin özələri də İngiltərənin Şərq əyalətlərinin dialektlərinin təsiri ilə formalaşmışdır;

3) Sosiolinqvistik faktor: Bu ehtimala görə əsrlər boyu müvafiq yaşayış yerlərinə, gettolara (inner cities) "sıxışdırılmış" qaradərililərin danışığı müəyyən özünəməxsusluqlarla "miks" edərək müasir vəziyyətə düşmüşdür. A.A.Cioyeva, əslində daha doğru olanın hər üç faktorunun müştərək iştirakının nəzərə alınması vacibliyini vurğulamışdır (Djioeva, 2010:360). İstənilən halda afroamerikan dialekti bəzi qrammatik özəlliklərinə görə, kreollaşma "fəsadları" kimi dəyərləndirilə bilən "sadələşdirmələri" ortaya qoyur. Xatırladaq ki, əksər hallarda dillərin çarpazlaşması zamanı "qəliz" struktur elementlərin (B.Uspenskinin struktur tipologiya nəzəriyyəsi kontekstində desək) meta-dil strukturun daha "sadələşmiş" elementləri sayəsində lakonikləşməsi mümkün olur (Uspenskiy, 1966:58-61). Məhz feil təsrifi məsələlərindəki belə "sadələşmələrinə", ixtisarlara görə Black English bir çox müşahidəçilər tərəfindən "tənbəl" və ya "pis ingiliscə" («lazy» və ya «bad» English) kimi səciyyələndirilir (Kushnarova, 2011). Həmin yanaşmaya görə, məhz sadələşməyə meyillilik Black English daşıyıcılarının marjinal, tənbəl olması ilə bağlı "linqvistik diskriminasiya" situasiyalarına yol açmışdır ("Central to this ideology is the belief that Black English is 'bad grammar, slang, and a pseudo-language) (Sebruk, 2019:134-138). Çünki danışan feil təsrifinə görə "beynini yorub" özünü əziyyətə salmır. Bu xüsusiyyətlərinə görə, fərqli yanaşma ilə qarşılaşan Black English-ə aktiv müraciət edən E.Uoker və T.Morrison bu kimi "sadələşmələri" korrektə etmədən "ana dilində" (afroamerikan dialektində) olduğu kimi verməklə, öz afromarikan simfonik dil kimliyinə aidliyini daha əyaniliklə bəyan edirlər. Belə ki, bədii əsərlərin dilində işlənmə mövqeləri baxımından, leksik və fonetik dialektizmlərdən fərqli olaraq, qrammatik dialektizmlər bir qədər daha həssas məqamı əhatə edir. Yəni, xalq dilinin imitasiyası zamanı ingilisdilli yazarlar üçün morfoliji dialektizmlərdən kütləvi şəkildə bir o qədər də səciyyəvi deyildi. Bu mənada (daha öncə xatırlatdığımız) XXI əsr hip-hop ifaçılarının deyil, XX əsrin II yarısında bədii yaradıcılığa gəlmiş qadın yazarların afroamerikanizm-qrammatik dialektizmlərdən istifadəsi sadəcə üslubi fakt kimi dəyərləndirilə bilməz: bu, bir növ, öz identikliyinin anifestasiyası kimi ortaya çıxırdı. İstər E.Uoker, istərsə də Toni Morrison morfoloji dialektizmlərdən həm personajların sosial statusunun, etnik identikliyinin

səciyyələndirməsi üçün, həm də öz mövqelərini orataya qoymaq məqsədilə istifadə etmişdilər. Bu mənada dahi rus yazıçı-dramaturqu A.P.Çexovun dilindəki dialektimzlərin işlənmə mövqeyini və məramını araşdırmış T.A.Kudinovanın fikirlərini də xatırlatmaq yerinə düşərdi. A.P.Çexovun əsərlərində dialektizmlərin işlənmə sepesifikasını məhz, *müəllifin dil şəxsiyyəti prizmasından dəyərləndirmiş* T.A.Kudinova ona xüsusilə diqqət çəkir ki, məhz morfoloji dialektizmlər müəllifin sadə xalq kütləri ilə sıx təmasda olmasına, onların real canlı danışıq dilinə yüksək səviyyədə bələd olmasını sübuta yetirən əsas göstəricilərdən sayıla bilər. Dilçi A.P.Çexovun bu dialektizmlərdən 1) *personajlarının dil kimliyinin səciyyələndirməsi məqsədilə,* 2) *habelə özünün yazışmalarında bu və ya digər məsələyə kinayəli reaksiyasının ifadəsi intensiyası ilə istifadə etdiyini* vurğulamışdır (kursiv bizimdir. – B.M.) (Kudinova, 2000:14).

Onu da qeyd edək ki, Black English-in bu özəlliyi cənub dialektlərilə müəyyən səsləşməyə malik olsa da, T.Morrisonun cənub ştatlarından olmayan obrazlarının dil kimliyində də belə "sadələşmə" elementlərinin təsadüf edilməsi bir daha onu yəqin edir ki, afroamerikan dialekti fenomeni sadəcə coğrafi səciyyələndirməyə malik deyil.

*"You looking good"* (5); *"You going to tell me it's all right with this child half out of her mind?"* (5); *"You too short to reach the fire"* (5). Təqdim edilən nümunələr T.Morrisonun "Beloved" romanındakı fərqli obrazların dil kimliyini səciyyələndirir. Romanda cərəyan edən hadisələr 1856-cı ilin yanvarına təsadüf edir və bilavasitə quldarlığın dəhşətlərinin ifşasına yönəlmişdir. Əsərdəki hadisələr Cənub Konfiderasiyasına daxil olmayan, deməli, klassik anlamda "quldar ştatlar" sırasına aid edilməyən Sinsinati ştatında cərəyan edir. Lakin bir çox obrazların "quldar" ştat Kentukidən qaçqın kimi Sinsinatiyə köç etməsi faktı obrazın dil kimliyində öz təsir izini buraxmışdı.

Bu mənada ABŞ-da ingilis dilinin sosial differensiasiyası problemlərini araşdırmış A.D.Şveyserin yanaşması ilə həmfikirik. Belə ki, dilçi cənubda formalaşmış afroamerikan dialektlərinin zamanla ölkənin digər bölgələrinə, eləcə də Avropaya köç etməsilə afroamerikan dialektinin məhəlli mahiyyəti aradan qalxmış və o, sosial (sosial-etnik – B.M.) mahiyyət kəsb etməyə başlamışdır (Şveyçer, 1983:23).

Onu da qeyd edək ki, Ohayo ştatında XX əsrin 40-cı illərində cərəyan edən hadisələrin təsvir olunduğu digər romanda da analoji faktları izləyirik. Xatırladaq ki, Ohayo Ştatı "Yanki ştatlardan" (Yankee State) sayılır. Bura da tarixən qaradərili əhali yüksək təmsilliyə malik deyildi. Belə ki, quldarlığın qadağan edildiyi Ohayo ştatında afroamerikan danışığının yayılması üçün tarixən geniş imkanlar yox idi və yalnız zamanla qonşu cənub ştatlardan miqrasiya edən əhali sayəsində Balck English-in təsiri bu ştat əhalisinin danışığında da sezilməyə başladı. *You gonna make another pie*? (6); *She be lucky if it don't live* (6).

Black English-in "sadələşmə" təzahürlərindən sayılan morfonoloji birikmələr də E.Uoker və T.Morrisonun əsərlərinin dilində yüksək işlənmə tezliyi nümayiş etdirir.

Məlumdur ki, nitq axınında funksional və semantik "yaxınlığa" malik olan struktur elementlərin "birikməsi" kontominasiya hadisəsini ortaya çıxarır (15). İstər Black English, istərsə də Cənub dialektləri bu növ morfonoloji spesifikliklərlə seçilirlər.

K.Terner və M.Korobeynikov Cənub dialektlərində *lemme* (< let me); *ain't* (< is not, am not və are not) (bax:16) kimi kontaminasiya faktlarının geniş işləklik qazandığını vurğulayırlar.

Afroamerikan "ingiliscəsi" üzrə araşdırmalarda sadalanan kontominasiya vahidlərindən − *(lemme, ain't ) əlavə, wanna, gonna, shoulda, gotta, outta, shotta, lotta, I'ma, Y'all, gonna* istifadə edilir (17).

Analoji dialektizmlər Black English-də də, o cümlədən E.Uoker və T.Morrisonun obrazlarının dilində də təsadüf edilir.

***Y'all*** *got boys, he told them* (5); ***Wanna*** *come up here and wait?* (6); *I* ***gotta*** *go* (5) və s.

E.Uoker və T.Morrisonun əsərlərinin dilində işləkliyi ilə seçilən kontominasiya faktları əsasən aşağıdakılardan ibarətdir:

1) *Gimme* – bu kontominasiya (və ya digər terminologiya ilə desək, blendinq (17) hadisəsinə hər iki yazarın demək olar ki, bütün yaradıcılıq nümunələrində təsadüf edilir.

*Just* ***gimme*** *a cup of coffee and hand me my cigarettes*; ***Gimme*** *a shot of white lightening, she say* (4, 37, 51); ***Gimme*** *hate, Lord, he whimpered; Don't sound like a question. Sound like an answer.* ***Gimme*** *the question;* ***Gimme*** *the tea, Guitar. Just the tea* (Morrison, 1977:56); ***Gimme*** *back my shoes;* ***gimme*** *back my hat* (5); ***Gimme*** *one of yours* (6).

Black English-in inkişaf tendensiya və persektivlərini izləmiş araşdırmalarda *give me > gimme* keçidinin assimilyasiya prosesi ilə şərtləndiyi və *"m"ləşmənin* (m səsinə "doğru" assimilyasının) Black English üçün xarakterik olduğu qeyd edilir (19).

*2) Lemme* – daha bir "m"ləşmə assimilyasiyası: let + me.

"***Lemme** go," he whispered.*

*"Hmmmmm?"*

*"**Lemme** go. I…won't never…put a hand on her. I promise*" (Morrison, 1977: 47);

**Lemme** take it out (6); *Just said to give you some good-luck message if I was to see you.* ***Lemme** see*… (Morrison, 1977:12).

3) *Gonna − (<going to)* forması. Tədqiqatçılar bu kontominasiya faktının işləkliyinin T.Morrison idiolekti üçün səciyyəvi olduğunu qeyd edirlər (20). *That's where they **gonna** be if you don't figure out some way to get me my money. "What's it **gonna** profit you, Mr. Dead*.. (20).

Afroamerikan danışıq tərzi üçün səciyyəvi olan və *"going to"* formasının morfonoloji modifikasiyasından törəmiş olan *"gonna"* birikmə variantına E.Uokerin "The Color purple" romanında 14 dəfə, T.Morrisonun "The bluest eye" romanında 10 dəfə, "Beloved" romanında 16 dəfə, "God help the child" romanında isə 1 dəfə işlədilmişdir.

*When she starts fussing at the walls, you know she's **gonna** be at it all day* (6); *"You don't know what you **gonna** do"* (6); *Just say You **gonna** do what your mammy wouldn't* (4; 8); ***Gonna** make me an my girl some new dresses, she say* (4; 17); *"You just **gonna** feed her? From now on?" …"What you **gonna** do*?"… (5); "*What you **gonna** do about her?"* (21).

4) *Gotta* – Black English üçün səciyyəvi olan birikmə növlərindən biri də *"have got to"* formasının qısaldılmış *gotta* variantıdır.

*Squeak and Harpo's little girl come over, look up at Sofia, say, You **gotta** go Misofia?* (Walker, 2014:101); *... she moved off saying, "I **gotta** go*" (5).

5) *Kinda* – orfoepik variantı *"kind of"* formasının morfonoloji birikməyə məruz qalmış variantıdır.

"*What **kinda** place is it, Flint?"... I'm **kinda** thirsty* (Morrison, 1977:121).

*A lean-to, **kinda*** (5); *I **kinda** thought so, she say, and let out her breath real slow* (4; 44).

6) Outta − *Now, get the fuck **outta** my face!* (6); *"Get them women **outta** here"* (Morrison, 1977:128); "*Now get the hell outta that window!"* (Morrison, 1977:14); *"Come down **outta** there, nigger!"* (Morrison, 1977:14).

Lüğətlərdən artıq qeyd alınan *outta* variantı ***"out of"*** birləşməsinin "qeyri-formal" tələffüzü kimi (*pronounced informally*) təsbit edilir (22).

*7) Ain't (< am not, is not, are not, has not, have not* (23) sözsüz ki, E.Uoker və T.Morrisonun dialektlərində ən yüksək işlənmə tezliyi ilə seçilən morfonoloji birikmə faktıdır. E.Uokerin "The Color Purple" romanında 103 dəfə işlədilir. *I **ain't** well She say Naw, I **ain't** gonna* (Walker, 2014:8); *I **ain't** never really look at that one, he say... She **ain't** fresh tho, but I spect you know that But she **ain't** no stranger to hard work* (Walker, 2014:14).

T.Morrison özünün "The Bluest eyes" romanında *ain't* formasından 57 dəfə, "The Beloved" romanında 96 dəfə istifadə etmişdir. E.Uokerin adıçəkilən romanında isə bu formaya 103 dəfə yer verilmişdir.

## Nəticə

Beləliklə, aydın şəkildə göründüyü kimi, təqdim olunan faktlar T.Morrisonun və E.Uokerinin dil kimliyinin "onurğasını", "özülünü" təşkil edən afroamerikan dialektinin sadəcə olaraq, dialekt olmadığını, yəni dialekt anlayışının ənənəvi sərhədlərini aşan mahiyyətə malik olduğunu ortaya qoyur. Belə ki, burada ancaq sırf məhəlli dialekt və ya ancaq sırf sosial dialekt anlayışlarının göstəricilərinin mövcudluğunu təsbit etmək doğru olmazdı.

Göründüyü kimi, istər E.Uokerin, istərsə də T.Morrisonun dialekti müəlliflərin Black English daşıyıcısı dil kimliyinə malik olduğunu əyani şəkildə ortaya qoyur.

## Ədəbiyyat


1. Yudina, T.A. (2012). Yazyk kak sposob samoopredeleniya (drugimi slovami, afroamerikanskiy). Vestnik Omskogo Universiteta, №12, s.45-49.
2. https://cyberleninka.ru/article/n/yazyk-kak-sposob-samoopredeleniya-na-primere-yazyka-afroamerikantsev
3. Navarro, C., Karlins, M. (2018). Body language. Baku: "Khan" publishing house, 328 s.
4. Chto takoye Eboniks, i niuzheli nam takoy angliyskiy?
5. https://audio-class.ru/articles/ebonics-english.php
6. Walker, A. (2014). The Color Purple. London: Orion Publishing Group. https://archive.org/stream/the-color-purple-alice-walker/the-color-purple-alice-walker_djvu.txt
7. Morrison, T. Beloved. http://www.6lib.ru/books/Beloved-198932.html
8. Morrison, T. The Bluest Eye. http://royallib.ru/book/morrison_toni/The_Bluest_Eye.html
9. Kupina, V. (2018). Osobennosti grammatiki sovremennogo afroamerikanskogo yazyka na primerakh amerikanskikh ispolniteley, s.381-385. Filologicheskiye chteniya [Elektronnyy resurs]: Materialy Mezhdunarodnoy nauchno-prakticheskoy konferentsii (Orenburg, 14-15 dekabrya 2017 g.): Izdatelsko-poligraficheskiy kompleks OKU, 856 s. http://www.osu.ru/docs/konf/2017_12_14/filologicheskie_chteniya_2017_sbornik.pdf
10. Maksimvao, S.YU. (2004). Morfologo-sintakticheskaya spetsifika afroamerikanskogo sotsialno-etnicheskogo dialekta: Avtoref. dis.kand.filol.nauk., Saratov, 24 s.
11. Djioeva, A.A. (2010). Insights into Politics and the Language of Politics: a Course of English: ucheb. posobie. M.: KNORUS, 384 s.
12. Uspenskiy, B.A. (1966). Strukturnaya tipologiya yazykov. M.: Nauка, 272 s.
13. Kushnarova, E.S. (2011). Black English v kontekste amerikasnskoy kultury. Molodoy uchenyy №5. https://moluch.ru/archive/28/3132
14. Sebruk, A.N. (2019). Lingvisticheskaya diskriminatsiya i lingvisticheskaya apropriatsiya kak pervyye yavleniya dvoynogo soznaniya v SSHA [Tekst]. Vestnik Novosibirskogo gosudarstvennogo universiteta. T.17, № 1. s.134-148. https://cyberleninka.ru/article/n/lingvisticheskaya-diskriminatsiya-i-lingvisticheskaya-apropriatsiya-kak-primery-fenomena-dvoystvennogo-soznaniya-v-ssha
15. Kudinova, T.A. (2000). Prodtorechiya i dialekt v yazyke A.P.Chekhova: K kharakteristike yazykovoy lichnosti pisatelya, avtoreferat dissertatsii dlya issledovateley uchenoy stepeni kondidata filologicheskikh nauk. Krasnodar, 24 s.
16. Shveycher, A.D. (1983). Sotsialnaya differensatsiya angliyskogo yazyka v USA. M.: Nauka, 216 s.
17. Belchikov, Yu.A. (1990). Kontaminatsiya. Lingvisticheskiy ensiklopedicheskiy slovar. Glavnyy redaktor. V.N.Yarcheva. Moskva: «Sovetskaya ensiklopediya» http://tapemark.narod.ru/les/238a.html
18. Terner, K., Korobeynikov, M. Heavens to Betsy, ili 50 rasprostranennykh v Amerike Yuga. https://www.fluentu.com/blog/english-rus/heavens-to-betsy-50-%D1%84%D1%80%D0%B0%D0% B7-%D1%8E%D0%B3%D0%B0-%D1%81%D1%88%D0%B0
19. Nur Islami, Kh., Ardaniah, V. (2017). Phonological and morphological processes of African American vernacular English in the Nicki Minaj's lyrics. Anglicist, Volume 06, No. 01, February, p.1-9. http://journal.unair.ac.id/download-fullpapers-anglicist430d7baf00full.pdf
20. Morrison, T. (1977). Song of Solomon. royallib.ru
21. Perspectives on Black English (edit: Dillard J.L.). https://books.google.az/books?id=uSgfUl-66ssC&pg=PA155&lpg=PA155&dq=gimme+give+me+black+english&source=bl&ots=n7C_Qs5_Xc&sig=ACfU3U3-
22. Simpson, R. Black looks and black acts: The language of Toni Morrison in "The Bluest Eye" and "Beloved". https://books.google.az/books?id=j4dozwvRUl4C&pg=PA15&lpg=PA15&dq=%22Well,+he+have+to+come+on+his+own+time.+Good+luck,+coon+ba

23. Morrison, T. God help the child. https://royallib.com/book/morrison_toni/god_help_the_child.html
24. Outta. Colins dictionary. https://www.collinsdictionary.com/dictionary/english/outta
25. Ain't. Cambridge advanced learner's dictionary and thesaurus. Cambridge University Press. https://dictionary.cambridge.org/ru/

Göndərildi: 09.07.2022 Qəbul edildi: 21.09.2022

DOI: https://doi.org/10.36719/2663-4619/83/14-20

**Minaxanım Əfqan qızı Hacıyeva**
Azərbaycan Dillər Universiteti
filologiya üzrə fəlsəfə doktoru
lehrerin81@mail.ru
https://orcid.org/0000-0002-8136-2147

# "DİL OYUNU" VASİTƏSİLƏ MANİPULYATİV STRATEGİYA

**Xülasə**

Məqalədə "dil oyunu" fenomeni araşdırılır. Bu, dilçiliyin ən aktual problemlərindən biridir. Kodlaşdırma-dekodlaşma prosesində bu anlayışlar spesifik xüsusiyyətlərinə görə seçilir. Onların spesifik xüsusiyyətlərini göstərmək üçün biz reklam diskurslarını obyekt olaraq vermişik. "Dil oyunları" digər nitq aktları ilə eyni semiotik əhatəyə malikdir. Lakin onların son nəticələri daha uğurlu və təsirli olur. Bunun sirri dil işarələrindən, dil normalarından istifadə ilə bağlıdır. Reklam diskurslarının yüksək manipulyasiya strategiyasına malik olması "dil oyunlarından" düzgün istifadə olunması ilə bağlıdır. "Dil oyunları" dil normalarının qəsdən pozulması ilə əlaqədar adresatın beynində xüsusi effekt yaradır. Nəticədə adresant-manipulyator yaratdığı effekt hesabına dinləyicinin beynini düzgün istiqamətə yönləndirir.

***Açar sözlər:*** *manipulyativ strategiya, "dil oyunu", kommunikativ məqsəd, adresant-manipulyator, kütləvi informasiya vasitələri, kontekst, koqnitiv fərqlilik*

**Minakhanim Afgan Hajiyeva**

## A manipulative strategy through the "Language game"

**Abstract**

The article explores the phenomenon of "language game". This is one of the most urgent problems of linguistics. In the encoding-decoding process, these concepts are selected according to their specific characteristics. To show their specific features, we have taken advertising discourses as an object. "Language games" have the same semiotic scope as other speech acts. But their end results are more successful and effective. The secret of this is connected with the use of language signs and language norms. The fact that advertising discourses have a high manipulative strategy is due to the correct use of "language games". "Language games" create a special effect in the mind of the addressee due to the deliberate violation of language norms. As a result, the addressee-manipulator directs the listener's brain in the right direction due to the effect it creates.

***Keywords:*** *manipulative strategy, "language game", communicative goal, speaker-manipulator, mass-media, context, cognitive difference*

## Giriş

Hər bir dövrün sosial səviyyələrinə uyğun olaraq manipulyasiya hadisələri olur. Dövrlərarası inkişaf sayəsində burada müxtəlif fərqliliklər müşahidə etmək mümkündür. Cəmiyyət və onun üzvlərinin ümumi İQ (intellekt əmsalı) səviyyəsi bu fərqliliklərin əsas göstəricilərindən hesab olunur. Müasir dövrümüzə qədər olan mərhələlərdə manipulyativ hadisələrə demək olar ki, əsasən, siyasi arenalarda, cəmiyyət fəaliyyətini idarə etməyə çalışan "savadlı" natiqlərin nitqlərində rast gəlmək mümkün olurdu. Qloballaşan dövrümüzdə isə insani zəkanın sürətli inkişafı demək olar ki, özünü danışıq performansında da buna müvafiq aparır. Zamanlara məxsus inkişaf dinamikasını müqayisə etdikdə, müasir dövrün "təhsilli" insanı gündəlik həyatında qarşıdakı auditoriyasını idarə etməyə, yönləndirməyə çalışan natiq qismində çıxış edir və öncəki dövrlərin "idarəedici" təbəqəsindən heç də geri qalmır. Müasir insan üçün gündəlik danışıq aktları belə qarşı tərəfin fəaliyyətinin manipulyasiyasına yönəlikli olur (Hacıyeva, 2021:133). Bu baxımdan çağdaş dünyamızda mövcud olan danışıq aktlarının eksplisit tərəfdən çox implisit tərəfə istiqamətlənmiş meyli hər dəfəsində sadə kommunikativ prosesdə çoxmənalı xarakter formalaşdırır və

ünsiyyətə xidmət edən kodlar birmənalılıqdan, eksplisitlikdən daha çox mətnaltı mənalılığa, implisitliyə doğru hər keçən gün mürəkkəbləşməkdə davam edir. Bu gedişat üzrə inkişaf davam etdikcə, verbal ünsiyyət sosial mühitə təsir etmək iqtidarında olan sivri bir alət rolunu icra edir və manipulyativ strategiyanın genişlənmiş əhatə dairəsi daha qlobal proses görkəmi alır. Bütün bunlara əsasən demək olar ki, mürəkkəbləşmiş xarakterə malik olan semiotik vahidlərin kodları qarşı tərəfin dekodlaşması prosesində də eyni səviyyədə ağırlıq yaratmış olur (Hacıyeva, 2021:175).

F.İ.Şarkov irəli sürdüyü qeydlərində kommunikasiyanın müasir dövrdə üç əsas interpretasiyasını sadalayır:

1. "maddi və ruhi dünyanın istənilən obyekti ilə əlaqələndirilən vasitə kimi;
2. insanların informasiya mübadiləsinə xidmət edən prosesi kimi;
3. cəmiyyətə və onun əsas komponentlərinə təsir etmək məqsədilə göndərilən və mübadilə edilən informasiya çoxluğu kimi..." (Sharkov, 2001:11).

Burada kommunikasiyaya məxsus göstərilmiş üçüncü xarakter onu digər tarixi dövrlərdə mövcud olan kommunikasiyalardan tamamilə fərqləndirir. Kommunikasiyanın bu xarakteristikasının əsas təmsilçisi manipulyativ strategiyadır. Onun əsas xüsusiyyəti informantlarda ötürülmüş kodlar vasitəsilə xüsusi assosiasiyalar və emosiyalar yaratmaq, lazımi fəaliyyətlərə təhrik edən yönləndirməyə nail olmaqdan ibarətdir. Bu xarakterinə uyğun olaraq, kommunikasiya prosesi dilin digər funksiyalarından çox komissiv funksiyasını qabardır və bununla da qarşı tərəfi nəzərdə tutulan fəaliyyətə təhrik etməyə çalışır. Qeyd edildiyi kimi dövrlərarası fərqlilik baxımından müasir ünsiyyətin tərəflərindən olan adresantlar bu startegiyanın əsas daşıyıcısı rolunda çıxış etmək potensialına malikdirlər. Bu özəlliyinə əsasən, ünsiyyət tərəfdaşlarının adlandırılmasında kiçik bir əlavə edərək, adresant tərəfi adresant-manipulyator olaraq adlandırsaq, heç də yanılmarıq.

Ünsiyyət zamanı hər kəs məqsədinə uyğun şəkildə danışıq fəaliyyətinə daxil olur və ünsiyyət prosesinin praqmatik xüsusiyyətlərinə uyğun olaraq fikirlərini kodlaşdırır. Bütün kodlaşma sonda uğurlu nəticəyə ümid edir. Bunu əldə etmək məqsədilə adresant daxili təəssüratlarını dinləyəninə çatdırmağa çalışır və bu zaman müxtəlif üsul və vasitələrdən istifadə edir. "Uğurlu kommunikator öz ünsiyyətini əvvəlcə yoxlanılmış yolla aparır. Bu, aktyorluqda istifadə olunan variantdır. O, əvvəlcədən auditoriyanın haradan güləcəyini və ya ağlayacağını bilir, çünki onun çoxlu sayda səhnələrdən təcrübəsi var" (Pochepsov, 2001:40). Auditoriyasını kəşf edən adresant-manipulyator daha sonra qarşısında olan adresantını ötürdüyü informasiyasına inandırmağa çalışır və bununla da qarşı tərəfin fikrinə təsir etmiş olur. Əslində bütün bu proses böyük bir səhnəni, daha doğrusu, oyunu xatırladır. Həmin oyunun daxilində adresant-manipulyatorun "layihəsinin baş qəhrəman"ı adresant-informantdır. Adresantın informasiya yükü ilə dolu olan kodları yaratmaqda, həmin kodları kontekst və situasiyalara görə uyğunlaşdırmaqda əsas məqsədi də "baş qəhrəman"la bağlı planı həyata keçirməkdən ibarətdir. Öz məqsədinə çatmağa çalışan manipulyator linqvistik fəaliyyətini fərqli strateji plan əsasında həyata keçirir. "Layihənin" son nöqtəsinin əsas gözləntisi "baş qəhrəman"da güclü perlokutiv effekt yaratmaqdır.

Manipulyativ strategiyanın inkişaf dinamikasına məxsus dövrlərarası diaqramı nəzərdən keçirsək, müasir dövrümüzün unikal kütləvi informasiya vasitələri diqqəti xüsusilə cəlb edər. F.İ.Şarkovun fikirlərinə uyğun olaraq qeyd etsək, "üç kommunikativ inqilabdan keçən kommunikasiyanın inkişaf tarixi yazının kəşfindən, çap cihazının hazırlanmasından və elektron kütləvi informasiya vasitələrinin daxil edilməsindən ibarətdir" (Sharkov, 2001:9). Əlbəttə ki, yazı və çap cihazlarının sosial cəmiyyətə etdiyi təsirlər təkzibedilməzdir. Amma zənnimizcə, kütləvi informasiya vasitələrinin və elektron informasiya vasitələrinin törətdiyi dəyişikliklər bütün inqilablar içərisində təsiredicilik nöqteyi-nəzərindən birinci sıraları tutmaqdadır. "Kütləvi informasiya vasitələri yalnız informasiya ötürmür, yeniliklərdən xəbər vermir, həm də müəyyən ideya və baxışları, siyasi proqramları propoqanda edərək sosial istiqamətdə iştirak edir... Öz şəxsi maraqları, daha çox isə bəzi qrupların maraqları fonunda fəaliyyət göstərərək, danışıq manipulyasiyasının subyekti auditoriyaya, onun düşüncəsinə, seçiminə və fəaliyyətinə də təsir göstərməyə çalışır" (Nikitina, 2006:104-106). Kütləvi informasiya vasitələrinin təsir gücü onun elektronlaşdırılması ilə daha da artmış və nəhayətdə bu sahənin inqilabını pik nöqtəyə çatdırmışdır. Q.Q.Poçepsov öz tədqiqatlarında "manipulyasiya" termininin kütləvi informasiya vasitələrindəki işləkliyini nəzərə alaraq, onu "media-silah" termini ilə əvəz etmişdir (Pochepsov, 2001).

Manipulyativ strategiya baxımından kütləvi informasiya vasitələri və elektron informasiya vasitələri ümumilikdə geniş rakursu əhatə edir. Bizi maraqlandıran əhatə dairəsi isə media dirskurslarına daxil olan reklam diskurslarıdır. Kütləvi informasiya vasitələri daxilində ən güclü manipulyativ strategiya məhz onlara aiddir. Təsiredicilik və idarəetmə gücünə malik olan reklamlar bizim gündəlik həyatımızı demək olar ki, bütövlükdə öz əhatəsinə almış, dünyamızın ayrılmaz bir parçasına çevrilmişdir. Afişa divarlarında, avtobus dayanacaqlarında, gündəlik qəzetlərdə, TV-də və s. kimi əhatələrdə hər bir şəxs ixtiyari və ya biixtiyari olaraq reklamlarla toqquşur. Əksər məqamlarda reklamlar təsir edir və məqsədlərinə də müvəffəq olur. Əslində kütləvi reklam diskurslarında qurulmuş hər bir danışıq aktının məqsədi auditoriyanın sonrakı fəaliyyətini manipulyasiya etmək, öz məhsulunun satış imkanlarını artırmaqdan ibarətdir. Bu məqamda reklamların ən təsiredici aləti dil, onun vahidləri və koqnitiv bazadır. Linqvistik və qeyri-linqvistik dil vahidləri, rəng seçimi, musiqi və ya səs effekti bu istiqamətdə əsas təsiredici praqmatik vasitələrdən hesab olunur. Bizi bu sahədə maraqlandıran qisim linqvistik vahidlərdir. Onların vasitəsilə reklam yaradıcıları ilə auditoriya arasında xüsusi manipulyativ sahə yaradılır. İlk baxışdan reklamların xidmətləri iqtisadi mənafe təəssüratı bağışlayır. Amma burada iqtisadiyyatla bağlı olan məqamlar onların yeganə funksionallığını təşkil etmir. “Öz şəxsi maraqları, daha çox isə bəzi qrupların maraqları fonunda fəaliyyət göstərərək, danışıq manipulyasiyasının subyekti auditoriyaya, onun düşüncəsinə, seçiminə və fəaliyyətinə də təsir göstərməyə çalışır” (Nikitina, 2006:104-106).

Maraqlı tədqiqatçılar qisminə aid olan Diter Flader 1976-cı ildə yazdığı “Reklam strategiyası” əsərində reklam təsirinin rekonstruksiyasında linqvistik, psixoanalitik təsir gücünü araşdırmışdır. O, psixoanalitik nəzəriyyədən çıxış edərək, linqvistik kateqoriyaları müəyyən etməyə çalışmış, reklamlar vasitəsilə dilə məxsus hərəkətliliyi təhlil etmişdir. Alimin fikrinə görə, reklam dilinin təsir gücü onun açıq şəkildə verilməsi və qarşı tərəfdə inam yaratması ilə bağlıdır. O, “dildən istifadəni” istifadəçinin danışıq kommunikasiyası ilə onun münasibətini idarə edən fenomen kimi müəyyən etmişdir. Həqiqətən də dilin təsiri altına düşmüş alıcıda ötürülmüş informasiyalar inam yarada bilirsə, reklamlar effektli olur.

Reklam diskurslarını digər KİV materiallarından daha güclü edən xarakterik xüsusiyyətlərdən biri onların özlərini iddialı formada təzahür etmələridir. Adi ünsiyyət prosesinin mürəkkəb formasını xatırladan reklam diskurslarının əvvəlcədən planlaşdırılmış aktları informantların psixoloji xüsusiyyətlərinin nəzərə alınması ilə qurulur. Digər aktlardan, xüsusilə də digər KİV materiallarından fərqlənən reklam diskurslarının əsas xarakterik xüsusiyyəti informasiyaları qəbul edən informantlarda xüsusi rahatlıq hissi yaratmaqdan ibarətdir. Adi ünsiyyət prosesində olduğu kimi hər kəs məqsədinə uyğun şəkildə danışıq fəaliyyətinə daxil olur. Bu zaman iştirakçıların qarşısında bir sıra şərtlər və qaydalar, qaydalara uyğun xüsusi məqsədyönlü fəaliyyətlər mövcud olur. Həmin şərtlər daxilində daxili təəssüratlarını dinləyənə çatdırmağa çalışan adresant müxtəlif üsul və vasitələrdən istifadə edir. Tərkibində resipientin dünya bilgisinə, həyat maraqlarına, təsəvvürlərinə daxil olan bilgilər əhatəsində məqsədli informasiyalar çoxluğu kodlaşdırılaraq, qarşı tərəfin beyninə yerləşdirilir. “Tanış” informasiyalara məxsus faiz çoxluğu ötürülən yeni informasiyaları yekunda rahatlıqla əldə edir və beynin müəyyən hissəsində saxlayır. Burada “tanış” və yeni informasiya qismində adlandırılmış ifadələr tema-rema anlayışlarından fərqli xüsusiyyətlərə malikdir. Onlar daha çox adresat-informantın kontekstinə uyğunlaşdırılmış informasiyalar çoxluğudur. Tema-rema anlayışları mesajdan-kontekstə yönəlikli olursa, “tanış” və yeni informasiyalar çoxluğu kontekstdən mesaja yönəldilərək yaradılır (Veysəlli, 2006).

Adi ünsiyyətdə yaradılan danışıq aktlarından daha güclü təsiretmə qabiliyyətinə malik olan bu aktlar eyni linqvistik vasitələrlə yaradılsa da, fərqli strukturlara malik olurlar. “Standart yanaşmalar öncə mesajın yaranmasına, təhlilinə, daha sonra kontekstinə yönəlirsə, tətbiqi yanaşmalar ilk öncə kontekstin yaranmasına yönəlikli olur... İnsan inam dəyərini kontekstdən mesaja istiqamətləndirir, çünki kontekstə olan inam daha üstündür... Kontekst bizim diqqətimizin kandarından keçir” (Pochepsov, 2001:44). Uğurlu reklamların manipulyativ strategiyası heç bir halda resipientin maraqlarına zidd olan ifadələr üzərində qurulmur. Auditoriyada inam yaratmağa çalışan mediatorlar onların maraq dairəsini mütləq şəkildə nəzərə alır. Məsələn, şampun, saqqız və ya hansısa qida məhsulunun reklamı birbaşa kontekstlərlə bağlı olduğundan, adresat-informantlarda xüsusi maraq və rahatlıq yaradır. Adları çəkilən məhsullar və onlara bənzərlər alıcıların həyatında əslində xüsusi tapşırıqları icra etmək üçün lazımlıdır. Həmin məhsullarla bağlı göndərilən informasiyalar elə bu baxımından informantların təsəvvüründə “tanış” vasitələr şəklində canlanır ki, bu da əksər zamanlar məhsulun ətrafında yaranmış kontekst əhatəsində

xüsusi inama gətib çıxara bilir. "Doğmalaşmış" kontekstlər əsasında mediatorlar alıcılarını əksər zamanlar istədikləri mövqelərə yönləndirə bilirlər. Burada Z.Freydin psixoanalitik nəzəriyyəsi yada düşür. O, bu nəzəriyyəni təhtəlşüurun bilikləri üzərində qurur. "Sözlərlə bir insan başqa bir insanı xoşbəxt və ya məyus edə bilər... Sözlər affektdir" (Zigmund, 2007:4). Amma burada qeyd etməliyik ki, istifadə olunan sözlər əslində birbaşa gizli manipulyativ strategiyaya xidmət etsələr də, uğurlu nəticənin əldə olunması üçün kodların "doğma" kontekstlər əsasında şifrələnməsi vacib şərt hesab olunur. "Real olaraq kommunikator mesaj ötürmür, o, yeni fəaliyyət proqramına "açar" verir. Şüurda bu proqramlara eynilik və ya oxşarlıq təşkil edən yazılar daha uğurlu variantlardır" (Pochepsov, 2001:43). Gözlə görünməyən və pərdə arxasında saxlanılan fikirlər linqvistik və koqnitiv baza üzərində həyata keçirilir. Əsas məqsəd adresat-informantların diqqətini düzgün kontekstlərə yönləndirməkdir. Bundan sonra gözlə görünməyən fikirlər işə salınır.

Kontekstlər və istifadə olunan vahidlər hər bir halda propozitiv əlaqələri özündə ehtiva etməlidir. Propozitiv gerçəklik və ötürülmüş kodların bir-birinə uyğun gəlməsi ötürülmüş informasiyaların qəbul edilməsi prosesində informantlarda xüsusi güvən yaradır. Bu cəhətdən reklam diskurslarını digər KİV materiallarından daha güclü edən xarakterik xüsusiyyət onların özlərini iddialı formada və propozitiv gerçəkliklərə uyğun tərzdə təzahür etmələri və informasiyaları qəbul edən informantlarda xüsusi rahatlıq hissi yaratmalarıdır. Tərkibində resipientin dünya bilgisinə, həyat maraqlarına, təsəvvürlərinə daxil olan bilgilər əhatəsində məqsədli informasiyalar çoxluğu kodlaşdırılaraq, qarşı tərəfin beyninə yerləşdirilir. Adi ünsiyyət prosesinin mürəkkəb formasını xatırladan reklam diskurslarının əvvəlcədən planlaşdırılmış aktları digər tərəfdən informantların psixoloji xüsusiyyətlərinin nəzərə alınması ilə qurulur. Hər bir fərdin psixologiyası onun dünyasında mövcud olan elementlərin qarşılıqlı əlaqələrindən təşkil olunur. Məsələn, müəllim və ya sürücünün psixologiyası onlara tanış və yaxın olan amillər çoxluğundan ibarətdir. Bu baxımdan hər kəs üçün ona yaxın və ya "tanış" informasiyalar beyində daha rahat və daha əlçatan informasiyalar qismində çıxış edir. Qarşı tərəfin "tanış" informasiyalarına yaxşı bəlli olan adresant-manipulyator kodlaşmasında məhz bu informasiyalar üzərindən gediş etməyə çalışır. Daha sonra manipyulyatorun məqsədlərinə xidmət edən kodlar qarşı tərəfə yönləndirilir. Adətən "tanış" informasiyalara məxsus faiz çoxluğu ötürülən yeni informasiyaları yekunda rahatlıqla əldə edir və beynin müəyyən hissəsində saxlayır (Veysəlli, 2015:120).

Reklam diskurslarının xarakterik xüsusiyyətlərindən biri də onda istifadə olunan "dil oyun"larının çoxluğudur. Belə ki, auditoriyasının sonrakı fəaliyyətini manipulyasiya edərək, öz məhsulunun satış imkanlarını artırmaqda maraqlı olan reklam diskurlarının linqvistik icra əhatəsində daha çox "dil oyun"ları vahidləri nəzərə çarpır. Burada ötürülən "xüsusi" informasiyaların əksəriyyəti "dil oyun"ları formatında təqdim olunur. Ümumiyyətlə "dil oyunlar"ı dedikdə, hər hansı kontekstdə verilmiş ifadələr, müxtəlif növ işarələr, sözlər və cümlələr başa düşülür. Belə vahidlərin istifadəsi hər bir reklam mətnini xüsusi və özünəməxsus edir. Linqvitik vahidlər sırasında daha güclü təsiretmə qabiliyyətinə malik olan "dil oyun"u fenomeninə reklam diskursları ilə yanaşı media diskurslarının digər növlərində, eyni zamanda gündəlik həyatımızda da rast gəlmək mümkündür (Məmmədov, 2010:96). Əslində dilçiliyin terminoloji bazası içərisində "oyun" məfhumunu heç də nabələd anlayış kimi qarşılamaq olmaz. Dilçiliyin tarixində dilin sistem və strukturunu xarakterizə etməyə çalışan görkəmli dilşünas Ferdinand de Sössür dil vahidlərinin ünsiyyət prosesindəki düzümünü şahmat oyunu, onun fiqurları və qaydaları əsasında izah etmişdi. Amma daha çox dilin fəlsəfi tərəflərinin müəyyənləşdirilməsinə xidmət edən "dil oyun"u anlayışı F.de Sössürün verdiyi anlayışdan fərqlənir. Onun elmə daxil edilməsi məşhur filosof L.Vitgenşteynin adı ilə bağlıdır. Oyunları dil müstəvisində fəlsəfi nöqteyi-nəzərdən araşdırmalara cəlb edən L.Vitgenşteyn 1953-cü ildə çapdan çıxardığı "Fəlsəfi tədqiqatlarında" nəzəriyyəyə qarşı çıxaraq, sözlərin birbaşa əşyaları adlandırmaq üçün xidmət etdiyini söyləmişdi. Onun yaradıcılığında "dil oyunlar"ı daha çox adi danışıq dilində nəzərə çatdırılır. Bununla o, ümumi dil praktikasında onların sadə aspektlərini müəyyənləşdirməyə çalışmışdır. Filosofun baxışına görə, hər bir dil ifadəsi insan təcrübəsinin mərkəzini təşkil edir. Yalnız bu təcrübəyə uyğun olaraq, istifadə olunan "dil oyunlar"ı fərqli fikirlər yaradır. Hər hansı bir söz, məfhum və ya cümlə onların kimsə tərəfindən ifadə olunmasından və ya nə etməsindən asılı olmayaraq müəyyən mənalara malik olurlar. Belə dil vahidləri dildən istifadənin kreativ tərəfini üzə çıxarır. L.Vitgenşteynin qeydlərinə görə "danışıq dilin bir hissəsi olaraq, onun fəaliyyəti və ya yaşayış formasıdır... Hər kəs öz koqnitiv bilikləri sayəsində "oyun"ları müxtəlif cür icra edir. Bu həyatın

formasıdır və biz həyatı yox, bütün reallığı dilin prizması ilə dərk edirik. Bu prosesin çərçivəsi həddindən artıq çoxşaxəli və maraqlıdır" (Vitgenshteyn, 1994:5).

"Dil oyun"ları xarakterik olaraq, müəyyən bir kontekstdə verilmiş, müxtəlif növ işarələr, sözlər, cümlələr və ifadələr çoxluğudur. Bütün mətnlər və diskurslar kimi reklam diskursları da dil işarələri vasitəsilə formalaşır və özündə Ç.Morris tərəfindən verilmiş üç aspekti ehtiva edir. Sintaktika ötürülən mesajın tərkibi, yaradılması, quruluşu ilə bağlı məqamlarda məsuldur. Yəni reklam diskurslarını təşkil edən ifadələr hər bir dilin sintaktik qaydalarına uyğun olaraq gerçəkləşdirilir. Semantika öz növbəsində ötürülmüş mesajın məzmunu ilə bağlı məqamlarla maraqlanır. Yenə də hər bir dilə məxsus semantik rəngarəngliklərdən istifadə etmək mümkün olur. Praqmatika mesajın ötürüldüyü qarşı tərəfin reaksiyası ilə bağlıdır. Ötürülmüş informasiyaların təsir gücünü semiotikanın bu aspekti sayəsində müəyyənləşdirmək mümkündür. Adi danışıq aktlarından fərqlənən reklam diskursları bu aspektlərin funksionallığında da fərqli performanslar nümayiş etdirir. Burada manipulyativ startegiyanın idarə edilməsi praqmatikanın öhdəliklərinə düşür. Əslində elə reklam diskurslarının malik olduğu manipulyativ strategiyalar praqmatik aspektin tələblərinə uyğun təşkil olunur. Praqmatik aspektin tələbləri sadə danışıq aktlarında sadə formatda formalaşdırılsa da, reklam diskurslarının əsas mahiyyət daşıyıcı obyekti halında özünü göstərir. Praqmatik niyyətin uğurla həyata keçirilməsi ifadəlilik aktından birbaşa asılı vəziyyətdə olur. "Oyun zamanı elə fəaliyyət başa düşülür ki, danışığın istehsalçısı qəbuledənin presumptiv biliklərinə əsaslanır və onu nəticəyə doğru yönləndirir" (Rishar, 1998:125).

Kontekstdən mesaja doğru yaradılan istiqmətdə manipulyativ strategiyanın reklam diskurslarındakı ən böyük silahı olan "dil oyunlar"ının da əsas xarakterik xüsusiyyəti onların da "tanış" kontekstlər üzərində qurulmuş oyundan ibarət olmasıdır. Propozitiv gerçəkliyə tam uyğunluq təşkil edən və "tanış" kontekstlərə uyğunlaşdırılan kodlar gözlənilmədən propozitivlik baxımından müəyyən çevriliş edir və sanki beyin qavramasında komik effekt yaradır. "Oyunlar praktiki effekt yaratmaq xatirinə qurulmur. Onlar şüurlu fəaliyyət olub, insanın ətraf aləmə olan münasibətinin inikasıdır. Oyuna girərək, insan gerçəkliyi əks etdirir və dünyanı dəyişdirir. Onun əsas məqsədi reallığı təbliğ etməkdir" (Rubinshteyn, 2001).

"Dil oyun"u anlayışını elmə gətirən L.Vitgenşteyn XX əsrin böyük filosoflarından biri hesab olunur. Tədqiqatlarının ilk dövrlərində o, daha çox dilin məntiqi təhlili ilə maraqlanırdı. Sonralar onun dil-məntiq-reallıq trixotomiyası "Məntiqi-fəlsəfi traktat"da təsvir olunaraq, elm aləmində böyük rezonans doğurdu (Vitgenshteyn, 1994). Yaradıcılığına xüsusi uğur gətirən həmin əsər L.Vitgenşteynin ölümündən sonra 1953-cü ildə çapdan çıxmışdır. Əsər L.Vitgenşteynin dil və dünya haqqında olan təhlilləri ilə zəngindir. Yaradıcılığının sonrakı dövrlərində yazılmış "Fəlsəfi araşdırmalar" adlı kitabı da elm aləmində xüsusi çəkisi olan ədəbiyyatlardandır. Əsərdə əsas diqqət anlam prosesinə yönləndirilərək, dilin qaydalara əsaslanan strukturunun təhlilinə həsr olunmuşdur. Təhlillər daha çox məna, anlam, riyaziyyatın əsasları və insanın təhtəlşüuru ilə əlaqələndirilmişdir. Məsələn, əsərdə verilmiş "Beetle in a Box" analogiyası üzərində çəkilmiş nümunə filosofun tərzini aydın şəkildə əks etdirir (Vitgenshteyn, 1994). Burada filosof bir qrup insan və onlardan hər birinin əlində içərisində "həşərat" olan bağlı bir qutunu təsvir edir. Verilən təsvirdə həşərat hər kəsin xəyalına uyğun olaraq fərqli şəkildə verilir. Bu analogiyada filosof qutunu insani düşüncəyə, həşəratı isə zehnin içərisində olanlara bənzədir. Yəni fərqli yanaşma əsasında hər bir kəsin düşündükləri şəxsi təcrübələr yaşadıqları ilə əlaqəlidir və bu səbəbdən də bir-birindən fərqlidir. Elə məşhur "dil oyunu" anlayışı da bu əsər vasitəsilə elmə gətirilmişdir (Vitgenshteyn, 1994). Filosofa görə, danışıq insan fəaliyyətinin məqsədyönlü komponenti, dil isə xüsusi tapşırıqları yerinə yetirməyə xidmət edən bir silahdır. Onun fikrincə, danışıq ilə fəaliyyətin birləşməsi "dil oyunu"dur və bu böyük sintezdən yaranan fenomen sözlərin və ifadələrin müxtəlif kontekstə əsasən dəyişməsidir. "Mən bunu bütünlükdə edəcəm: bir-birindən ayrılmaz olan dil və fəaliyyət "dil oyunu" adlanır" (Vitgenshteyn, 1994). Ümumilikdə əsərdə insan həyatı "dil oyunları"nın məcmusu kimi təsvir edilir. Uyğun "dil oyun"larının yaradılması dilin hərəkətliliyi və koqnitivliyinin düzgün uyğunlaşdırılması ilə mümkün olur. Hər bir "dil oyun"u ünsiyyətin bitmiş sistemidir. Bu zaman dilin funksiyalarından koqnitivlik yox, hərəkətlilik ön plana çəkilir (Vitgenshteyn, 1994). "Dil oyun"ununun mövcudluğu L.Vitgenşteyn yaradıcılığında daha çox fəlsəfi xarakter nümayiş etdirir. Bu baxımdan o, ifadə olunanları ifadə olunmayanlardan fərqləndirməyə çalışmış, bu istiqamətində özünə İ.Kant ideologiyasını rəhbər tutmuşdu. Filosofun qeydlərinə görə, "...dili sistemləşdirmək və kontrol etmək çox çətindir." Burada dilin "qrammatik üst qatı"

onun məntiqi funksiyalarını və vahidlərinin dərin keyfiyyətini bir növ maskalamış olur (Vitgenstayn, 1994). Bu istiqamətdə "dil oyun"u mexanizmi ifadələri semantik əhatədən uzaqlaşdırır, qarşı tərəfin diqqətini daha çox cəlb edir. L.Vitgenşteynin öz təbirincə desək, "hər bir sözün mənası var. Bu məna isə sözə tabedir" (Vitgenshteyn, 1922:117). Filosofun əsərlərinin əsas maraq dairəsi "dil oyunlar"ının daha çox adi danışıq dilində işlədilməsidir. Bununla o, ümumi dil praktikasında müəyyən sadə aspektləri müəyyənləşdirməyə çalışmışdır. Filosofun baxışına görə, hər bir dil ifadəsi insan təcrübəsinin mərkəzini təşkil edir. Yalnız bu təcrübəyə uyğun olaraq, istifadə olunan "dil oyunlar"ı fərqli fikirlər yaradır. Hər hansı bir söz, məfhum və ya cümlə onların kimsə tərəfindən ifadə olunmasından və ya nə etməsindən asılı olmayaraq müəyyən mənalara malikdirlər.

"Dil oyunları müxtəlif səslənmə, tam və ya hissələrlə işlənmiş omonimlər və polisemiya kimi dil fenomenləri vasitəsilə yaradılır və dəyişməz leksik mənanı dəyişdirir" (Vinagradov, 2001:199-200). Məsələn, müasir reklam diskurslarında hərflərin dil qaydalarının normasına uyğunsuz yazılışı qüsur kimi deyil, əksinə reklam yaradanın məqsədinə istiqamətlənmiş kommunikativ norma kimi qarşılanır. Və ya sözlərin orfoqrafik yazı qaydalarına uyğunlaşdırılmayan forması qarşı tərəfə ötürülmüş bir mesaj niyyəti daşıyır. Z.Freydin psixoanalitik nəzəriyyəsində də olduğu kimi, "Biz cəsarətlə belə qərar verə bilərik ki, bəzi hallarda yanlış deyimlərin belə mənası olur. Bəs "mənası olur" nə deməkdir? Bu o deməkdir ki, yanlış deyimləri xüsusi məqsədi, müəyyən ifadə forması və mənası olan bütöv psixi akt hesab etmək olar" (Zigmund, 2007:9).

Həqiqətən də "dil oyunu" bütövlükdə həyatımızın ayrılmaz bir formasıdır. İdeal, rasional, qüsursuz yol həmişə mümkün olan yoldur. Bu tip "oyun"larla dinləyənin düşünmə tərzini müəyyən təsirlər edilir. "Dil oyunları işarələrin gündəlik istifadədə olan mürəkkəb formasından daha sadə şəkildə istifadə metodudur. Dəqiqliyə çox da ehtiyac duymayan anlayışlardan biri də "dil oyunlar"ıdır" (Vitgenshteyn,1994). Onların sayəsində norma əhatəsində olan forma müəyyən dərəcədə şəklini dəyişdirir. Düzgün, axarlı ifadələrin qəbuluna öyrəşmiş resipient beyni bir növ avto-pilot mexanizmi ilə çıxış edir. Bu tip oyunların istifadəsi ilə insan beyni sanki ilk anlamda "mat" qalmış olur. "Oyunlar"ın vasitəsilə həmin ideal, rasional, qüsursuz ifadələrə sanki xüsusi bir effekt verilir və dinləyənin düşünmə tərzinə təsir edilir. Beləliklə, avto-pilot birdən-birə aktiv düşünmə fəaliyyətinə keçid alır və resipientin gözləmədiyi halda rastlaşdığı söyləmlər onun özü tərəfindən yerinə düzülərək, rasional vəziyyətə gətirilir. Bu tapşırığın yerinə yetirilməsi isə qarşı tərəfin koqnitiv bilik əhatəsindən asılı olaraq icra edilir.

Bu cəhətdən "dil oyunlar"dan istifadə edən reklam diskursları son məqamda uğurlu nəticə əldə etmək niyyətiylə dinləyənlərə, auditoriyaya təsir gücünü artırmaq, unudulmaz izlər buraxmaq və "dil oyunlar"ı vasitəsilə daha gözəl effekt qazanmaq istəyir. "Dil oyun"larının xarakterinə uyğun olaraq, təqdim olunan məhsul informantın diqqətini cəlb edir və mətni daha cazibadar hala gətirir. Belə diskurslarda formal qanunauyğunluqlar (ədəbi, etik, hüquqi, qarammatik baxımdan) qəsdən normadan kənarlaşdırılır. "Pozulan" norma dərhal diqqət cəlb edərək, yaddaşda xüsusi iz buraxır. Bu baxımdan məqsədli şəkildə yaradılmış "qüsur" "dil oyun"u vasitəsilə lazımi informasiyanı auditoriyanın yaddaşına hopdurur. Bununla da həmin reklam çarxı uzun müddət hafizələrdə özünə yer edir. ""Dil oyun"u norma yayınması kimi danışan tərəfindən aydın və şüurlu şəkildə buraxılmalı, dinləyən tərəfindən isə oyun kimi qəbul edilməli, "bilərəkdən belə söylənildiyi" anlaşılmalı, səhv kimi qarşılanmamalı və danışanın dərin məqsədinə istiqamətlənməlidir" (Sannikov, 1999). Əslində belə növ ifadələr dil normalarının sadələşdirilməsi və dəyişdirilməsi ilə həyata keçir.

Məsələn, dünya məşhuru olan *McDonalds* brendinin adı "dil oyun"u fenomeni əsasında hərflərinin yazılışı və rənginin seçilməsi ilə oyunun qanunlarına uyğun olaraq, yaddaşlarda asanlıqla qalır və xüsusi obraz yaratmış olur. Həmin brendin reklam diskursları da qısafraqmentli olmalarına baxmayaraq, əksər zamanlar "dil oyun"larının vasitəsilə unudulmaz və effektiv təsirlər əldə edir. 28 saniyəlik reklamlarından birində, məşhur simalardan biri McDonaldsın hamburgerini reklam edir:

Biri qaçaraq McDonaldsa daxil olur və orada oturub burger yeməyə hazırlaşan tanışına səslənir:

− Tez gəl, küçədə maşınını cızırlar!

Həmin tanış səs gələn tərəfə baxır, amma yerindən tərpənmədən, əlində tutduğu burgeri böyük həvəslə yeməyə başlayır:

− Mənim acım mənə yetər!

(Başqa acılara gərək yox, McDonaldsdan yeni acılı klassik toyuqlu burger. Bu acı sizə yetər!)

Bu reklam çarxında istifadə olunan "dil oyun"u "acı" sözünü əsl kontekstindən uzaqlaşdırır, onun ətrafında yeni kontekst yaradır və reklam izləyicilərinin də diqqətini həmin yenilənmiş istiqamətə yönləndirmiş olur. Bununla izləyicilərin çoxunda bəlkə də dünya "acı"larının acığına həmin burger "acı"sını dadmaq marağı yaranır ki, bunu həqiqətən də McDonalds şəbəkələrində olan sıxlıqla və ona qarşı olan sevgi çoxluğu ilə bir daha müşahidə etmək mümkündür.

## Nəticə

Təhlildən göründüyü kimi, digər dil vahidlərindən öz yükü və vəzifəsi baxımından seçilən "dil oyun"ları fenomeni müxtəlif məqsədlər baxımından qurulan reklam diskurslarından aktiv, amma gözə görünməz bir manipulyativ performans nümayiş etdirir. Bu növ vahidlərin istifadəsi ilə qısa həcmli aktlar vasitəsilə uzunmüddətli perlokutiv effektlər yaratmaq mümkündür. Digər dil vahidlərinin beyin mexanizminə etdiyi təsirdən fərqli olaraq, "dil oyun"ları daha potensiallı fəaliyyət göstərir, yaddaş mexanizmində də özünə xüsusi "unudulmaz" yer yaradır. Nəticədə reklam diskurslarında bu kimi vahidlərdən istifadə auditoriyada xüsusi maraq yaradır və onları bir dinləyici olaraq, kommunikasiya mühitinin əhatə dairəsində saxlayır.

## Ədəbiyyat

1. Hacıyeva, M. (2021). Sadə cümlələrdə propozitiv və presuppozitiv əlaqələrin praqmatikası. Monoqrafiya. Bakı: Mütərcim, 133 s.
2. Hacıyeva, M. (2021). İşarələr sistemi və ünsiyyət. Dərs vəsaiti. Bakı: Mütərcim, 175 s.
3. Sharkov, F.I. (2001). Osnovy teorii kommunikatsii. Moskva, 580 s.
4. Pochepsov, G.G. (2001). Teoriya kommunikatsii. M.: Refl-buk, K.: Vakler, 650 s.
5. Nikitina, K.V. (2006). Rechevaya manipulyatsiya kak predmet lingvisticheskogo issledovaniya. Vestnik Bashkirskogo Universiteta. No.4, s.104-115.
6. Veysəlli, F. (2006). Dilçilik ensiklopediyası, I, II cild. ADU.
7. Zigmund, F. (2007). Vvedenie v psikhoanaliz. Lektsii. Piter, 467 s.
8. Veysəlli, F.Y. (2015). Koqnitiv dilçilik: əsas anlayışları və perspektivləri. Studia Philologiya, VII. Bakı: Mütərcim, 120 s.
9. Məmmədov, A., Məmmədov, M. (2010). Diskurs təhlilinin koqnitiv perspektivləri. Bakı: Çaşıoğlu, 96 s.
10. Vitgenshteyn, L. (1994). Filosofskie issledovaniya. Moskva, 612 s.
11. Rishar, J.F. (1998). Mentalnaya aktivnost. Ponimanie, rassuzhdenie, naxozhdenie resheniy. Moskva, 125 s.
12. Rubinshteyn, S.L. (2001). Osnovy obshiy psikhologii. Piter, 720 s.
13. Vitgensteyn, L. (1922). Logish-filosofishe Abhandlung. First published by Kegan Paul (London), 117 s.
14. Vinagradov, V.S. (2001). Vvedenie v perevodovedenie (obshie i leksicheskie voprosy). Moskva, 224 s.
15. Sannikov, V.Z. (1999). Russkiy yazyk v zerkale yazykovoy igry. Moskva, 544 s.

Göndərildi: 02.08.2022 Qəbul edildi: 25.09.2022

DOI: https://doi.org/10.36719/2663-4619/83/21-25

**Aydın Ehtibar oğlu Bəhrəmov**
Azərbaycan Kooperasiya Universiteti
iqtisadiyyat üzrə fəlsəfə doktoru
bahramovaydin@gmail.com

# AZƏRBAYCAN KƏND TƏSƏRRÜFATI MƏHSULLARI DÜNYA BAZARINDA

**Xülasə**

Azərbaycanın ixrac potensialının ildən ilə artması, xüsusən də kənd təsərrüfatı məhsullarının ixracda öz yerini tutması, ixracatçı təsərrüfatların öz inkişafı ilə yanaşı, ölkənin də iqtisadi cəhətdən dayanıqlı olmasında və onun tədiyyə balansının müsbət dinamikasında böyük rol oynayır. Bu məqsədlə kənd təsərrüfatı məhsullarının xarici bazarlara çıxış imkanlarının artırılması yollarının öyrənilməsi olduqca aktualdır. Ona görə də kənd təsərrüfatı məhsullarının xarici bazarlara çıxış imkanlarının artırılması üzrə kompleks araşdırmaların əhatə dairəsi genişləndirilməli, onlar daha intensiv surətdə aparılmalıdır, çünki xarici ticarət əlaqələrinin inkişaf etdirilməsi ölkənin ərzaq təhlükəsizliyinin əsas prioritetlərindəndir.
***Açar sözlər:*** *kənd təsərrüfatı məhsulları, ixrac potensialı, beynəlxalq ticarət, dünya bazarı, idxal-ixrac*

**Aydin Ehtibar Bahramov**

## Agricultural products of Azerbaijan in the world market

**Abstract**

The increase of Azerbaijan's export potential from year to year, and especially the export of agricultural products, plays a big role in the economic stability of the country and the positive dynamics of its balance of payments, along with the development of the exporting farms. For this purpose, it is very important to study the ways of increasing the access of agricultural products to foreign markets. Therefore, the scope of complex studies on increasing the access of agricultural products to foreign markets should be expanded, they should be conducted more intensively, because the development of foreign trade relations is one of the main priorities of the country's food security.
***Keywords:*** *agricultural products, export potential, international trade, world market, import-export*

## Giriş

Dünyada baş verən qlobal texnoloji tərəqqi, istehsalın ekstensiv tipindən intensiv metoduna keçid, nəqliyyat və logistika sahələrində inkişaf, bütün bunlar beynəlxalq ticarətin sürətli böyüməsinə, yeni sektorların meydana gəlməsinə səbəb olmuşdur. İqtisadi ədəbiyyatlarda beynəlxalq ticarət anlayışına müxtəlif yanaşma metodları var. Bir qrup iqtisadçı alim hesab edir ki, beynəlxalq ticarət ayrı-ayrı ölkələr arasında əmtəə və xidmətlərin mübadiləsidir, hansı ki, elmi-texniki inqilab şəraitində təsərrüfat həyatının beynəlmiləlləşməsi və beynəlxalq əmək bölgüsünün intensivləşməsi ilə bağlıdır. Xarici ticarət siyasəti dövlətin həm xarici iqtisadi siyasətinin, həm də ümumi iqtisadi siyasətinin həyata keçirilməsinin əsas vasitəsi olaraq çıxış edir. Müasir dövrdə dövlətlər öz xarici ticarət siyasətlərini ölkənin texnoloji baxımdan inkişaf səviyyəsini, istehsal olunan əmtəə və xidmətlərin keyfiyyətini, coğrafi mövqelərini, resurs potensiallarını və digər amilləri nəzərə alaraq formalaşdırırlar. Məhz belə olduqda ölkələrin iqtisadi cəhətdən inkişaf etmələri mümkündür. Çünki dünyanın heç bir dövləti daxili tələbatını yalnız yerli istehsal hesabına ödəməklə inkişafa nail ola bilməz.

Ölkə iqtisadiyyatının inkişafı, azad sahibkarlığın təşviqi üçün təkcə daxili bazar yetərli deyil. Xarici bazarlarda Azərbaycan məhsullarının yer tutması, bazar payına sahib olması əhəmiyyətli məsələdir. Prezident İlham Əliyev 2020-ci ilin yekunları ilə bağlı keçirdiyi müşavirədə qeyd etmişdir ki, Azərbaycan kənd təsərrüfatı məhsullarının ixracı məsələsinə yenidən baxmalı, Rusiyanın Azərbaycandan ixrac edilən pomidorlara bir neçə dəfə qoyduğu sanksiyanı xatırladaraq hökumətə ənənəvi bazarlar saxlanılmaqla yeni bazarlar axtarışına çıxılmağı tapşırıb. Bundan başqa, prezident ixrac, eləcə də ərzaq təhlükəsizliyinin təmin edilməsi üçün kənd təsərrüfatı məhsullarının çeşidinin artırılmalı olduğunu vurğulamışdır. Buna

görə də Azərbaycan məhsullarının satışında yalnız yaxın qonşularla kifayətlənməyib, üstünlüyü, əsasən, Avropa və Orta Asiya ölkələrinə vermək lazımdır. Buna görə də Azərbaycan yeni bazarlara çıxış üçün ilk növbədə Ümumdünya Ticarət Təşkilatına (ÜTT) üzvlük məsələsini həll etməlidir. Azərbaycanda kənd təsərrüfatı məhsullarının istehsalında bolluq olur.

Ən bahalı və ən yaxşı bazar Avropa bazarıdır. Azərbaycan istehsalçıları da Avropa bazarlarında özlərinə yer tapmağı orta və uzunmüddətli hədəf kimi qarşıya qoymalıdırlar. İqtisadi inkişaf etmiş ölkələrdə daha çox geni modifikasiya edilmiş məhsullar bazara çıxarılır. Buna görə də Avropanın özü maraqlıdır ki, Azərbaycan kimi geni modifikasiya edilməmiş, təmiz məhsulları ixrac edən ölkələrə üstünlük versin. Ona görə də Azərbaycan üçün alternativ bazar olaraq Avropa İttifaqı ölkələri mümkündür. Bunun yanında ərəb ölkələri, Afrika ölkələri də ola bilər. Müxtəlif ölkələrlə ticarət etmək lazımdır. Rusiya böyük bazar olsa da, onunla iqtisadi əməkdaşlığın fəsadları da var. Müxtəlif embarqolar qoya bilir deyə o, daha çox siyasiləşmiş bazardır. Azərbaycanda kənd təsərrüfatı məhsullarının istehsalında bolluq olur. Buna göstərən əsas təsirlərdən biri Azərbaycanın özünəməxsus coğrafi ərazidə yerləşməsidir. Azərbaycan dünyada yeganə ölkədir ki, onun həm Rusiya ilə, həm İranla quru sərhədi var və bu coğrafi yerləşmə üçtərəfli regional əməkdaşlığın inkişafı üçün mühüm əhəmiyyət kəsb edir. Həmçinin tarixi Böyük İpək yolu layihəsində nəzərdə tutulan iqtisadi dəhliz Azərbaycanın ərazisindən keçdiyinə görə, Cənubi Qafqaz respublikaları arasında daha çox Azərbaycan dünyaya inteqrasiya etmək imkanına malikdir. Çinin İpək Yolu layihəsi bütün Asiya qitəsini Avropa ilə birləşdirmək məqsədi daşıyır. Bu məqsədlə artıq bir neçə il ərzində həm Cənub-Şərqi Asiya ölkələri, həm də Cənubi Qafqaz ölkələri əsasən Azərbaycan və Gürcüstan Çinlə ticarət yollarına aid olan bir sıra müqavilələr imzalayıb. İpək Yolu layihəsi çərçivəsində həyata keçən ticarət dəhlizlərinin böyük hissəsi Xəzər Dənizi vasitəsilə Azərbaycana və daha sonra Gürcüstana birləşir. Bu da Azərbaycana dünya ticarət yolları şəbəkəsində mühüm rol oynamaq imkanı yaradır. Belə ki, tarixi İpək Yolu üzərində qurulmuş Bakı-Tbilisi-Qars dəmir yolu Çindən Avropaya yüklərin çatdırılması müddətini dəniz daşımalarına nisbətən iki dəfədən çox azaldır. Cografi yerləşməsinə görə sabitlik və təhlükəsizliyə xidmət edən Bakı-Tbilisi-Qars dəmir yolu region ölkələri üçün onun cəlbediciliyini artırır və eyni zamanda, Mərkəzi Asiya ölkələrinin − Türkmənistan, Qazaxıstan, Özbəkistan, Qırğızıstan və Tacikistanın, həmçinin Əfqanıstanın Avropa və dünya bazarlarına çıxışını asanlaşdırır, onların ticarət əlaqələrinin, iqtisadiyyatının inkişafında, inteqrasiyasında mühüm əhəmiyyət daşıyır. Həmçinin Azərbaycanda son illər ərzində ölkənin müxtəlif bölgələrində yeni beynəlxalq aeroportların istifadəyə verilməsi, yeni yolların salınması, regional layihələrin icrasında aparıcı rol oynaması Azərbaycanın məqsədyönlü siyasətinin tərkib hissəsi kimi həm daxili nəqliyyat infrastrukturunun inkişafına töhfə verir, həm də Azərbaycanı Avrasiyanın nəqliyyat qovşağına çevirir ki, bu da xarici bazarlarda rəqabətli məhsullarımızın dünyanın müxtəlif ölkələrinə ixrac olunmasına şərait yaratmaqla kənd təsərrüfatı məhsullarının istehsal tempinin artmasına səbəb olur. Lakin ixrac tempinin artmasına baxmayaraq, 2018-ci ildə kənd təsərrüfatı məhsullarının idxalı (1703.5 mln dollar) ixracı (688.5 mln dollar) təxminən 2.5 dəfə üstələmişdir.

1. Son dövrlərdə respublikada bu istiqamətdə bir sıra mühüm tədbirlər görülmüşdür. Belə ki, Azərbaycan Respublikası Prezidentinin fərmanı ilə təsdiq edilmiş "Azərbaycan Respublikası regionlarının 2019-2023-cü illərdə sosial-iqtisadi inkişafı Dövlət Proqramı", "Azərbaycan Respublikasında kənd təsərrüfatı məhsullarının istehsalına və emalına dair Strateji Yol Xəritəsi", "Azərbaycan Respublikasında xarici ticarətin liberallaşdırılması haqqında" fərman, "Azərbaycan Respublikasında idxal-ixrac əməliyyatlarının tənzimlənməsi 4 Qaydaları", "Azərbaycan Respublikasında idxal-ixrac əməliyyatlarının tənzimlənməsi qaydalarının təkmilləşdirilməsi sahəsində əlavə tədbirlər haqqında" fərman bu sahədə müsbət nəticələr əldə edilməsinə zəmin yaratmışdır (Əliyev, 2021:72). Belə şərtlər daxilində xüsusilə ixrac yönümlü istehsalın stimullaşdırılması və xarici bazarlara çıxış imkanlarının gücləndirilməsi, qlobal rəqabət mühitində məhsulların rəqabət qabiliyyətinin yüksəldilməsi tədbirlərinin reallaşdırılması, nəinki elmi, həm də təcrübəvi əhəmiyyət kəsb edir. Belə ki, kənd təsərrüfatı məhsullarının xarici bazarlara çıxış imkanlarının artırılması üçün əlverişli ixrac bazarı seçilməlidir.

Azərbaycan üçün ixrac bazarları seçilərkən iki qonşu ölkə Rusiya və İran daha real və cəlbedicidir: Rusiya bazarlarına daha çox məhsulun ixrac edilməsi və ticarət sanksiyalarının aradan qaldırılmasından sonra İranla ticarətin genişləndirilməsi müxtəlif kənd təsərrüfatı məhsullarının istehsalını və məhsuldarlığını artırmaqla hər iki bazarda fəaliyyətin gücləndirilməsi üçün real imkanlar yaradır. Həm

Rusiya, həm İran bazarları üçün qısamüddətli ixrac potensialına malik olan məhsullar Strateji Yol Xəritəsinin ikinci hədəfində də geniş şəkildə araşdırılaraq təyin edilmişdir. Belə ki, ixrac strategiyasının ikinci hədəfi olaraq əsas diqqət ölkəyə yaxın olan hədəf bazarlarının və bu bazarlar üçün potensialı olan məhsulların müəyyənləşdirilməsinə yönəldilmişdir. Bununla yanaşı çoxşaxəli ixrac modelinə keçid ilə bağlı da işlər görülməlidir. Belə ki, Azərbaycan kənd təsərrüfatı məhsullarının çox bir hissəsi Rusiyaya ixrac olunur, bu da xarici ticarətin bir istiqamətdə formalaşmasına gətirib çıxardaraq ciddi asılılıq yaradır. Bunun üçün yaxın çevrəmizdəki ölkələr arasında özləri də müəyyən kənd təsərrüfatı məhsullarının ixracatçısı olmayan bazarlar axtarılmalıdır. Belə ki, xarici bazarlara çıxış strategiyasının işlənib hazırlanması və həyata keçirilməsinin konseptual aspektləri baxımından ərazi baxımından yeni bazarlara daxil olmanın strateji məsələləri xüsusi aktuallıq kəsb edir (Engel, Valdes, 2000:71).

Orta Asiya bazarında müəyyən yer tutmaq mümkündür. Bura Qazaxıstan, Türkmənistan, Tacikistan, Qırğızıstan kimi dövlətlər daxildir. Lakin orada da ciddi kənd təsərrüfatı ixracatçısı olan Özbəkistanla rəqabət aparmalı olacağıq. Ona görə də əsas ixrac bazarlarının müəyyənləşdirilməsi ilə yanaşı, bu bazarlara iqtisadi baxımdan daha səmərəli, beynəlxalq bazarlarda rəqabət qabiliyyəti daha yüksək məhsulların ixracının stimullaşdırılması vacib məsələ kimi qarşıda durmaqdadır. Bu məqsədlə bazarlar üzrə daha dəqiq araşdırmalar aparılmalı, yerli xüsusiyyətlər nəzərə alınmaqla, ixrac strategiyaları hazırlanmalı və yerli istehsalçıların hədəf bazarlara çıxış imkanlarının artırılması istiqamətində konkret tədbirlər həyata keçirilməlidir.

2. Azərbaycanda kənd təsərrüfatı məhsulları istehsalçılarının xarici bazara çıxışı üçün əlverişli mühitin formalaşmasında sahəyə dövlət dəstəyi mühüm rol oynayır. Həmin dəstəyin gücləndirilməsi, xarici bazarda yerli məhsulların rəqabət qabiliyyətinin yüksəlməsinə xidmət edir (Əliyev, Şəkərəliyev, 2002:6).

Əlbəttə, bu müəyyən intervalda baş verir. Başqa sözlə, xarici bazara çıxarılan kənd təsərrüfatı məhsulları istehsalçılarının məsrəfləri azaltmaq motivini zəiflətməməlidir. Azərbaycan Respublikası Prezidentinin 5 oktyabr 2016-cı il tarixli 1063 nömrəli fərmanında xarici ölkələrə ixrac missiyalarının təşkili, xarici bazarların araşdırılması, "Made in Azerbaijan" brendinin xarici bazarlarda təşviqi ilə bağlı məsələlərə ciddi önəm verilmişdir (4).

Ölkə başçısının bu fərmanı ilkin araşdırmalardan göründüyü kimi, qeyri-neft məhsullarının, o cümlədən kənd təsərrüfatı məhsullarının istehsalının stimullaşdırılması və ixracının təşviqi mühitini formalaşdıran başlıca sənəd rolunda çıxış edir. Bundan əlavə, ixracatçılara dəstək məqsədilə "Bir Pəncərə" prinsipi reallaşdırılmışdır və Rəqəmsal Ticarət Qovşağı yaradılmışdır (Əliyev, 2021:7).

Bu məqsədlə xarici ölkələrdə fəaliyyət göstərən mağazalarda və "Duty Free"lərdə "Made in Azerbaijan" rəflərinin təşkili, yerli qeyri-neft məhsullarının vahid brend ilə dünyada tanıdılması və təşviq edilməsi məqsədi ilə xarici ölkələrin ictimai yerlərində və beynəlxalq KİV-də "Made in Azerbaijan" brendinin təbliği də həyata keçirilməkdədir (Hüseyn, 2018:408).

Kənd təsərrüfatı məhsullarının idxalında çeşiddən daha çox məhsuldarlıq önəmli olmalıdır, çünki Azərbaycanda bir hektardan götürülən məhsuldarlıq qonşu ölkələrdən, dünya ortalamasına görə daha aşağıdır. Bunun üçün aqrotexniki qaydalara əməl edilməli, elmi yanaşma olmalı, gübrə və toxumların seçimində elmi seleksiyadan istifadə olunmalı, əl əməyindən daha az istifadə olunmalıdır. Torpaqdan hansı məhsulun daha yaxşı əldə olunacağını bilən iri fermer təsərrüfatlarının yaradılmalı, aqrotexniki qaydalarla bağlı dəstək, uzunmüddətli aşağı faizli kreditlərlə bağlı dəstək verilməlidir (Hüseynov, 2021:3-4). Çeşidlərin seçilməsi üçün torpağın özəlliyi, hansı məhsul növünün məhsuldarlıq verəcəyi öyrənilməlidir. Bundan sonra çoxçeşidli məhsulların əkimi ilə bağlı elmi yanaşmanı da ortaya qoymaqla fermerlər də qərar verə bilər, bazar da bunu tənzimləyə bilər. Ona görə də ənənəvi məhsullar, yəni pomidor, xiyar, tərəvəz, nar, heyva, xurma kimi meyvə-tərəvəzlərlə yanaşı fındıq, badam, arıçılığın perspektivləri genişləndirilməlidir (Hüseynov, 2017:188-190).

Azərbaycan kənd təsərrüfatının xarici bazarlara ixracı ilə bağlı məsələlərlə məşğul olan əsas qurumlardan biri Azərbaycanda İxracın və İnvestisiyaların Təşviqi Fondu (Azpromo) 2003-cü ildə İqtisadiyyat Nazirliyi tərəfindən qeyri-neft sektorlarına xarici investisiyaların cəlbi və qeyri-neft məhsullarının ixracının stimullaşdırılması məqsədilə təsis edilmişdir. Azərbaycanda qeyri-neft sektorunun inkişafı, həmçinin istehsal olunan məhsulların xarici bazarlarda təşviqi ilə bağlı ölkə rəhbəri tərəfindən qarşıya qoyulmuş bir sıra hədəflərə nail olmaq məqsədilə xarici ölkələrdə müxtəlif beynəlxalq

tədbirlər təşkil etmək, xarici alıcıları Azərbaycan məhsulları barədə məlumatlandırmaq və yerli şirkətlərlə əlaqələndirmək, həmçinin Azərbaycan investisiya mühiti haqqında ətraflı məlumat toplamaq istəyən və investisiya yatırmaqda maraqlı olan xarici şirkətlərə "vahid pəncərə" funksiyası əsasında xidmət göstərmək və dəstək verməkdir (2018:15).

Azərbaycanın əsas ticarət tərəfdaşları kimi Rusiya, Türkiyə, ABŞ, Almaniya, Fransa və İtaliyanın adını çəkir. Azpromo-nun məlumatında deyilir ki, Azərbaycan qeyri-neft məhsulları arasında ən çox meyvə-tərəvəz, spirtli və spirtsiz içki, şəkər, müxtəlif yağlar, çay, plastik və kimya məhsulları ixrac edir. Qurumun kənd təsərrüfatı məhsulları üzrə bazar araşdırmaları bölməsində Baltik ölkələri, İsveçrə, Böyük Britaniya, Almaniya, Rusiya, Çin kimi ölkələrin adlarına rast gəlmək mümkündür (Qafarov, 2009).

Son illər dünya iqtisadiyyatında baş verən dəyişikliklər və beynəlxalq ticarət əlaqələrinin mürəkkəb xarakter alması dövlətin qarşısında xarici bazarlarda milli istehsalçıların mövqeyinin möhkəmləndirilməsi, ixracın stimullaşdırılması və daxili tələbatın daha böyük hissəsinin yerli istehsal hesabına ödənilməsinin təmin olunması kimi mühüm vəzifələr qoyur (Quliyev, Mehrəliyev, 2011). Həm milli, həm də dünya iqtisadiyyatında müxtəlif istiqamətli tendensiyalar tələbin alıcılıq qabiliyyətinin müəyyən hallarda azalmasına, rəqabətin kəskinləşməsinə, iqtisadi inkişaf perspektivləri və prioritetlərinin dəyişdirilməsinə səbəb olduğundan xarici ticarət əlaqələrinin təkmilləşdirilməsinə diqqətin artırılması zəruri məsələlərdən birinə çevrilmişdir (Məmmədov, 2005). Bu baxımdan bir çox dünya dövlətləri nəinki istehsalın və ixracın artımını əsas hədəf kimi müəyyənləşdirir, eyni zamanda yerli istehsalçıların qeyd edilən istiqamətlərdəki fəaliyyətinin dəstəklənməsi və rəqabət şəraitində onların daha uğurlu mübarizə apara bilməsi məqsədilə müvafiq tədbirlər həyata keçirir (Salahov, 2004).

## Nəticə

Ümumiyyətlə, dövlət xarici ticarət əlaqələrinin genişləndirilməsi ilə yanaşı, bu əlaqələrin səmərəliliyini təmin etmək üçün daha əlverişli tərəfdaşlarla iqtisadi münasibətlərdə maraqlı olur. Əsas hədəf isə bu şərtlər daxilində, ilk növbədə, ölkənin sosial-iqtisadi inkişafının yüksəldilməsinə yönəlir. İnkişaf etmiş ölkələrin təcrübəsi göstərir ki, kənd təsərrüfatında maliyyə sağlamlaşdırılması həyata keçirmədən, bütövlükdə sahəni, o cümlədən onun mühüm istehsal vahidləri kimi kənd təsərrüfatı əmtəə istehsalçılarının davamlı fəaliyyətini təmin etmək mümkün deyildir. Belə ki, maliyyə sağlamlaşdırılması, dövlətin aqrar siyasətini, o cümlədən kənd təsərrüfatının dövlət tənzimlənməsinin mühüm tərkib hissəsi hesab olunur.

Maliyyə sağlamlaşdırılması istiqamətində həyata keçirilən siyasət kənd təsərrüfatında fəaliyyət göstərən fermer təsərrüfatlarının müflisləşməsinin qarşısını alır və bu daxili ərzaq bazarında yerli istehsalın xüsusi çəkisinin yüksəldilməsinə və istehsalın rəqabətədavamlılığının artırılmasına əlverişli şərait yaradır. Məlum olduğu kimi bazar münasibətləri şəraitində kənd təsərrüfatı iqtisadiyyatın digər sahələri ilə müqayisədə az gəlirli və təbii iqlim şəraitindən asılı xarakterə malikdir. Bu baxımdan kənd təsərrüfatında iqtisadiyyatın digər sahələri ilə müqayisədə zəruri zərərlə işləyən təsərrüfat subyektlərinin səviyyəsi yüksək olur. Bu isə onunla bağlıdır ki, kənd təsərrüfatında aqrar biznesin rentabelliyi digər sahələrlə müqayisədə nəzərə çarpacaq dərəcədə aşağıdır və aqrobiznes fəaliyyətinin mühüm və strateji əhəmiyyətli sahəsi kimi kənd təsərrüfatı və onunla qarşılıqlı əlaqəyə malik olan sahələrdə investisiya cəlbediciliyinin yüksəlməsini əngəlləyir. Kənd təsərrüfatı məhsullarının idxalında emal məhsullarının, ixracda isə bunun əksinə, xammal formasında olan məhsulların xüsusi çəkisi daha böyükdür. Digər tərəfdən, kənd təsərrüfatı məhsullarını daha yüksək qiymətə Avropa ölkələrinə göndərə biləcəyimiz halda onları daha ucuz qiymətə Rusiya Federasiyasına ixrac edirik.

Deməli, kənd təsərrüfatı məhsullarının ixracında əsas diqqət emal məhsullarına yönəldilməlidir. Ancaq nəzərə almaq lazımdır ki, yerli məhsulların emalı nəticəsində əldə edilən məhsullar xarici bazara çıxdığı andan heç də rəqabət qabiliyyətli olmaya bilər. Bunun üçün keyfiyyət standartlarının təmin edilməsinə nəzarət gücləndirilməli və yalnız bundan sonra ölkənin milli brendinin formalaşdırılması istiqamətində təşviq tədbirləri görülməlidir. İxrac coğrafiyasında keyfiyyət dəyişikliklərinə nail olmaq üçün yerli istehsalçıların beynəlxalq sertifikatlarla təchiz olunmasına şərait yaratmaq lazımdır. Bunun üçün dövlət-özəl tərəfdaşlıqlarının qurulması tələb oluna bilər. Belə ki, kənd təsərrüfatı istehsalçılarının əksər hissəsinin kiçik fermerlərdən ibarət olması və sertifikatların qiymətlərinin çox yüksək olması dövlətin buraya müdaxiləsini zəruri edir. Hazırki dövrdə ixrac sertifikatların dəyərinin 50%-i dövlət tərəfindən

ödənsə də, fermerlər yerdə qalan 50%-in ödənilməsində də çətinlik çəkirlər. Sözügedən sertifikatların əldə edilməsi ilə bağlı iri fermer təsərrüfatlarına və kooperativlərə dövlət zəmanətli kredit dəstəyi göstərilə bilər. Bu yolla kiçik fermerlər belə ixracda müəyyən paya sahib ola bilərlər.

## Ədəbiyyat

1. Əliyev, P. (2021). Azərbaycan Respublikasında kənd təsərrüfatı və ərzaq məhsullarının ixracının dövlət tənzimlənməsinin nəticələrinin qiymətləndirilməsi. Kənd təsərrüfatının iqtisadiyyatı, № 1 (35), s.72.
2. Engel, E.M., Valdes, R.O. (2000). Optimal fiscal strategy for oil exporting countries. IMF, 71 p.
3. Əliyev, A.Ə., Şəkərəliyev, A.Ş. (2002). Bazar iqtisadiyyatına keçid, dövlətin iqtisadi siyasəti. Bakı.
4. https://e-qanun.az/framework/33825
5. Hüseyn, R.Z. (2018). Aqrar sahədə rəqabət qabiliyyətli məhsul istehsalı: qloballaşmanın çağırışları və inkişaf imkanları. Bakı: Avropa Nəşriyyatı, 408 s.
6. Hüseynov, M.M. (2021). Kənd təsərrüfatı məhsulları üzrə xarici ticarət əlaqələrinin inkişaf istiqamətləri. Avtoreferat. Gəncə, s.3-4.
7. Hüseynov, M.M. (2017). Xarici ticarət əlaqələrinin inkişafında kənd təsərrüfatının rolu. Azərbaycan Dövlət Aqrar Universitetinin elmi əsərləri, №4. Gəncə, s.188-190.
8. İxrac icmalı. (2018). İqtisadi islahatların təhlili və kommunikasiya mərkəzi. Yanvar, №1 (10), s.15.
9. Qafarov, N.C. (2009). Aqrar iqtisadiyyat. Bakı.
10. Quliyev, E.A., Mehrəliyev, İ.İ. (2011). Müasir dövrdə xarici iqtisadiyyat fəaliyyətinin dövlət tənzimlənməsinin xüsusiyyətləri. Bakı.
11. Məmmədov, A.S. (2005). Kənd təsərrüfatının iqtisadiyyatı. Bakı.
12. Salahov, S.V. (2004). Aqrar iqtisadiyyatın dövlət tənzimlənməsi problemləri. Bakı.

Göndərildi: 12.07.2022 Qəbul edildi: 18.09.2022

DOI: https://doi.org/10.36719/2663-4619/83/26-31

**Şəfəq Çingiz qızı Həsənova**
Azərbaycan Dövlət İqtisad Universiteti
mhasanova999gmail.com

# İŞGÜZAR KOMMUNİKATİV YAZIŞMALARDA İNTERNETİN ROLU

**Xülasə**

"İşgüzar kommunikativ yazışmalarda internetin rolu" adlı məqalə müasir dilçiliyin məşğul olduğu əsas sahələrdən biri kimi kommunikasiya və yazılı ünsiyyət probleminə həsr olunmuşdur. Çağdaş dövrümüzdə kommunikativ münasibətlərin qurulmasında işgüzar yazışmaların rolu danılmazdır. Bu, sənəd, məktub, ərizə və s. növlər olmaqla yanaşı, eyni zamanda iki və daha artıq şəxsin işgüzar yazışması da ola bilər. Müasir internet əsrində təbii ki, bunun üçün baza rolunu internet resursları təşkil edir. Eyni zamanda işgüzar yönümlü bir çox sənədlərin sürətli göndərilməsi üçün mail sisteminin də rolu danılmazdır. Bu səbəblə də hazırlanan məqalə, müasir kommunikativ işgüzar yazışmaların həlli istiqamətini təyin edir.

***Açar sözlər:*** *kommunikasiya, işgüzar yazışma, müasir, sənəd, internet, işgüzar etiket*

**Shafag Chingiz Hasanova**

## The role of the internet in business communication correspondence

**Abstract**

The article "The role of the internet in business communicative correspondence" is devoted to the problem of communication and written communication as one of the main areas of modern linguistics. In our modern era, the role of business correspondence in establishing communicative relations is undeniable. This is a document, letter, application, etc. in addition to types, there can also be business correspondence of two or more people at the same time. In the modern internet age, the role of the base for medicine is played by internet resources. At the same time, the role of the mail system for fast sending of many business-oriented documents is undeniable. For this reason, the article, which was prepared, determines the direction of the solution of modern communicative correspondence.

***Keywords:*** *communication, business correspondence, modern, document, internet, business etiquette*

## Giriş

"Rabitə" sözü latın dilində "communicare" sözündən əmələ gəlib, vermək, iştirak etmək, bölüşmək və ya ortaqlıq qurmaq mənasını verir. Kommunikasiya faktların, ideyaların, rəylərin və bu kimi halların mübadilə prosesidir. Eyni zamanda fərdin və ya təşkilatın bir-biri ilə məna və anlaşma baxımından fikir paylaşması deməkdir. Digər anlamda faktların, ideyaların, rəylərin, hisslərin, münasibətlərin ötürülməsi və qarşılıqlı əlaqəsidir. Kommunikasiya bəşəriyyətin maneələri və sərhədləri aşaraq ünsiyyət qurma qabiliyyəti, ətrafda sürətli və effektiv ünsiyyət yaratmaq bacarığıdır. Dünyada "qloballaşmanı" reallığa çevirən hadisə kimi ünsiyyət mühüm rola malikdir.

Ümummilli lider H.Əliyevin əsas amallarından biri Azərbaycan dilinin daha da təkmilləşdirilməsi və onun tətbiqi imkanlarının genişləndirilməsi idi. Elə bu məqsədlə də Heydər Əliyev tərəfindən "Dövlət dilinin tətbiqi işinin təkmilləşdirilməsi haqqında" 18 iyun 2001-ci il tarixli fərmanda qeyd edildiyi kimi, "Hər bir xalqın dili onun milli varlığını, ictimai siyasi təfəkkürünü, tarixini, mədəniyyətini müəyyən edən başlıca amillərdəndir (Səlimova, 2017:2).

Bu mənada Azərbaycan dilinin inkişafında internet yolu ilə işgüzar kommunikativ yazışmaların da rolu danılmazdır.

İşgüzar yazışma informasiya vasitələrindən istifadə etməklə işgüzar ünsiyyət üsuludur. Bu gün onu həyata keçirməyin ən məşhur yolu internetdir. Bundan əlavə, işgüzar yazışmalar üçün həm poçt xidmətlərindən, həm də ani messencerlərdən istifadə etmək mümkündür. Qeyd etmək lazımdır ki, işgüzar yazışmalar işgüzar etiketə məcburi riayət etməyi tələb edir (2).

İşgüzar yazışmalarda kommumikasiya müəyyən bir ölkəyə, mədəniyyətə və ya dil qrupuna mənsub insanların qarşılıqlı əlaqədə olmasını təmin etmək, eləcə də başqa ölkələrə, mədəniyyətə və ya dil qrupuna mənsub insanlarla əlaqələri yaratmaq vasitəsidir.

Ünsiyyət hər hansı bir təşkilatda idarəetmənin əsas funksiyalarından biridir və onun bu əhəmiyyəti danılmazdır: ünsiyyət, məlumatlar, ideyaların ötürülməsi prosesi, təşkilatlar arasında düşüncələr, rəylər və planlar da bu qəbildəndir. Uğurlu və təsirli ünsiyyət yalnız yaxşı insan münasibətləri üçün deyil, həm də yaxşı və uğurlu iş adamı olmaq üçün mühümdür.

Rəhbərlik-işçi münasibətlərində də kommunikativ münasibət məlumatın və qərarların effektiv ünsiyyəti üçün vacib komponentdir (3).

**İşgüzar yazışmalar korporativ ünsiyyət kimi**

Korporativ ünsiyyət kimi geniş mənada təşkilati strukturla ayrılmaz bir bütöv olan ünsiyyət insanlar arasındakı münasibətlərə də təsir göstərir. Kommunikasiya təşkilati strukturun fəaliyyətini təkmilləşdirən bir texnika, sosial quruluşun fəaliyyətini tənzimləyən bir vasitə, uğurlu idarəetmənin əsasını və alətini təşkil edən sistem kimi də düşünülə bilər.

Sosial quruluşda ünsiyyət sisteminə ehtiyacın əhəmiyyəti mübahisəsizdir. Kommunikasiya insanların müəyyən bir sistem daxilində ünsiyyət qurmasına imkan verən bir körpüdür. Kommunikasiya ən çox korporativ rabitə təmin etmək üçün seçilir və iki halda daha aktivdir: yazılı və şifahi ünsiyyət. Yazılı ünsiyyət, fərdlər və qruplar üzərində digər növlərə nisbətən daha təsirli və direktivdir.

**Rəsmi-işgüzar üslub və elektron sənədləşmə**

İş e-poçtu strukturuna görə adi kağız məktubdan fərqlənmir. Ancaq bəzi incəliklər var. E-poçt iş məktubu mövzu ilə müşayiət olunmalıdır. Bununla yanaşı məktubun qısa və aydın olması vacib şərtlərdəndir. Bu hal işin asanlaşdırılması, fikrin lakonik və aydın olması üçündür. Əgər məktubun mətnində hansısa sənədə istinad edilirsə, göndərməzdən əvvəl onun məktuba əlavə olunub-olunmadığını yoxlamaq vacibdir. Həmçinin, yazılan e-poçt ünvanına diqqət yetirilməlidir. Gülməli və ya anlaşılmaz bir e-poçt ünvanı həmin poçt sahibinin ciddi biri olmadığı informasiyasını verir.

Rəsmi-işgüzar üslub hamı üçün eynidir, yəni standartdır. Burada obrazlı ifadələrə, fərdi nitq xüsusiyyətlərinə rast gəlinmir. Milli rəsmi-işgüzar üslub başqa funksional üslublara nisbətən gec formalaşmışdır.

Bu üslubun lüğət tərkibi yığcam, sintaksisi məhduddur. Rəsmi-işgüzar üslubda bir sıra arxaik sözlər və köhnəlmiş sintaktik qəliblər uzun müddət qorunub saxlanılır.

Rəsmi-işgüzar üslub 2 yerə ayrılır: a) rəsmi sənədlərin dili; b) işgüzar sənədlərin dili.

Dövlət, hökumət təşkilatlarının tərtib etdiyi və rəsmi qaydada təsdiq olunan sənədlər (məsələn, Prezident fərmanları, hökumət sərəncamları, nazirlərin əmrləri, Konstitusiya və s.) rəsmi sənədlər sayılır.

Rəsmi sənədlərin əsas xüsusiyyətləri bunlardır:

- dilin maksimum mükəmməlliyi;
- fikrin tam aydınlığı;
- fikrin (sözlərin) birmənalılığı;
- fikrin hüquqi cəhətdən əsaslılığı (əsaslandırılması);
- dil yığcamlığı.

Təşkilatlarda məqsədə çatmaq üçün yazılı ünsiyyətin ən mühüm vasitəsi olan yazışmalardan istifadə edilir. Belə ki, yazılı sənədlər dəqiq, tez və qənaətlə göndərilə bilər.

Yazılı ünsiyyətə üstünlük verilməsinin əsas səbəblərini aşağıdakı kimi sadalamaq olar:

a) Yazılı sənədin arxiv dəyəri var (daha qalıcı);
b) Mesajlar tam şəkildə ötürülür;
c) Daha formaldır (özünü daha nüfuzlu hiss etdirir).

İnstitusional və arxiv yazışmalarının istehsalı keçən əsrin son rübündə kompüter texnologiyasında müşahidə olunmağa başladı.

Sənəd istehsalının həcmi günü-gündən artır. Korporativ uğur üçün sürətli və effektiv kommunikasiyanın mövcudluğu, göstərilən xidmətlərin səmərəliliyi və qənaətcilliyi, işçi qüvvəsinin tam mövcudluğu tutumla işləməklə əldə edilə bilər. Ona görə də qurumun uğurlu olması üçün, ilk növbədə, yazılı ünsiyyət olmalıdır (Odabash, 2001:4).

**Biznesdə işgüzar yazışmalar və internet sistemi**

İşgüzar ünsiyyət termini rəsmi məqsədlər üçün göndərdiyimiz və qəbul etdiyimiz bütün mesajlar üçün istifadə olunur: biznes idarə etmək, təşkilatı idarə etmək, könüllülərin rəsmi işlərinin təşkili və s. İşgüzar ünsiyyət şəxsi və sosial münasibətlərə zidd olaraq formallıqla qeyd olunur. Korporativ ünsiyyətdə istifadə olunan ünsiyyət vasitələri müxtəlifdir və buna görə də məqsəd, strategiya, forma və məzmun baxımından fərqli xüsusiyyətlərə malikdir. Bu nöqtədə önəmli olan mesajların hədəf auditoriyaya çatdırılması üçün ən uyğun vasitələri seçmək və bu vasitələrin bir çoxunu eyni anda istifadə etməkdir (Odabash, 2021:158-172). İstənilən biznesin uğuru böyük ölçüdə səmərəli və effektiv ünsiyyətdən asılıdır.

Amerika İdarəetmə Assosiasiyası bu vəziyyəti belə tərif edir: “Ünsiyyət məna mübadiləsində bir sonluqla nəticələnən hər hansı bir davranışdır”.

Peter Little ünsiyyəti belə tərif edir: “Ünsiyyət məlumatın əldə olunduğu prosesdir, fərdlər və ya təşkilatlar arasında ötürülür ki, başa düşülən cavab nəticələnsin”.

Nevman və Summer Jr bildirirlər ki, “Ünsiyyət faktlar, fikirlər, fikirlər iki və ya daha çox insanın duyğularını ifadə edən fikir mübadilədir (5).

**İşgüzar yazışmanın elementləri**

Ünsiyyət prosesi aşağıdakı elementləri əhatə edir:

1. Göndərən və ya ötürücü: Mesajı çatdırmaq istəyən şəxs göndərən kimi tanınır.
2. Mesaj göndərən tərəfindən həyata keçirilir və alıcının davranışını dəyişir.
3. Mesaj: İstənilən ünsiyyətin mövzusudur. Bu, istənilən faktı, ideyanı, rəyi və ya məlumatı ehtiva edə bilər. Əgər ünsiyyət baş tutacaqsa, o, göndərənin zehnində mövcud olmalıdır.
4. Kodlaşdırma: İnformasiyanın kommunikatoru öz ideyasını simvollar silsiləsi şəklində tənzimləyir (sözlər, işarələr və s.). Bunun vasitəsi ilə nəzərdə tutulan alıcıya və ya qəbul edənlərə xəbər verilir.
5. Rabitə kanalı: Göndərən mesajı göndərmək üçün məlumat kanalı seçməlidir. Rabitə kanalı mesajın keçdiyi mediadır. Bu göndərən və qəbul edəni birləşdirən əlaqədir.
6. Qəbul edən: Mesajı qəbul edən və ya qəbul edən şəxs adlanır.
7. Xüsusi mesajın ötürücü tərəfindən kimə göndərildiyi ünsiyyət prosesidir və mesajın qəbuledicisi olmadan bu hal natamam proses hesab olunur. Qəbul edən qəbuledicidir və mesajı anlamağa çalışır.

İş məktubunun tərkibi adətən üç hissədən ibarətdir. Birinci hissə giriş (başlanğıc), ikinci hissə əsas, informativ, üçüncü hissə yekun, məlumatları ümumiləşdirir və gələcək əməkdaşlıq üçün arzuları ehtiva edir.

İşgüzar ünsiyyətdə bütün nitq hərəkətləri sorğulara, mesajlara, təklif və təsdiqlərə bölünə bilər. Məktubun quruluşu belə görünə bilər:

− Zəhmət olmasa...
− Biz də xahiş edirik...
− Biz məlumat veririk...
− Eyni zamanda məlumat...

Hər bir nitq aktını müstəqil aspekt kimi qeyd etmək lazımdır, çünki hər sorğu, hər təklif üçün müstəqil qərar qəbul edilir (6).

Məktublar adətən biznes və ya dövlət idarələrində vakant olan vəzifələrə dəvət zamanı müraciət üçün istifadə olunur. Müraciətlər ya reklamlara cavab olaraq, ya da öz təşəbbüsü ilə təklif şəklində həyat keçirilir.

− Ərizəçinin ünvanı və telefon nömrəsi məktubun yuxarı sağ küncünə yerləşdirilir.
− Məkubun səliqəli tərtibatı vacibdir, dəyişdirilmiş blok və ya yarımblok forma ən yaxşı forma hesab olunur.
− Əgər elanda ərizəninin öz dilindən yazılması tələb olunursa əlyazma, üzlük məktubu tünd göy mürəkkəb və ya top qələmlə səliqəli şəkildə yazılmalıdır.
− Məktub elanda göstərildiyi kimi ünvanlanmalıdır. Əgər məktub bir şirkətə ünvanlandıqda, müraciət forması “Cənablar” olmalıdır.
− Sertifikatlar kimi orijinal sənədlər heç vaxt ərizəyə əlavə edilmir. Yalnız sertifikatlı surətləri əlavə olunur. Sənədlərin əsli müsahibə zamanı təqdim olunur.

- Ərizə aşağıdakı formalardan biri və ya digəri ilə başlaya bilər: "Mən elan etdiyiniz firmada sistem administratoru vəzifəsinə müraciət etmək istərdim", yaxud "Mən mühasibat meneceri vəzifəsinə namizəd kimi müraciət etmək istəyirəm".
- Ərizəçi yekun paraqrafa aşağıdakı cümlələrdən biri əlavə edilə bilər: "Bunu mənim ixtisasım və təcrübəmin sizin diqqətinizə layiq olacağına inanaraq yazıram".
- Əmək haqqı yaxşı karyera imkanları üçün ikinci dərəcəli hesab edilir.
- Müsahibə üçün sizinlə görüşmək fürsətini səbirsizliklə gözləyirəm.

Sənəd ona rəsmi xarakter və hüquqi qüvvə verilməsi məqsədilə rəsmiləşdirilir. Rəsmiləşdirmə sənədin imzalanması, təsdiq edilməsi və ona möhür vurulması vasitəsilə həyata keçirilir. Bir qayda olaraq, sənədin bütün nüsxələri imzalanır. İmzanın tərkibinə sənədi imzalamış şəxsin adı, soyadı, onun şəxsi imzası daxildir. Əgər sənəd blankda tərtib edilmişdirsə, sənədi imzalamış şəxsin vəzifəsi qısa şəkildə göstərilir. Məsələn:

Sədr: "        " Əli Məmmədov

Əgər sənəd blankda tərtib edilməmişdirsə, sənədi imzalamış şəxsin vəzifəsi tam şəkildə göstərilir (7). Məsələn:

**İşgüzar yazışmalarda texnoloji təhkiyə və internetin rolu**

Təşkilat daxilində internet bağlantısı internet kimi tanınır. Burada bir sistemə istinad edilir. İnternet sistemi vasitəsilə yaxşı idarə olunan və strukturlaşdırılmış məlumatlar təşkilat daxilində seçilmiş şəxslərə ötürülür. İnternetin internetə çıxışı var, lakin internetin internetə çıxışı yoxdur. İnternet məhdud və ya şəxsi əlçatanlığa malikdir.

İnternet, bizneslə əlaqəli məlumatları yaymaq üçün təşkilatda istifadə olunan daxili veb saytdır. Son illərdə bir çox biznes təşkilatlar işçilərlə ünsiyyəti yaxşılaşdırmaq üçün müxtəlif yollar və vasitələr üçün axtarış aparır. İnternetin tətbiqi və istifadəsi internet materialların daha səmərəli paylanması və bununla da əlavə xərclərin azaldılması üçün praktik həlldir.

**E-poçt istifadəsi**

İnternet texnologiyalarının inkişafı şirkətlərin müştəriləri və qarşı tərəfləri − biznes tərəfdaşları, təchizatçıları, topdansatış müştəriləri ilə işi xeyli asanlaşdırdı.

İndi hər bir şirkətin elektron poçt qutusu var və demək olar ki, dərhal kommersiya təklifləri göndərməyə, tərəfdaşlara və yuxarı orqanlara hesabat verməyə, ərizə və müqavilələrə imkan verir (8).

Elektron poçt və ya e-poçt, istifadəçilərin göndərdiyi və qəbul etdiyi elektron yazışma sistemidə kompüter və telekommunikasiya əlaqələri şəbəkəsi üzərindən mesaj göndərilməsi vasitəsidir. Buraya həmçinin qeydlər, salamlar və ya geniş mətn faylları, üstəgəl qrafika və foto şəkillər, video kliplər və ya səs "d" buraya daxildir.

Beləliklə, e-poçt "elektron keçmiş ofis"dir. Bu, insanların deaktiv vəziyyətində belə ünsiyyət qurmağa imkan verir. Bu o deməkdir ki, siz istənilən vaxt və ya istədiyiniz zaman e-poçt mesajı göndərə bilərsiniz. Mesajı göndərdiyiniz şəxs istədiyi zaman oxuya bilər. Beləliklə, göndərən və alıcı ünsiyyət qurmaq üçün eyni vaxtda bir-birlərinə qoşulmaq məcburiyyətində deyillər (9).

Kommunikasiya tədbirlərinin planlaşdırılması, strategiyası, həyata keçirilməsi və nəzarəti kommunikasiya vasitələrinin bir-birinə bağlanması ilə əlaqədardır: vebsayt, broşüralar, poster və biznes uğuru üçün digər qeyri-maddi aktivlər də bu qəbildəndir (10).

XXI əsrin əvvəllərində güclü bir təhsil resursu, e-medium kimi qarşılandı və yazılı prosesə təşviq edildi. Onlayn söhbətlərdə fəal iştirak etmək üçün, adətən üzbəüz müzakirələrdə danışmaqdan imtina edən tələbələr bura daha aktiv olmağa başladılar.

Başqa bir səbəb, internetin yazıçıların əsərlərini real və daha geniş şəkildə təqdim etmələri üçün bir arena təmin etmiş oldu. Şagirdlər real dünyada oxucular üçün öz işləri Web saytlara yerləşdirmək və yazı yazmaq üçün motivasiya olunur. Elektron vasitənin birgə yazı fəaliyyətini artırdığı aşkar edilmişdir. Onlayn proqramların ayrı-ayrı tələbələr tərəfindən görülən yazıların kəmiyyət və keyfiyyətinə edib-etməməsi ilə bağlı ziddiyətli fikirlər mövcuddur.

**Yazılı kommunikasiya**

Kommunikasiya tədbirlərinin planlaşdırılması, strategiyası, həyata keçirilməsi və nəzarəti kommunikasiya vasitələrinin bir-birinə bağlanması ilə əlaqədardır: vebsayt, broşüralar, poster və biznes uğuru üçün digər qeyri-maddi aktivlər də bu qəbildəndir (11).

Yazılı ünsiyyətin sistematik şəkildə təqdim edilməsi ünsiyyətin vacib aspektlərindən biridir. İndeksləmə ilə birlikdə sənədləşdirmə, insanın zəif saxlama qabiliyyətinə görə zəruridir. Yazılı mesajların saxlanmasında məqsəd lazımi məlumatları asanlıqla və heç bir çətinlik olmadan təqdim etməkdir. Bununla belə, aşağıdakı mesajların yazılmasının əsas məqsədini budur:

1. Gələcək istinadlar: Yazılı mesajlar qeydlər və istinad mənbələri kimi saxlanıla bilər. Müxtəlif kommunikasiya vasitələri gələcəkdə istinad üçün təqdim edilə bilər. Beləliklə, qeydlərin aparılması biznesin davamlı fəaliyyəti üçün vacibdir.
2. Səhvlərdən qaçınmaq: Mesajların ötürülməsində əvvəlki qeydlər səhvləri azaltmağa kömək edir və səhvlər və həmçinin saxtakarlığın baş verməsinin qarşısını alır.
3. Hüquqi tələblər: Yazılı ünsiyyət hüquqi sənəd kimi qəbul edilir. Yəni bəzi rəhbər şəxslər bəzi mesajların şifahi şəkildən sonra yazılı şəkildə təqdim olunmasını tələb edir və təsdiq edirlər.
4. Geniş çıxış: Kommunikasiya vasitələri çox sürətli, yazılı ünsiyyətə çevrilir. Kommunikator və qəbuledici bir-birindən uzaqdırsa, yazıya üstünlük verilir.
5. Poçt və ya e-poçt vasitəsilə göndərilən rabitə ən ucuzdur və yeganə arasında əlaqə vasitələri kimi mövcud ola bilər.
6. Effektiv qərar qəbulu: Köhnə sənədlər effektiv qərarların qəbul edilməsinə böyük mənada kömək edir.

Köhnə qeydlər mövcud olduqda qərar vermə prosesi asanlaşır. Çünki mesajlar qərar qəbul etmək üçün lazımi məlumatları təqdim etməyə kömək edir.

XXI əsrin əvvəllərində güclü bir təhsil resursu, e-medium kimi qarşılandı və yazılı prosesə təşviq edildi. Onlayn söhbətlərdə fəal iştirak etmək üçün, adətən, üzbəüz müzakirələrdə danışmaqdan imtina edən tələbələr bura daha aktiv olmağa başladılar.

Başqa bir səbəb, internetin yazıçıların əsərlərini real və daha geniş şəkildə təqdim etmələri üçün bir arena təmin etmiş oldu. Şagirdlər real dünyada oxucular üçün öz işlərini Veb saytlara yerləşdirmək və yazı yazmaq üçün motivasiya olunur. Elektron vasitənin birgə yazı fəaliyyətini artırdığı aşkar edilmişdir. Onlayn proqramların ayrı-ayrı tələbələr tərəfindən görülən yazıların kəmiyyət və keyfiyyətinə edib-etməməsi ilə bağlı ziddiyətli fikirlər mövcuddur. Çünki e-medium qorxu faktorunu azaldır və cəlbedici xüsusiyyətlər təklif edir, tələbələrin hədəf dili yazmağa və tətbiq etməyə münasibətini artırır, onları həvəsləndirir, bu isə daha çox mətn yaradılmasına səbəb olur.

Sonda qeyd etməliyik ki, məktublarımız bizim işgüzar mövqeyimizi əks etdirir. İşgüzar yazışmalarda yaxşı ton saxlamaq rahat korporativ mühit yaratmağa kömək edir və universitet daxilində ünsiyyətimizi xoş və məhsuldar edir (12).

## Nəticə

Çağdaş dövrümüzdə kommunikativ münasibətlərin qurulmasında işgüzar yazışmaların rolu danılmazdır. Bu, sənəd, məktub, ərizə və s. növləri olmaqla yanaşı eyni zamanda iki və daha artıq şəxsin işgüzar yazışması da ola bilər. Müasir internet əsrində təbi ki, bunun üçün baza rolunu internet resursları təşlkil edir. Eyni zamanda işgüzar yönümlü bir çox sənədlərin sürətli göndərilməsi üçün mail sisteminin də rolu danılmazdır. Belə ki, məhz internet vasitəsi ilə şirkətlərarası münasibətlərin qurulması, işgüzar yazışmalar bir çox internet vasitələrinin köməyi ilə həyata keçirilir. Lakin bununla yanaşı mətn quruculuğu, dialoqlar yaxud, məktub və digər qarşılıqlı sənədlərin hazılammasında kommunikativ biliyə sahiblənmək vacib şərtlərdəndir. XX əsrin ortalarından etibarən formalaşan kompüter texnologiyasının qloballaşan dünyada həm də fərdlərarası ünsiyyət vasitəsinə çevrilməsi işgüzar yazışmalarında təməl prinsiplərindən birinə çevrilmişdir.

ELMİ İŞ Beynəlxalq elmi jurnal. İmpakt Faktor: 1.790. 2022 / Cild: 16 Sayı: 10 / 26-31 ISSN:2663-4619
SCIENTIFIC WORK International scientific journal. Impact Factor: 1.790. 2022 / Volume: 16 Issue: 10 / 26-31 e-ISSN: 2708-986X

## Ədəbiyyat

1. Səlimova, N. (2017). İşgüzar yazışmalar (Metodik vəsait). Bakı Biznes Universitetinin 10.05.2017-ci il tarixli 73 saylı əmri ilə təsdiq edilmişdir. Bakı.
2. https://www.apollonhochschulverlag.de/wpcontent/uploads/2019/09/Methodenbuch_Raudszus-Stieler_Leseprobe.pdf
3. https://unec.edu.az/application/uploads/2015/07/ISGUZAR-YAZISMALAR-I-KOLOKVIUM-2003.pdf
4. Odabash, H. (2001). "Correspondence in terms of iinstitutional communication and the state of correspondence in our country", Information case symposium proceedings in the 21st century, <19-20 April 2001, in Hatay> (158-172). Ankara: Turkish Library Association.
5. https://www.coursehero.com/file/117762347/1026pdf
6. Digital platform corporate. Effects on performance. prof. dr. Beril Akinci Vural. 21. Proceedings of the symposium on the information phenomenon of proceedings of the information case symposium at the turn of the century, in <19-20 April 2001, Hatay> (158-172). Ankara: Turkish Library Association.
7. https://www.kolayaof.com/ornek_ozet/%C4%B0LT203U.pdf9
8. https://www.hse.ru/our/news/440630882.html
9. https://www.susu.ru/ru/news/2020/06/25/setevoy-etiket-kak-vesti-delovuyu-perepisku
10. Vikram Bisen and Priya. “Business communication”. Publishers published by new age international (P) Ltd., Publishers Publishıng for one world new age international (p) limited, publishers 4835/24, Ansari Road, Daryaganj, New Delhi – 110002. Visit us at www.newagepublishers.com
11. https://www.duma.tomsk.ru/content/shablonnye_frazy_dlja_delovoj_perepiski
12. https://www.expocentr.ru/ru/articles-of-exhibitions/17023

**Rəyçi: fil.e.d. Fərəh Cəlil**

Göndərildi: 02.07.2022 Qəbul edildi: 10.09.2022

DOI: https://doi.org/10.36719/2663-4619/83/32-38

**Zərəfşan Babakərim qızı Azayeva**
Bakı Slavyan Universiteti
azayevazarafshan@gmail.com
**Turac Cəlaləddin qızı Əhmədova**
Bakı Slavyan Universiteti
ahmadova.t10@mail.ru
**Teyyubə Məzahim qızı Abışova**
Bakı Slavyan Universiteti
teyyibeabisova@gmail.com
**Leyla Elxan qızı Bayramova**
Bakı Slavyan Universiteti
ataiwiyevaleyla94@gmail.com

# DİDAKTİK OYUNLARIN TƏLİMDƏ ROLU VƏ ƏHƏMİYYƏTİ

**Xülasə**

Təlimə yeni başlayan uşaqlar üçün oyun xüsusi əhəmiyyəti ilə seçilir. Onların təlimə cəlb edilməsi o qədər də asan məsələ deyil. İbtidai siniflərdə riyaziyyat təlimi zamanı şagirdlərin tez yorulması, dərsə marağının azalması halları tez-tez müşahidə olunur. Buna görə də riyaziyyat dərslərinin tədrisi zamanı uşaqların dərsə etinasız halda yanaşması halları müşahidə edilir. Bu cür halların qarşısını almaqda ən yaxşı üsul elə onların zəif nöqtəsi olan oyundan istifadə etməkdir. Belə ki, təlimə oyun elementləri − yarış, əyləncə daxil etməklə dərsi onların marağı istiqamətində formalaşdırmaq olar.

***Açar sözlər:*** *didaktik oyun, fəza təsəvvürləri, məktəbəqədər təhsil, ölçü, oyun, uşaq*

**Zarafshan Babakarim Azayeva**
**Turaj Jalaladdin Ahmadova**
**Teyyuba Mazahim Abishova**
**Leyla Elkhan Bayramova**

## The role and significance of didactic games in education

**Abstract**

For children who have just started training, the game is distinguished by its special importance. It is not so easy to involve them in training. During mathematics training in primary classes, it is often observed that students get tired quickly and lose interest in the lesson. Therefore, cases of children's neglectful approach to the lesson are observed during the teaching of mathematics lessons. The best way to avoid such situations is to use the game that is their weak point. Thus, by including game elements − competition, entertainment the lesson can be shaped according to their interest.

***Keywords:*** *didactic game, spatial concepts, preschool education, size, game, child*

## Giriş

Ümumtəhsil məktəbləri qarşısında duran müxtəlif vəzifələr var. Bunlardan vacib və əsas olanlardan biri hərtərəfli inkişaf etmiş, müstəqil olaraq bilik əldə etməyi, tətqiqat və axtarış xarakterli məsələləri həll etməyi bacaran məntiqi təfəkkürlü gənclər hazırlamaqdan ibarətdir.

Biliyini təkmilləşdirməyə və axtarışlar edib öz üzərində işləyən insanların şəxsiyyətinin formalaşmasında hələ ibtidai siniflərdə hərtərəfli şəkildə qurulan təlim-tərbiyə məsələləri mühüm rol oynayır.

Bilirik ki, hələ bağça dövründən başlayaraq uşaqların fəaliyyətində oyunlar, əsasən də hərəki oyunlar çox mühim rol oynayır. Elə buna görədir ki, bu zaman uşaqlar ətraf mühitlə, ətrafdakı insanlarla, yaxınları ilə fəal praktik münasibətdə olur. Fəal, hərəkətli oyunlar uşağın həm fiziki, həm də əqli inkişafında, onun ətraf mühit haqqında olan təsəvvürlərinin formalaşmasında mühüm rol oynayır. Aparılan araşdırmalar və

təcrübələr göstərir ki, iki yaşında olan uşaqlar belə sadə hərəkətləri, nəyi isə dağıtmağı, kimlə isə oynamağı, qaçmağı, tullanmağı həvəslə yerinə yetirir. Məşhur bir psixoloq olan S.L.Rubinşteyn demişdir: "Məhz ilk dəfə oyun prosesi zamanı uşaqda ətraf aləmə təsir etmək tələbi yaranır və formalaşır".

Oyun – uşağın bacardıqları əhatəsində tələblərini ödəyən vasitədir ki, bu da fəaliyyət növü kimi meydana çıxır. Oyun – uşağın inkişafının ilk mərhələsini təşkil etməklə bərabər, həm də onun ilk fəaliyyət növü hesab olunur.

Qədim Yunan alimi Platon deyirdi ki, uşaq oyun ilə böyüməlidir. On yeddinci əsrin əvvvələrində Jan Jak Russo oyunun uşaq həyatında olan mühüm rolu haqqında maraqlı fikirlər demişdir. Filosof uşaq dünyasının özünəməxsus xüsusiyyətlərini, hərəkət və davranışlarını, o cümlədən də təhsil prosesi zamanı oyunun əhəmiyyətini xüsusi olaraq vurğulayır, oyun vasitəsilə edilən terapiyanın səmərəsindən bəhs edir.

Məşhur alman psixoloqu F.Frebel oyunun həm də psixoloji tərəflərini tədqiq etmişdir. Onun fikrincə, "uşaqlığın ən yuksək inkişafı oyundur, belə ki, oyun uşağın ruhunda, daxilində nələrin baş verdiyinin ifadəsidir. Uşaqların oyunu onlar üçün sadəcə bir hərəkət demək deyildir, o, uşaq üçün bir neçə mənaları ilə əhatələnib".

F.Frebelin didaktik oyunların sistem şəklinə salınıb təlimə daxil edilməsində böyük rolu olmuşdur. Demək olar ki, o, bu işin banisi hesab olunur. Psixoloq hərəki oyunlar, tikinti və əmək vərdişləri yaradan oyunlar sistemi hazırlamışdır. Uzun müddət onun hazırladığı bu sistemdən məktəb təlimində istifadə olunmuşdur. Ancaq bir mənfi xüsusiyyəri var idi ki, bu oyunlarda din və mistika ruhu özünə yer tapmışdı. Bu isə müəyyən mənada uşağın dünyagörüşünün məhdud saxlanmasına gətirib çıxarırdı (Həmidov, 1989:38).

Bağça yaşındakı uşaqların fəaliyyətinin əsas hissəsini oyunlar təşkil edir. Onlar üçün oyun ən əsas sevinc mənbəyidir. Uşaqlar üçün oyunun bu qədər əhəmiyyətini nəzərə alaraq bundan həm də ibtidai siniflərdə təhsil müddətində də istifadə etmək olar. Ancaq bir şeyi də yaddan çıxarmaq olmaz ki, birinci sinfə gələn uşaq hələ təzəcə oyundan ayrılıb məktəbə gəlib. Ona görə də uşaqları oyundan tədricən uzaqlaşdırmaq lazımdır. Həmçinin uşaqların oyunlarından onların riyazi təsəvvürlərinin verilməsində vacib olan pedaqoji və metodik qaydaları da nəzərə alaraq istifadə etmək lazımdır. Məşhur fizioloq İ.P.Pavlovun apardığı tədqiqatların nəticələrini də nəzərə alıb bu nəticələrdən düzgün istifadə etmək lazımdır. İ.P.Pavlov demişdir ki, uşaq bir şəraitdən digər şəraitə keçdikdə, həmçinin əgər bu keçid arasındakı fərq çox kəskin olarsa, bu zaman uşağın sinir sistemi çox böyük çətinliklə qarşılaşmış olur. Deməli, uşaqlarda bağça yaşı ilə ibtidai sinif arasında olan keçid mərhələsindəki qarşılıqlı əlaqə və bağlılığı nəzərə almaq və tətbiq etmək çox vacibdir.

"Uşağın təlim fəaliyyəti – onun başqa fəaliyyət növlərindən onunla fərqlənir ki, artıq təlim fəaliyyəti prosesində uşaq yeni şeylərlə tanış olur, elmi anlayışları mənimsəyir, bunun da nəticəsində artıq uşaq yeni qabiliyyət və praktik vərdişlər qazanır. Bu deyilənləri nəzərə alaraq bu nəticəyə gəlmək olar ki, uşağın təlim fəaliyyəti elə bir fəaliyyətdir ki, uşağın özündə dəyişikliklər yaradır, onun inkişafına səbəb olur. Bu inkişaf isə əlbəttə ki, təlim fəaliyyətinin məhsuludur".

Antik yunan filosoflarından olan Əflatun və Ərəstunun əsərlərində də oyunun təlim-tərbiyə vasitəsi kimi verilməsinin şahidi oluruq. Həmin dövrdə də didaktik oyunlar savad təlimi dövründə tətbiq olunmuş, ancaq bu iş sistemsiz xarakter daşımışdır. Sonralar didaktik oyunlar üzərində aparılan tədqiqat və axtarışların nəticəsində didaktik oyunların təlimə daxil edilməsi qərara alınmışdır. Bu işdə isə görkəmli pedaqoqlardan Yan Amos Komenskinin, Con Lokkun və Jan Jak Russonun böyük xidmətləri olmuşdur (Əliyev, 2008:23).

Sovet dövrünün psixoloqları oyunları insan fəaliyyətinin xüsusi növü kimi şərh edir. Didaktik oyunlar isə kiçikyaşlı məktəb şagirdləri üçün fənləri öyrənməkdə təlimin məqsədinə müvafiq olaraq seçilən oyunlardır.

Didaktik oyunların uşaqlar üçün əhəmiyyəti çox böyükdür. Uşaqların zehni, emosional, fiziki, psixi qabiliyyətlərinin inkişafında olan əhəmiyyəti böyükdür. Didaktik oyunlar uşaqların hissi qabiliyyətlərini inkişaf etdirir. Kəmiyyətin forması, ölçüləri, rəngi, quruluşu və s. buna daxildir. Oyunlar uşaqların müşahidə etmək bacarığını, ünsiyyət qurmaq qabiliyyətini, nitqin inkişafını, nitq qüsurlarının aradan qaldırılması işində, uşaqların riyazi qabiliyyətlərinin inkişaf etdirilməsi işində, məntiqi düşünmə qabiliyyətinin inkişaf etdirilməsində mühüm rol oynayır. Oyunlar uşaqların tərbiyəsində də əsaslı rol oynayır: məqsədyönlülük, özünəinam, dözümlülük, müstəqil olaraq öz qərarlarının özü verməsi, kollektivçilik, ədalətlilik, qaydalara tabe olmaq kimi əxlaqi keyfiyyətlərinin formalaşması və inkişafında əhəmiyyətli dərəcədə təsirə malikdir (Pichugin, 1987:175).

Didaktik oyunlar aparılması forma və üsuluna görə iki növə ayrılır:

1. Xüsusi didaktik materiallar əsasında tətbiq olunan didaktik oyunlar: tapmacalar, sayma və hesablamaya aid çalışmalar və s.
2. Metodiki olaraq şagirdlərin oyun fəaliyyətinin fərqləndirici xüsusiyyətləri göstərilən kimi müəyyən edilmişdir:

a) Oyun fəaliyyətinin əsaslandırılması;
b) Oyunların keçirilməsi zəruriliyi;
c) Baş verən situasiyanın təsəvvürdə canlandırılması və hərəkətlərin fikirdə ifadə olunması;
d) Sadalanan bu xüsusiyyətlər vahid bir prosesin reallaşdırılması üçün vacib olan tərkib hissələrdir.

**Böyük yaş və hazırlıq qruplarında elementar fəza təsəvvürlərinin formalaşdırılması zamanı istifadə olunan didaktik oyunlar**

Uşaqlar hələ ibtidai sinfə gəlməmişdən əvvəl məktəbəqədər bağçalarda olurlar. Məşhur rus pedaqoqu A.S.Makarenko da oyunun şagirdlərin həyatında olan əhəmiyyətini bilərək oyunu təlim əməyinə bərabər hesab edirdi. O deyirdi: “Yaşlı adamın həyatında iş, fəaliyyət hansı əhəmiyyətə malikdirsə, uşağın da həyatında oyun bir o qədər vacib və əhəmiyyətlidir”. Xüsusilə məktəbəqədər dövrdə oyun uşağı daha çox cəlb edir, onun üçün əvəzolunmaz bir məşğuliyyət növünə çevrilir. Oyun zamanı uşaqlar öz fikirlərini daha yaxşı ifadə edirlər. Məktəbəqədər müəssisələrdə didaktik oyunlar tərtib edərkən müxtəlif növ tapmacalardan, nağıllardan, məsəllərdən, məntiqi çalışmalardan istifadə edilir. Bu zaman elə formanı seçmək lazımdır ki, həm məktəbəqədər müəssisələrdə, həm də ibtidai siniflərdə şagirdlər üçün maraqlı olsun, onların dərketmə qabiliyyətinin inkişafına təkan versin. Bağça yaşlı uşaqların yaş xüsusiyyətlərinə görədir ki, onlarda ilkin riyazi təsəvvürlərinin inkişafında didaktik oyunların xüsusilə qeyd etmək lazımdır. Məktəbəqədər müəssisələrdə ilkin riyazi təsəvvürlərin formalaşması zamanı yalnız riyazi elementlər, toplama, çıxma vərdişləri bəzi həndəsi fiqurlar, kəmiyyətlər haqqında olan təsəvvürlərlə bitmir. Belə ki, uşaqlarda riyazi təsəvvürlərin formalaşdırılması vaxtı məsələ və misallarla yanaşı məntiqi təfəkkürlərinin də inkişafı vacib məsələdir. Oyun prosesi zamanı uşağın əqli fəallığı yüksək olur. Düşündürücü xarakterə malik olan bu oyunlar həm də onların əqli fəallığının da inkişafına səbəb olur. Oyun öz emosional xarakterinə görədir ki, uşaqları az yorur, onların fəallığı təmin edilir. Didaktik, əyləncəli oyunlar uşaqların təfəkkür tərzinin inkişafına səbəb olur və bu ilkin olaraq onlarda riyaziyyata olan marağın yaranması üçün ilk addım olur (Oruclu, Nəcəfova, 2017:34).

Bu cür oyunlar keçirilərkən hətta uşaqların özünə də imkan vermək lazımdır ki, onlar bir-birlərinin səhvlərini aşkar edə bilsinlər, səhvləri özləri başa salsınlar. Bu cür riyazi dərslər uşaqların diqqətini formalaşdırmağa kömək edir. Bağça yaşlı uşaqlarda sayma vərdişləri, müqayisə edə bilmək vərdişləri formalaşdırılır. Belə ki, şagirdlər əşyaları sayır, onlar arasında müqayisə aparır, hansının az, hansının çox olduğunu ayırd edir. Bunun üçün tərbiyəçi müxtəlif didaktik oyunlardan istifadə edə bilər. Bunlardan bəziləri ilə tanış olaq:

**Hansı çoxdur?**

Tərbiyəçi yaşıl və qırmızı rəngdə olan müxtəlif fiqurları göstərir və uşaqlara tapşırır ki, fərqli rəngdə olan, amma eyni fiqurları müqayisə edin. Uşaqlar əvvəlcə fərqli rəngdə, amma eyni fiqurların sayını tapır, daha sonra isə onları müqayisə edirlər, hansının daha çox, hansının az olduğunu tapırlar. Tərbiyəçi soruşa bilər: Az olan fiquru çox olan fiqurla bərabərləşdirmək üçün daha neçə fiqurdan istifadə edilməlidir? Daha çox tapan şagirdlərin adları çəkilir. Bağça yaşlı uşaqlarda 10 dairəsində sayma vərdişlərini möhkəmləndirmək üçün müxtəlif maraqlı tapşırıqlardan istifadə etmək olar. Məsələn: Kartoçkadakı kvadratların sayı qədər otaqda olan oyuncaqları göstər. Uşaqlar əvvəlcə kvadratların sayını tapır və ona uyğun olaraq oyuncaqları sayaraq seçir. Uşaqlara 10 dairəsində sayma vərdişlərini möhkəmləndirmək üçün iki əşya qrupu düzəltməyə aid çalışmalar verilir: sayı 4 olan maşınlar qrupu və sayı 6 olan gəlinciklər qrupu düzəldin, sayı 8 olan toplar qrupu və sayı 5 olan dominolar qrupu ayırın və s.

**Səsin sayını tap**

Burda tərbiyəçi-müəllim müxtəlif əşyaların səsindən istifadə etməklə oyunu qura bilər. O, əşyaları − musiqi alətinin səsi, stulun səsi, qələmin səsi, hətta öz əlini, barmağını stola vurmaqla, əlini bir-birinə vurmaqla uşaqlardan bunların neçə dəfə təkrarlandığını soruşur. Sonda ən çox səsin sayını tapan 3 şagird müvafiq olaraq 1, 2 və 3-cü yerlərin qalibi olur.

**Addımla-marş**

Tərbiyəçi-müəllim uşaqları 2 qrupa bölür. Müəllim bir qrupa tapşırıq verir: İki addım irəli, beş addım sola irəliləyin. Digər qrup isə bu qrupun hərəkətlərini müşahidə edir, kimin tapşırığı səhv, yoxsa düz icra

etməsi müşahidə olunur və onların adı çəkilir. Tapşırığı düzgün icra edənlər, həmçinin digər qrupdan bunu düzgün müşahidə edənlərin adı çəkilir və onlar yaxşı sözlərlə qiymətləndirilir.

Bağça dövründə uşaqlara müstəvi üzərində istiqaməti müəyyənləşdirməyə aid də tapşırıqlar verilir. Uşaqlara müxtəlif obyektlərin yerləşmə yeri ilə bağlı müxtəlif məlumatlar verilir. Sonra uşaqlar özləri obyektləri yerləşmə yerinə uyğun olaraq çalışmalar həll edə, didaktik oyunlar keçirə bilərlər. Uşaqlara bağçadan müəyyən məsafədə yerləşən obyektlərin yerləri haqqında – "Bağçadan evə necə getməli?", "Bağçadan idman zalına necə getməli?" kimi çalışmalar vermək olar. Uşaqlar həmçinin bir yerdən başqa obyektin yanına gedərkən yolda olan digər obyektləri yadda saxlamağın faydasını da dərk edirlər. Belə ki, bu, onlara yolu daha rahat yadda saxlamaqda köməkçi olur. Uşaqlar verilən nümunəyə uyğun olaraq kağız üzərində həndəsi fiqurların düzülməsini icra edirlər. Bu zaman "Kim yadda saxlayar", "Kim necə düzmüşdü" və s. kimi oyunlar keçirilir.

**Kimdə belə forma var?**

Bu oyunu keçirməkdə məqsəd uşaqlarda həndəsi formalar haqqında olan bilikləri daha da möhkəmləndirməkdir.

**Məzmunu:** Tərbiyəçi rəngli kartları uşaqlara paylayır, həmin fiqurların hərəsindən birini özü də götürür, onu stolun üzərinə qoyur və soruşur: − "Uşaqlar, bu fiqur dairəsi. Kimdə belə bir forma var?". Bundan sonra uşaqlar da öz fiqurları arasından ona uyğun gələni tapıb həmin dairənin yanına qoyurlar. Sonra tərbiyəçi başqa bir kart qoyur, uşaqlar ona uyğun planında tapırlar. Oyun bu məzmunda davam edir. Uşaqlar bu oyun zamanı oval, dairə, düzbucaqlı, üçbucaq, kvadrat və s. fiqurları bir-birindən fərqləndirə bilirlər.

**Ədəd fikirləş**

Bu oyunu keçirməkdə məqsəd uşaqlarda şifahi hesablamaq vərdişlərini inkişaf etdirmək, onlarda diqqəti, düşünmə qabiliyyətini inkişaf etdirməkdir.

**Məzmunu:** Nağıl qəhrəmanı olan Cırtdan gəlir, uşaqlarla bir qədər danışdıqdan sonra belə bir oyun keçirir. Bir uşaq seçdikdən sonra uşaqlara deyir:

− Uşaqlar, hansısa bir ədəd fikirləşin, mən həmin ədədi tapa bilərəm, indi gəlin yoxlayaq. İndi fikirləşdiyini həmin ədədi üzərinə 6 gəlin, ondan 2 çıxın, sonra fikirləşdiyin həmin ədədi çıxın və üzərinə 1-i əlavə edin. Deyin görək, nəticədə 5 aldınızmı? Sonra yenə başqa uşaq seçilərək oyun bu qaydada davam edir. Bu cür hesablama vasitəsilə onlarda şifahi hesablama vərdişləri formalaşır. Uşaqlar əvvəlcə səssiz, daha sonra isə bunu ucadan təkrar edirlər.

**Cütdür yoxsa tək?**

Bu oyunu təşkil etməkdə məqsəd bağça yaşlı uşaqlarda cüt və tək anlayışlarını möhkəmləndirməkdir.

**Məzmunu:** Tərbiyəçi uşaqlara deyir ki, 1-dən 20-dək ədədləri saysınlar. Onlar bu zaman tək ədədləri yavaşca, cüt ədədləri isə bir qədər yüksək səslə deyirlər.

Tərbiyəçi uşaqlara üzərində 1-dən 20-ə qədər ədədlər təsvir edildiyi dairələr olan kartlar paylayır, sonra isə ədəd-kartları qarışıq şəkildə stolun üstünə düzür. Sonra isə deyir: hansınızın kartında tək və ya cüt dairə varsa, həmin ədədi deməli və stolun üstündə ona uyğun olan kartı tapıb bir yerə qoyun.

Bunun nəticəsində artıq uşaqlar əvvəlcə tək, sonra isə cüt ədədləri sıra ilə düzmüş olurlar. Tərbiyəçi uşaqlara dairəvi şəkildə düzülməyi tapşırır. Bir əlinə qara, digərinə isə ağ rəngli bayraq götürərək deyir: mən əgər qara bayrağı qaldırsam, siz cüt sayla, ağ bayrağı qaldırsam isə tək sayla dairələr düzəldin. Uşaqlar qara bayrağı qaldıran kimi cüt sayla, ağı qaldıranda isə tək sayla dairə düzəldirlər, tərbiyəçi bayrağı aşağı salanda isə yenə də dairədə fırlanırlar. Fəal olan şagirdlər qalib sayılır, səhv edənlər isə riyazi tapmaca, saymaca söyləməklə cəzalandırılırlar.

**Hissələrdən tamı düzəlt**

Bu oyunu keçirməkdə məqsəd uşaqlarda tam ilə hissə münasibətləri müəyyənləşdirə bilmək və bacarığını möhkəmləndirməkdir.

Uşaqların hər birinə qutu verilir, bu qutunun içərisində 2 və 4 bərabər hissəyə bölünmüş həndəsi fiqurlar vardır. Həmin fiqurların modelləri isə kənara qoyulur. Tərbiyəçinin tapşırığı ilə uşaqlardan biri həmin kənardakı fiqurları göstərərək onların hansı fiqur olduğunu deyir. Sonra tərbiyəçi uşaqlara tapşırır ki, müxtəlif hissələrdən bütöv fiqurları düzəltsinlər. Uşaqlar isə hər fiqurun formasına, rənginə görə onları növlərə bölür və bu hissələrdən bütöv fiquru düzəldirlər.

**Tez yoxsa gec?**

Tərbiyəçi uşaqlara müraciət edir:

− Uşaqlar, atası Elmara bir məktub yazıb, indi siz Elmara atasının nə vaxt gəlməyini tapmaqda kömək etməlisiniz, görək ona kim kömək edə biləcək? Elmarın atası oğluna məktub yazır ki, oğlum, hər gün bir damanın üzərindən xətt çəkərsən, axırıncı damaya çatanda mən də gələcəyəm yanına. Atasının bu təklifi Elmarın xoşuna gəldi, bundan sonra o, hər gün bir damanın üstündən xətt çəkməyə başladı. Bir gün Elmar atası üçün çox darıxmışdı, o dözə bilmir və üstündən xətt çəkilməmiş damaların da üstündən xətt çəkir.

Dayısı bunu görüb soruşur: − Elmar, sən niyə belə elədin?

Elmar deyir: − “İstəyirdim ki, atam tez geri qayıtsın”.

Sonra tərbiyəçi uşaqlardan soruşur: − Uşaqlar, bəs indi sizin fikriniz necədi? Deyin görək Elmarın atası tez, yoxsa gec gələcək? Uşaqlar Elmarın atasının hələ 5 gün sonra gələcəyini deyirlər, çünki Elmar əvvəlcə 5 damanın üstündən xətt çəkmişdi. Hər dama isə bir günü bildirir. Bu oyunu keçirməklə uşaqlar dərk edirlər ki, vaxtı tələsdirmək olmaz.

**I və II siniflərdə riyaziyyat dərslərinin keçilməsində didaktik oyunların tətbiq edilməsi xüsusiyyətləri**

İbtidai sinifin demək olar ki, əsas təməl mərhələsi olan I və II siniflərdə riyaziyyat təliminin tətbiqində əldə olunacaq ən əsas məqsəd aşağıdakılardan ibarətdir: şagirdlərdə 20 dairəsində avtomatlaşdırılmış, şüurlu şəkildə toplama və çıxma vərdişləri, cədvəl əsasında vurma və bölmə vərdişləri formalaşdırmaq. Şagirdlərdə şüurluluq vərdişləri cədvəl əsaında toplama və çıxma, o cümlədən vurma və bölmə əməllərinin mənimsədilməsindən əvvəl uşaqların həmin cədvəlləri müstəqil olaraq tərtib edə bilmək bacarığı ilə formalaşdırılır.

Avtomatlaşdırılma və möhkəmləndirmə tez-tez tətbiq olunan çalışmalar həll etməklə əldə edilir. Ancaq bir vacib xüsusiyyət də vardır ki, hər dəfə eyni tipli çalışmalar həll etmək şagirdləri yorur və onlar üçün maraqsız olur. Məhz buna görə də, bu məqamda oyun tipli çalışmalardan, yəni didaktik oyunlardan istifadə etmək lazımdır. Müəllimlərin riyaziyyatın tədrisi zamanı ən çox istifadə etdiyi “Meşə”, “Misal göstər”, “Dinməcə”, “Dairəvi misallar”, “Riyazi estafet” kimi didaktik riyazi oyunlar əsasında “Sehirli kvadrat” adlı oyunun tətbiqi çox əhəmiyyətli hesab olunur.

İbtidai siniflərdə riyaziyyat dərslərinin tətbiqi zamanı istifadə edilən bəzi didaktik oyunların seçilib tətbiq olunduğu didaktik oyun nümunələrinin metodikası ilə tanış olaq:

“Müxtəlif əlamətlərə görə əşyaların müqayisəsi” bölməsinin öyrədilməsi zamanı şagirdlər “böyük-kiçik”, “hündür-alçaq”, “qalın-nazik” və s. kimi anlayışların mənasını başa düşmək, onları bir-birindən ayıra bilmək üçün “*Naxış tərtib edirik”, “Ev tikirik”, “Ağac əkirik”* kimi didaktik oyunlar tətbiq olunur. Bu bölmənin öyrədilməsi zamanı şagirdlərin riyazi nitqlərinin formalaşması və inkişafına köməkçi olan *“Əksinə”, “Sonluq”, “Tamamlama”* kimi didaktik oyun növləri təşkil edilir. Həmin oyunlardan biri ilə – “Sonluq” oyunun əsas məğzi ilə tanış olaq.

Müəllim şagirdlərə deyir:

− Uşaqlar, gəlin “*Sonluq”* oyununu keçirək. Cümlələri ilk əvvəl mən sizə söyləyəcəm, lakin bu cümlələrin bəzi hissələri tam deyil, yarımçıq olacaq. Siz isə fikirləşməli, cümlənin əsas mənasına uyğun olaraq cümlənin sonluğu düzgün qoyulmalıdır. Cümlənin sonluğunu sıra ilə mənim tapşırığıma əsasən tamamlayacaqsınız. İndi isə diqqətlə qulaq asın və düşünün:

“Yaxşı kəşfiyyatçı”, “Örtülmüş rəqəmi tapın” kimi didaktik oyunların keçirilməsi zamanı uşaqlar özləri ilə verimiş hansısa əşya arasındakı fərqi, münasibəti aşkar edirlər. “Əşyalar qrupunun müqayisəsi” adlı bölmənin daxil edilməsi ilə uşaqlar 10 dairəsindəki ədədlərin nömrələnməsi, toplama və çıxma əməllərinin öyrənilməsinə kömək məqsədilə müxtəlif növ məsələlər daxil edilmişdir. Bu bölmədə “böyük”, “kiçik”, “bərabərdir” kimi riyazi ifadələr uyğun olaraq bərpa olunur, müxtəlif bərabərlik və bərabərsizlik kimi formalar qurulur.

Birinci sinifdə tətbiq edilən riyaziyyat kursunun hər bölməsinə uyğun gələn oyun növləri ilə tanış olaq. Birinci sinfin riyaziyyat kursu bu bölmələr üzrə qurulmuşdur:

1) Hazırlıq mərhələsi;
2) 1-dən 10-a qədər ədədlər;
3) On dairəsində toplama və çıxma;
4) 20 dairəsində ədədlərin nömrələnməsi;
5) Əyləncəli və düşündürücü məsələlər.

**III və IV siniflərdə riyaziyyat dərslərinin keçilməsində didaktik oyunların tətbiq edilməsi xüsusiyyətləri**

Riyaziyyat elmi ciddi bir elmdir və bu amil sinifdən-sinfə keçdikcə daha çox nəzərə çarpır. Belə ki, əgər riyazi oyunlar aşağı siniflərdə bir əyləncə vasitəsi olmaqla didaktik funksiya yerinə yetirirsə, artıq yuxarı sinfə keçdikcə uşaqlar riyaziyyata əyləncə kimi baxmaqdan daha çox, onda yığcamlıq, qanunauyğunluq, konkretlik və s. kimi ciddilik axtarırlar. Məhz buna görədir ki, riyaziyyat dərslərinin oyunla icrasına maraq yuxarı siniflərdə aşağı siniflərə nisbətən azalır. Lakin buna baxmayaraq şagirdlərdə riyazi qanunların pozulması nəticəsində bəzi əyləncələrə, fokuslara, tapmacalara həvəs olur. III və IV siniflərdə riyaziyyatın tədrisi zamanı müxtəlif didaktik oyun növlərindən istifadə olunması öz aktuallığı ilə seçilir. Bu siniflərdə didaktik oyun növləri xüsusilə, hesablama vərdişlərinin formalaşdırılması, həndəsi formaların tapılması və qurulması ilə bağlı olur. III və IV siniflərdə aşağı siniflərdən fərqli olaraq oyunlar zamanı şagirdlərin nisbətən daha ciddi olması, riyazi əməllərin həlli ardıcıllığına daha çox meyilli olduqlarının şahidi oluruq (Musayev, 2008:32).

III və IV sinif şagirdləri üçün didaktik oyunlardan − fokus, əyləncəli kvadrat, bir sıra məntiqi məsələlər və s. nəzərdə tutulmuşdur. Həmin didaktik oyunlardan bəzilərini nəzərdən keçirək:

Bilirik ki, ibtidai siniflər müxtəlif tədbirlərdə, riyaziyyat gecələrində müxtəlif riyazi məzmunda olan hekayələr, şeir-məsələlərdən istifadə edir. Bu cür şeirlər fənlər arasında əlaqə yaratmaqla bərabər, həm də uşaqların da marağına səbəb olur, onlarda yüksək əhval ruhiyyə yaradır. Şagirdlər bu cür şeirlərə maraqla qulaq asır və misralar arasında hansısa riyazi əməl tapmağa çalışırlar. Həmin şeirlərdən bəziləri ilə tanış olaq:

“DAİRƏVİ MİSALLAR” oyunu. Bu oyun bütün əməllərin iştirak etdiyi misallarda əməllər sırası ilə bağlı bir didaktik oyundur. Vəsaitdə 4 dəst verilib, hər dəst isə 6 misaldan ibarətdir. Şagirdlərin hərəsi bir dəstə götürür və stolun üzərinə düzür. Bu misalllar elə düzülməlidir ki, misallardan birinin cavabı sonrakının ilk komponenti olsun (Qəhrəmanova, Əsgərova, 2014:120). Axırıncı əldə edilmiş cavab birinci misalın ilk komponenti olduqda oyun sona çatır. Həmin misalların bir dəstinə baxaq:

38-5; 40+18; 33+15; 58-20; 48-8; 50+8.

Düzgün düzülmə: 50+8; 58-20; 38-5; 33+15; 48-8; 40+18.

“RAKETLƏR AYA” oyunu. Oyunda məqsəd yüz dairəsində olan ədədlərin toplanması və çıxılmasına dair şagirdlərin biliklərini möhkəmləndirməkdir.

**Məzmunu:** Sinifdəki şagirdlər iki komandaya bölünür − “Raket” və “Ay” komandası.

Start “1” düyməsinin basılması ilə oyun başlanır. Ekranda ulduzlar hərəkət edir, biz kosmosdayıq. Ekranda pilləkən əmələ gələndə ekranda olan sol küncdəki piləkənin aşağısında yazılmış məsələni cavablandıracaq iştirakçının şərti işarəsi çəkilir (Qəhrəmanova, Əsgərova, 2015:142). Məsələnin cavabını tapan şagird cavab düyməsini basır və onun cavabı kompüterdə yoxlandıqdan sonra verilmiş cavab səhvdirsə kompüter səslə siqnal verir və ekranda “Səhv” yazısı görünür. Əksinə, düzgün olduğu halda isə “Düzdür” yazısı görünür. Həmin iştirakçının şərti işarəsi pilləkənə uyğun olaraq bir pillə yuxarı qalxır. Oyun davam edir və davam etməsi isə oyunçuların riyazi qabiliyyətindən asılı olaraq dəyişir. “Raket” “Ay”a çatanda mahnı səslənir. Oyun bitir (Quluzadə, Əliyeva, 2000:23).

“ANİ TOPLAMA“ oyunu. Bu oyunun məğzi belədir: İki nəfər ədədin aşağısında həmin ədədlə rəqəmləri sayı eyni olan yeni ədəd yazır. İkinci bir şagirdin vəzifəsi isə yazılan ədədin rəqəmlərini doqquza tamamlayan rəqəmlərdən təşkil olunmuş ədəd yazmaqdır. Bu qayda əsasında “n” sayda ədədlər cütü yazılarsa, o zaman bütün 2n+1 sayda ədədlərin cəmini “ani” tapmaq mümkündür. Bu məqsədlə ədəddən n çıxıb onu həmin ədədin qarşısına yazmaq lazımdır. Fərz edək ki, bizə 3786 ədədi verilib. Birinci şagird onun aşağısında 4231 ədədini yazır. İkinci şagird onun aşağısında 4231-in rəqəmlərini 9-a tamamlayan 5768 ədədini yazır. Sonra birinci şagird 3046 ədədini yazır. Bu zaman ikinci şagird 3046 ədədinin rəqəmlərini 9-a tamamlayan 6953 ədədini yazır. Bunun iki dəfə təkrarlandığını bilərək 3786-2=3784 tapdıqdan sonra bu ədədin qarşısına 2-ni yazır və alınan cəmi “ani” tapır. 23784 cvabını ikinci şagird ani olaraq yazır, beləliklə, qalib sayılır (ARTİ, 2009:147).

“SEHİRLİ SANDIQ” oyunu. Bu oyunu keçirməkdə məqsəd şagirdlərdə 3-ə bölünmə əlamətlərini inkişaf etdirməkdir. Müəllim əyani vəsait kimi sandıqdan istifadə edir. Lakin bu sandıq kilidlidir. Kilid o halda açıla bilər ki, bütün 3-ə bölünən ikirəqəmli ədədlər tapılmış olsun. Beləliklə, müəllim uşaqları 4 qrupa bölür. Qayda isə belədir ki, həmin rəqəmlərin hamısını tapmaqla yanaşı, həm də ən tez tapmış olan qrup qalib hesab olunacaq (Ermolaeva, 2009:245).

"DOVŞANCIĞAZIN SUALLARI" oyunu. Bu oyunu keçirməkdə məqsəd üçbucağın növlərini tanıya bilmək, onu başqa fiqurlardan fərqləndirə bilmək kimi bacarıqların formalaşdırılmasıdır (Həmidov, 1984:252).

*Məzmunu:* Şəkil görünür və o, müxtəlif üçbucaqlara bölünür. Bu zaman dovşan suallar verir. Bu üçbucaqlardan hansı bərabəryanlı, hansı bərabərtərəfli, hansılar isə müxtəliftərəflidir (Məhərrəmova, 2018:192).

Şagirdlər verilmiş sualları cavablandırırlar. Düz dedikdə gün şəkli çıxır, səhv olduqda isə dovşan qulaqlarını tərpədərək doğru olan cavabı deyir. Belə oyunlar şagirdlərin diqqətini cəlb edir. Kompüter oyunları şagirdlərin inkişaf səviyyəsinə uyğun olduqda, mövzular ilə üst-üstə düşdükdə səmərəli hesab olunur. Həmçinin bu cür oyunlar 10-12 dəqiqədən çox vaxt aparmamalıdır (Məhərrəmova, 2013:55). Şagirdlər üçün riyaziyyat dərslərinin qurulmasında nağıl xarakterli, nağıl məzmunlu məsələlərdən də istifadə edilir. İbtidai siniflərdə şagirdlər oyunlara, tapmacalara, nağıllara maraq göstərirlər. Riyaziyyatın nağıl məzmunlu hadisələrdə təsvir edilməsi həm şagirdləri həyati hadisələr, qaydalar, müəyyən davranış normaları ilə məlumatlandırır, həm də riyaziyyatın həyatla əlaqələndirilməsini göstərir. Poetik obrazlar, lirik qəhrəmanlar, abstrakt təfəkkür və s. amillərdir ki, məhz nağıllardan riyaziyyat təlimində istifadə xüsusiyyətlərini əks etdirir. Riyazi məsələlərdə nağıllarda təsvir edilmiş obrazlar canlandırılır, riyazi məzmunu ilə seçilən bir üslub yaranır.

## Nəticə

Təlimə yeni başlayan uşaqlar üçün oyun xüsusi əhəmiyyəti ilə seçilir. Dərslərdə oyun elementlərindən istifadə etmək təlimin daha maraqlı olmasına, şagirdlərdə yüksək emosional iş əhvali-ruhiyyəsinin yaranmasına səbəb olur, şagirdlərdə daha çox işləməyə həvəs yaradır. Əsas məqsəd şagirdləri əqli əməyə öyrəşdirməkdir. Bu işdə isə didaktik oyunlar, əyləncəli məsələ və misalların əhəmiyyəti böyük olduğundan müəllimlər də bunlardan istifadə etməklə təlimi elə formada təşkil edə bilərlər. Riyaziyyat dərslərinə oyun elementlərinin daxil edilməsi dərslərə rəngarənglik gətirir, həmçinin, şagirdlərin idrak fəaliyyətinin inkişafına yardımçı olur.

## Ədəbiyyat

1. Həmidov, S.S (1989). Uşaqlarda elementar riyazi təsəvvürlərin formalaşdırılması metodikası. Bakı, 225 s.
2. Əliyev, İ.B. (2008). İbtidai siniflərin riyaziyyat kursunda didaktik oyunlar, əyləncəli və məntiqi çalışmalar təlimin səmərəsi və keyfiyyətinin yüksəldilməsi vasitəsi kimi. Naxçıvan, 210 s.
3. Pichugin, L.F. (1987). Riyaziyyatın tədrisində şagirdlərin tərbiyəsi. Moskva, 175 s.
4. Oruclu, B., Nəcəfova, L. (2017). III sinif üçün. Yarpaq testi. Bakı: Çinar yayımları, 150 s.
5. Musayev, Ə.H. (2008). İbtidai siniflərdə riyaziyyatdan didaktik oyunlar və əyləncəli çalışmalar şagirdlərin təlim fəallığının artırılması vasitəsi kimi. Bakı, 245 s.
6. Qəhrəmanova, N., Əsgərova, C. (2014). II sinif üçün dərslik. Bakı, 120 s.
7. Qəhrəmanova, N., Əsgərova, C. (2015). IV sinif üçün dərslik. Bakı, 190 s.
8. Quluzadə, F., Əliyeva, L. (2000). Didaktik oyunlar. Bakı: Ünsiyyət, 190 s.
9. Uşaqlar üçün qaydalı oyunlar. (2009). Metodik vəsait. ARTİ. Bakı: Çaşıoğlu, 147 s.
10. Ermolaeva, A.A. (2009). İbtidai məktəbdə sinifdə modelləşdirmə. Moskva: 245 s.
11. Həmidov, S.S. (1984). IV siniflərdə Riyaziyyatın tədrisi metodikası. Bakı, 252 s.
12. Məhərrəmova, N. (2018). Məntiq və riyazi çalışmalar. I sinif üçün vəsait. Bakı, 192 s.
13. Məhərrəmova, N.A. (2013). Məktəbəqədər pedaqogika. Bakı, 55 s.

**Rəyçi: riy.ü.f.d. Ramazan Eyyubov**

Göndərildi: 30.07.2022 Qəbul edildi: 26.09.2022

DOI: https://doi.org/10.36719/2663-4619/83/39-43

**Dürdanə Vaqif qızı Əliyeva**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
Cəlilabad filialı
durdane.eliyeva.00@mail.ru

# AZƏRBAYCAN XALQ CÜMHURİYYƏTİ DÖVRÜNDƏ XALQ TƏHSİLİ

**Xülasə**

Məqalədə Azərbaycan Xalq Cümhuriyyətinin yarandıqdan sonra xalq təhsilinin inkişafında atdığı addımlar tədqiq edilmişdir. Türk dilinin dövlət dili elan olunması, məktəblərdə tədris dilinin ana dilində aparılması məsələsi öz əksini tapmışdır. Eləcə də 1918-ci ildən təhsil sisteminin milliləşdirilməsi əsas hədəf olmuşdur. Müəllim çatışmazlığını aradan qaldırmaq üçün Azərbaycan Xalq Cümhuriyyəti tərəfindən görülmüş işlər araşdırılmışdır. Zaqafqaziya Müəllimlər Seminariyasının Azərbaycan şöbəsinin Qazaxa köçürülməsi ilə Qazax Müəllimlər Seminariyası, eləcə də Bakı və Gəncədə müəllimlər seminariyasının yaradılmış, qısamüddətli və birillik kursları açılmışdır. Bakı, Gəncə, Qazax, Nuxa, Şuşa, Quba, Zaqatala şəhərlərində iki aylıq pedaqoji kurslar, pedaqoji kursların praktiki məşğələ üçün şöbələri açılmışdır. Çətin şəraitə baxmayaraq, Bakı Dövlət Universiteti uzun səylər nəticəsində fəaliyyətə başlamış və bu günümüzə qədər kadr hazırlığı istiqamətində mühüm yer tutur.

***Açar sözlər:*** *xalq təhsili, ana dilində tədris, pedaqoji kadr hazırlığı, seminariya, qısamüddətli kurslar, axşam kursları*

**Durdana Vagif Aliyeva**

## Public education during the Republic of Azerbaijan

**Abstract**

The article examines the steps taken by the Azerbaijan Democratic Republic in the development of public education after its establishment. The issue of declaring the Turkish language as the state language and teaching the language in schools in the mother tongue has been reflected. Also, the nationalization of the education system has been the main goal since 1918. The work done by the Azerbaijan Democratic Republic to eliminate the shortage of teachers was investigated. With the relocation of the Azerbaijani branch of the Transcaucasian Teachers' Seminary to Kazakhstan, the Kazakh Teachers' Seminary, as well as teacher's seminars in Baku and Ganja, were opened, and short-term and one-year courses were opened. In the cities of Baku, Ganja, Gazakh, Nukha, Shusha, Guba, and Zagatala, two-month pedagogical courses and branches of pedagogical courses for practical training were opened. Despite the difficult conditions, Baku State University started to operate as a result of long efforts and occupies an important place in the field of personnel training to this day.

***Keywords:*** *public education, mother tongue teaching, pedagogical staff training, seminary, short-term courses, evening courses*

## Giriş

Azərbaycan xalqı tarixi haqsızlığa görə uzun müddət müstəqilliyini və dövlətçiliyini itirməyə məcbur olmuş, mili təhsil sistemini və mənəvi tərbiyə formalarını yaratmaq imkanlarından məhrum edilmişdir. Yalnız Azərbaycan Xalq Cümhuriyyəti yarandıqdan sonra xalqımız milli və ictimai tərəqqidə elmin, təhsilin rolunu qiymətləndirmək imkanı qazandı.

1918-ci il may ayının 28-də Azərbaycan Xalq Cümhuriyyəti yaradıldı. Bu, Azərbaycan dövlətçiliyinin bərpası demək idi. Azərbaycan Cümhuriyyətinin yaradılması tariximizdə XIX əsrin sonu, XX əsrin əvvəllərində cəmiyyətin mütərəqqi hissəsinin ağlasığmayan səylərinin nəticəsi idi. Heydər Əliyevin sözləri ilə desək: “Müsəlman Şərqində ilk demokratik cümhuriyyətin məhz Azərbaycan torpağında yaranması xalqımızın o dövrdə və o illər ərəfəsində − XIX əsrin sonu, XX əsrin əvvəllərində milli müstəqillik, azadlıq duyğuları ilə yaşaması ilə bağlıdır. O illərdə xalqımızın qabaqcıl şəxsiyyətləri, mütəfəkkir adamları, ziyalıları xalqımızda milli azadlıq, milli müstəqillik duyğularını gücləndirmiş, milli

dirçəliş, milli oyanış əhvali-ruhiyyəsini yaymış və bunların hamısı məntiqi olaraq Azərbaycan Demokratik Cümhuriyyətinin yaranmasına gətirib çıxarmışdır".

Azərbaycan Xalq Cümhuriyyəti yarandığı ilk gündən özünün fəaliyyətində xalq maarifinin, elm və mədəniyyətin inkişafına müstəsna əhəmiyyət verirdi. Bu sahəni müstəqil, demokratik, dünyəvi dövlət quruculuğunun təməl prinsiplərindən hesab edirdilər. Bu səbəbdən də qısa zaman çərçivəsində dağıdılmış məktəblər şəbəkəsinin bərpa edilməsi, məktəblərin yeni şəraitə uyğunlaşdırılması, təhsil müəssisələrinin milliləşdirilməsi, yeni məktəblərin açılması, milli pedaqoji kadr hazırlığı istiqamətində mühüm addımlar atılmışdır (Seyidov, 2001:49).

Azərbaycan Xalq Cümhuriyyətinin maarif sahəsindəki islahatlarına daxil idi:

1. Təlim ana dilində aparılır, Azərbaycan dili rəsmi dövlət dili elan edilir və ana dilində dərsliklərin nəşr olunması vacib sayılır;
2. Ümumi ibtidai təhsil layihəsi hazırlanır və kəndlərdə, şəhərlərdə yeni məktəblər açılır;
3. Darülmüəllimin şəbəkəsi genişlənir. Milli məktəblər üçün müəllim hazırlanması vəzifəsini həyata keçirmək üçün Qori Müəllimlər Seminariyasının Azərbaycan şöbəsi Qazaxa köçürülür. Firidun bəy Köçərlinin böyük səyi nəticəsində 1918-ci ilin noyabrında seminariya öz qapılarını gələcəyin gənc müəllimlərinin üzünə açır;
4. Türkiyədən çoxlu müəllimlər dəvət olunur;
5. Qızlar məktəbləri açılır;
6. Məktəb yaşından böyük olan vətəndaşlar üçün gecə kursları fəaliyyətə başlayır. Qadınlar üçün isə fərdi gündüz kursları təşkil edilir;
7. Azərbaycan gəncliyinin elm və texnika əsrinə hazır olması üçün Bakı Universiteti açılır;
8. Yüzə yaxın gənc Azərbaycan universitetlərinə göndərilir və bir o qədər gəncin də İstanbulda təhsil alması qərara alınır (Talıbov, Sadıqov, Quliyev, 2000:371).

1918-ci il avqustun 2-də Xalq Maarif naziri hökumətə baxılması və təsdiqi üçün nazirlik haqqında Əsasnaməni təqdim etdi. Əsasnaməyə görə Xalq Maarif Nazirliyi nazirdən, nazirin müavinindən və şuradan ibarət idi. Şuraya nazir, nazir müavini, şöbə müdirləri, dəftərxana direktoru və iclaslarda hər dəfə nazirin sərəncamı ilə dəvət olunan təhsil-maarif işinin müxtəlif sahələri üzrə mütəxəssislər və elm nümayəndələri daxil idilər. AXC dövründə maarif nazirləri aşağıdakı kimi olmuşdur:

1. Nəsib bəy Yusifbəyli – 28.05.1918-17.03.1919;
2. Həmid ağa Şahtaxtinski – 16.04.1919-16.05.1919 (cəmi 30 gün);
3. Cəmo bəy Hacınski – 16.05.1919-11.06.1919 (cəmi 26 gün);
4. Nurməmməd Şahsuvarov – 11.06.1919-22.06.1919 (cəmi 11 gün);
5. Rəşid bəy Kaplanov – 22.06.1919-22.12.1919;
6. Həmid ağa Şahtaxtinski – 24.12.1919-05.03.1920;
7. Nurməmməd Şahsuvarov – 05.03.1920 - 30.03.1920 (Əhmədov, 2014: 332).

Azərbaycan Cümhuriyyətinin ilk olaraq ən mühüm addımı – türk dilinin dövlət dili elan edilməsi haqqında 27 iyun 1918-ci il tarixli qərarı oldu. Lakin qeyd eməliyik ki, bütün məhkəmə, inzibati və digər vəzifələri bu dildə savadı olan şəxslərin tutacağı vaxta qədər dövlət müəssisələrində rus dilinin işlənməsinə icazə verilirdi. Müstəqillik elan olunduqdan sonra kargüzarlıq faktiki olaraq rus dilində aparılırdı. Bu, çarizmin dövründə elmi, texniki, hərbi və digər sahələrdə milli kadrların hazırlanmamasının nəticəsi idi. Çarizmin məqsədi ruslaşdırma siyasəti həyata keçirmək idi. Bu səbəbdən də mütərəqqi ictimaiyyət xalq maarifinin inkişafına xərcləri əsirgəməməyi, kifayət qədər aşağı və yuxarı ibtidai məktəblər, orta təhsil müəssisələri, universitet, pedaqoji institut, texniki məktəblər, axşam kursları açmağı tələb edirdi (Seyidov, 2002:126).

1918-ci ildə Azərbaycan müstəqil dövlətini qurarkən təsərrüfat, maarif, mədəniyyət, məktəb sahəsində hansı tədbirləri həyata keçirmək üçün araşdırmalar apararkən məlum olmuşdur ki, çar hökuməti hər sahədə elə ağır miras qoyub ki, bunları aradan qaldırmaq üçün çox böyük işlər görmək lazımdır. Ən ağır vəziyyət isə müəllim hazırlığı sahəsində idi.

Azərbaycan Cümhuriyyəti hökuməti fəaliyyətinə başlayarkən tədris dili türkcə olan bir orta təhsil müəssisəsi belə Azərbaycanda yox idi. Qeyd edək ki, orta təhsil müəssisələri şəbəkəsinə gimnaziyalar, müəllimlər seminariyaları, realnı məktəblər, politexnik məktəblər, habelə xüsusi orta təhsil müəssisələri daxil idi.

1918-ci avqust ayının 28-də dərc olunmuş hökumətin Milliləşdirmə haqqında qərarında orta təhsil müəssisələrində tədris türk dilində aparılması təsbit olunurdu.

Azərbaycan Xalq Cümhuriyyəti hökumətinin ümumi təhsil müəssisələrinin milliləşdirilməsi sahəsində apardığı siyasət və həyata keçirdiyi tədbirlər nəticəsində 1919-cu ilin məlumatlarına görə, Bakı politexnik və kommersiya məktəbləri, iki kişi və üç qız gimnaziyası istisna olunmaqla, bütün orta məktəblər milliləşdirilmişdi (Mərdənov, Quliyev, 2003:235).

Araşdırma nəticəsində aydın olur ki, 1919/1920-ci dərs ilinin əvvəllərində Azərbaycanda 643 ibtidai və 23 orta məktəb fəaliyyət göstərirdi ki, ibtidai məktəblərdə 48070, orta məktəblərdə isə 9611 şagird təhsil alırdı (Mərdənov, 2011:33).

Qeyd edək ki, türk dilində tədrisin inkişafı məsələsində çətinliklərdən biri də ixtisaslı müəllimlərin çatışmazlığı idi. Ona görə də 1918-ci ilin mayında Qazax şəhərinin azərbaycanlı əhalisi Zaqafqaziya Müəllimlər Seminariyasının Azərbaycan Şöbəsinin Qoridən Qazaxa köçürülməsi haqqında məsələ qaldırdı. Onlar tikili, bağ və bostan üçün 10 desyatin ölçüdə torpaq sahəsi ayırmağı, 3000 manat həcmində birdəfəlik müavinət verməyi və hər il 1000 manat maliyyə yardımı göstərməyi vəd edirdilər (Nəzərli, 2014:156). Qazaxda Müəllimlər Seminariyasının açılması təkcə Qazax üçün deyil, bütövlükdə Azərbaycan üçün əhəmiyyətli idi. Öz xalqının gələcəyini elmdə, təhsildə görən ziyalılar, maarif xadimləri yeni tələblərə cavab verən müəllim kadrlarının hazırlanması yolunda var qüvvələrini səfərbər etmişlər. Vaxtilə Yaxın Şərqdə şöhrət tapan Qazax Müəllimlər Seminariyasının yaradılması Azərbaycan maarifçilərinin və vətənpərvərliyinin bariz nümunəsi, Azərbaycan Xalq Cümhuriyyətinin təhsil sahəsində yeritdiyi düzgün və məqsədyönlü siyasətin parlaq təzahürüdür.

Qazax Müəllimlər Seminariyası 1918-ci ilin noyabrın 10-da açıldı. Bununla da bizim ölkəmizdə pedaqoji kadrlar yetişdirən ilk təhsil müəssisəsi fəaliyyətə başladı. Zaqafqaziya Müəllimlər Seminariyasının Azərbaycan Şöbəsinə rəhbərlik etmiş, görkəmli pedaqoq Firidun bəy Köçərli seminariyanın direktoru oldu.

1918-ci ilin sentyabrında Bakı Qadın Müəllimlər Seminariyası ali ibtidai məktəbləri və yaxud da qadın gimnaziyalarının dörd sinfini bitirmiş şagirdlərin birinci sinfə imtahansız qəbulu haqqında elan verdi. Seminariyada tədris kursu dördillik idi və o, orta təhsil müəssisələrinə bərabər tutulurdu. 1919-cu il yanvarın 1-də Bakı Qadın Müəllimlər Seminariyası 1919-cu ilin yanvarın 1-də Kişi Seminariyasına çevrildi və aprelin 1-dən öz fəaliyyətinə başladı.

Gəncə Müəllimlər Seminariyası 1918/1919-cu ildə milliləşdirilmiş, Həsən bəy Bağırov onun direktoru təyin olunmuşdur.

Azərbaycan Xalq Cümhuriyyətində ümumi təhsilin tətbiqi istiqamətində Nuxa və Şuşa şəhərlərində 2 kişi, Baxı və Nuxa şəhərlərində 2 qadın seminariyasının açılması haqqında qanun layihəsi hazırlandı.

Bu qanun layihəsinin hazırlığı prosesində Nazirlər Şurası 2 fevral 1920-ci ildə Xalq Maarif nazirinə Bakıda bir qadın seminariyasının və Zaqatalada bir kişi seminariyasının açılmasına icazə verdi.

Qeyd etməliyik ki, bəhs edilən dövrdə pedaqoji kadrların kəskin çatışmazlığı qısamüddətli müəllim kurslarının təşkilini vacib hesab edirdi.

Milliləşdirmə siyasəti həyata keçirilərkən milli sinif və türk dili müəllimləri vəzifələrinə bəzən yetərincə pedaqoji kadr hazırlığı olmayan şəxslər cəlb edilirdi. Buna müvəqqəti olaraq icazə verilirdi. 1919-cu il oktyabrın 15-dən etibarən Bakı I Realnı məktəbinin binasında xüsusi pedaqoji təhsili olmayan milli siniflərin və türk dili fənninin müəllimləri üçün qısamüddətli axşam kursları açıldı. “Bu kurslarda əsas türk dilində tədrisin metodikası öyrənilirdi. Mühazirələri Abdulla bəy Əfəndiyev, doktor Qara bəy Qarabəyov, Mirzə Məcid Qəniyev, Məmmədağa Şahtaxtinski, Hüseyn Cavid, Abdulla Şaiq Talıbzadə, Kərim bəy İsmayılov, Riza Zəki və başqaları oxuyurdular. Azərbaycan tarixi üzrə mühazirələri professor Belyayev oxuyurdu” (Nəzərli, 2018:159).

Xalq Maarif Nazirliyi qısamüddətli pedaqoji kursların açılmasına xüsusi diqqət yetirirdi. 1918-ci ilin iyun ayında nazir Şahsuvarov Bakı şəhəri xalq məktəblərinin müfəttişi Mahmudbəyova məktubunda Bakıda müsəlmanlar üçün təxirə salınmadan iki aylıq pedaqoi kursların təşkilini ondan xahiş edirdi. Bununla əlaqəli əvvəlcədən türk dili, hesab və pedaqogika üzrə proqramlar hazırlanmalı idi. Kurslar həm qadın, həm də kişilərdən ibarət 100 dinləyici üçün nəzərdə tutulmuşdu.

Belə ki, Bakı qısamüddətli pedaqoji kurslarda 130 nəfər oxuyurdu ki, onlardan 98 nəfəri kişi, 32 nəfəri qadın idi.

Nazirin 30 avqust 1919-cu il tarixli sərəncamı ilə Bakıda türk dili üzrə yaşlı əhali üçün pulsuz axşam kursları təşkil edilmişdi. Bu kurslar üç şöbədən ibarət idi. Deməli, birinci şöbə nə türk dilini, nə də yazmağı bilməyənlər, amma öyrənməyi arzulayanlar üçün idi. İkinci şöbə şifahi dilə bələd olub, lakin türkcə yazıb-oxumağı, türk tarixini və ədəbiyyatını öyrənənlər üçün nəzərdə tutulurdu. Üçüncü şöbə isə türk dili üzrə öz biliklərini dərinləşdirməyə çalışan şəxslər, xüsusilə də türk dilini, ədəbiyyatını, tarixini və elmi terminologiyasını zənginləndirmək arzusunda olan müəllimlər üçün idi. Kurslarda təhsil müddəti hər biri 3 ay olmaqla 2 semestrdə cəmləşmişdi.

9 avqust 1919-cu ildən praktiki məşğələlər üçün pedaqoi kursların 2 şöbəsi açıldı. Kursda iştirak edənlər öncə təcrübəli müəllimlərin nümunəvi dərslərində iştirak edir, sonra isə özlərinin sınaq dərslərinin təqdimi olurdu.

1919-cu ilin iyunun 1-dən etibarən Bakı, Gəncə, Qazax, Nuxa, Şuşa, Quba, Zaqatala şəhərlərində iki aylıq pedaqoji kurslar açılmışdı. Bəzi məntəqələrdə sözügedən kursların 2 şöbəsi (kişi və qadın) fəaliyyət göstərirdi. Bu kursların məqsədi ibtidai məktəblər üçün müəllim kadrları hazırlamaq idi. Qeyd edək ki, açılmış kurslar sırasında Bakı, Gəncə və Nuxada kişi və qadın, Şuşa, Qazax, Qusar, Salyan və Zaqatalada isə yalnız kişi kursları var idi.

Bakı III Kişi Gimnaziyasının binasında Ümumtəhsil kursları Cəmiyyəti tərəfindən 1919/1920-ci dərs ilində hər iki cinsdən olan yaşlı əhali üçün axşam gimnaziyasının demək olar ki, bütün siniflərində məşğələlər açılmışdı.

1918-ci ilin sentyabrın 9-dan etibarən, Gəncə Müəllimlər Seminariyasının yanında türk dilində dərs keçməyi bacaran müəllim kadrlarının hazırlanması üçün aylıq kurslar açılmışdı. 1919-cu ilin 11 noyabrından Gəncə Ali İbtidai Məktəbinin binasında türk dili üzrə axşam kursları məşğələlərə başladı (Bəşirov, 2008:68).

Qısamüddətli pedaqoi kursların yaradılması məqsədi müəllimlərin ümumi və ixtisas üzrə biliklərini artırmağa, habelə pedaqoji kadrların çatışmazlığına son qoymaq idi.

1919-cu ilin 15 sentyabrından etibarən qısamüddətli pedaqoji kurslarla yanaşı, birillik pedaqoji kurslar da fəaliyyətə başladı. Belə kurslara hazırlığı olmayan xalq müəllimləri də qəbul edilirdi.

Qısamüddətli və birillik pedaqoi kurslar ibtidai məktəb müəllimlərinə olan qıtlığı aradan qaldıra bilmirdi. Müəllim seminariyalarında da müəllimlərin buraxılışı yaxın zamana gözlənilmirdi. Ona görə də Gəncə, Bakı və Nuxa şəhərlərində kişilər üçün, Bakı, Nuxa və Gəncə şəhərlərində isə qadınlar üçün ikiillik müəllim kurslarının açılması barədə qanun layihəsi təqdim olunmuşdu.

Bu qeyd edilənlərlə yanaşı, Azərbaycan Xalq Cümhuriyyəti hökuməti Türkiyədən müxtəlif fənlər üzrə dərs deyən müəllimləri dəvət edirdi (Azərbaycan Xalq Cümhuriyyəti, 2018:467).

Bu tədbirlərin içərisində Bakı Dövlət Universitetinin yaradılması da xüsusi yer tutur. Azərbaycan Xalq Cümhuriyyətinin parlamenti tərəfindən Bakı Dövlət Universiteti 1919-cu il sentyabr ayının 1-də təsis edilmişdir (Əmrəhov, İsmayılov, 2019:68).

Azərbaycan elm və maarifinin ilk milli məbədini yaratmaq yolunda böyük maneələr olmasına baxmayaraq, milli hökumətimiz və ziyalılarımız heç bir çətinlikdən qorxmadan bu işi uğurla başa çatdırdılar. Üç aylıq gərgin müzakirələrdən sonra 1919-cu ilin sentyabrın 1-də Azərbaycan parlamenti ictimai fikir tariximizdə, elmin, maarifin inkişafında əvəzedilməz xidmətlər göstərəcək ilk universitetin açılması haqqında qanun qəbul etdi. Bu qərarın qəbul edilməsində Azərbaycanın qabaqcıl maarifpərvər ziyalılarının, xüsusən də Məhəmməd Əmin Rəsulzadə kimi vətənpərvər insanların adını xüsusi qeyd etmək lazımdır (İsgəndərov, 2019:63).

"“Bakı şəhərində dövlət universitetinin təsis edilməsi haqqında” adlanan bu qanunda universitetin dörd fakültədən ibarət olması göstərilirdi: Şərq şöbəsi ilə birlikdə Tarix-filologiya, Fizika-riyaziyyat, Hüquq və Tibb fakültələri. Qanunun onuncu maddəsində deyilirdi ki, Bakı şəhərində Dövlət Universiteti 1919-cu il sentyabrın 1-dən açılmış hesab olunur. İctimaiyyətin narahatlığını nəzərə alaraq, qanunun II maddəsinin 2-ci bəndində qeyd edilirdi ki, bütün fakültələrdə türk dili məcburi fəndir” (Məhərrəmov, 2014:21).

## Nəticə

Aparılmış tədqiqat əsasında belə nəticəyə gəlirik ki, 1918-ci ilin may ayının 28-də XX əsr tarixinin ən böyük siyasi və tarixi hadisəsi olan Azərbaycan Xalq Cümhuriyyəti yaradıldı və bu xalqımızın həyatının bütün sahələrinə, həmçinin xalq maarifinə əhəmiyyətli şəkildə təsir göstərdi.

Azərbaycanda mürəkkəb siyasi və iqtisadi vəziyyətə baxmayaraq, ibtidai və orta təhsil müəssisələri şəbəkəsi genişlənir, milli pedaqoji kadrların hazırlığına başlanılır, müəllimlərin maddi vəziyyətinə xüsusi diqqət yetirilirdi.

Azərbaycan Xalq Cümhuriyyətinin ən mühüm addımlarından biri 1919-cu ildə Bakı Dövlət Universitetinin yaradılması oldu. 1922-ci ildə ilk buraxılışı olmuş Bakı Dövlət Universitetinin 30 məzununa diplomlar təqdim olunmuş, onlara fəxri həkim adı verilmişdi.

Məktəb islahatları həyata keçirilərkən 1918-1920-ci illərdə Azəbaycan Xalq Cümhuriyyətinin bu sahədə tarixi təcrübəsi nəzərə alına bilər.

Cəmi 23 ay yaşamasına baxmayaraq dövlətçiliyin bərpası, Azərbaycanın istiqlaliyyətinin, xalqımızın milli mənlik şüurunun dirçəldilməsi üçün misilsiz işlər görmüşdür. AXC ölkəmizin ərazi bütövlüyünün təmin edilməsi, Azərbaycanın suverenliyinin qorunması və möhkəmlənməsi, iqtisadiyyatın, mədəniyyətin, elmin, təhsilin sonrakı yüksəlişi üçün böyük xidmətlər göstərmişdir.

Göründüyü kimi, Azərbaycan Xalq Cümhuriyyəti hökumətinin maarif, təhsil sahəsində apardığı siyasətin əsasında ölkənin intellektual potensialının qüvvətləndirilməsi, eləcə də əhali arasında savadsızlığın ləğv edilməsi, təhsil sisteminin milliləşdirilməsi yolu ilə xalqın milli dirçəlişini, milli mənlik şüurunun oyanışının təmin edilməsi kimi ümummilli məqsədlər dururdu.

## Ədəbiyyat

1. Seyidov, F. (2001). Maarifimizin təkrarsız xəzinəsi. Bakı, 272 s.
2. Talıbov, Y., Sadıqov, F., Quliyev, S. (2000). Azərbaycanda məktəb və pedaqoji fikir tarixi. Bakı: Ünsiyyət, 516 s.
3. Əhmədov, H. (2014). Azərbaycan məktəb və pedaqoji fikir tarixi. Bakı: Elm və təhsil, 432 s.
4. Seyidov, F. (2002). Azərbaycan pedaqoji fikir tarixindən səhifələr. Bakı: Çaşıoğlu, 324 s.
5. Mərdənov, M., Quliyev, Ə. (2003). Azərbaycan təhsili Xalq Cümhuriyyəti illərində: 1918-1920. Bakı: Çaşıoğlu, 240 s.
6. Mərdənov, M. (2011). Azərbaycan təhsil tarixi. I cild. Bakı: Təhsil, 296 s.
7. Nəzərli, Ə. (2018). Azərbaycan Xalq Cümhuriyyətində xalq təhsili (1918-1920). Bakı: Xəzər Universiteti, 238 s.
8. Bəşirov, V. (2008). Azərbaycan pedaqoji fikrində milli tərəqqi ideyaları. Bakı: Oka-Ofset, 228 s.
9. Azərbaycan Xalq Cümhuriyyəti (1918-1920): təhsil siyasəti, sənədlər toplusu. (2018). Bakı: Elm və təhsil, 467 s.
10. Əmrəhov, Z., İsmayılov, S. (2019). Bakı Dövlət Universitetinin tarixi. Bakı: Elm və təhsil, 324 s.
11. İsgəndərov, A. (2019). Bakı Dövlət Universiteti – 100 ilin elm və təhsil məbədi. Bakı: Nurlar, 295 s.
12. Məhərrəmov, A. (2014). Bakı Dövlət Universiteti – 95. Bakı: Bakı Universiteti, 575 s.

**Rəyçi: ped.e.d. Rüfət Hüseynzadə**

Göndərildi: 23.07.2022 Qəbul edildi: 26.09.2022

DOI: https://doi.org/10.36719/2663-4619/83/44-49

**Ruzanə Nemət qızı Süleymanova**
Azərbaycan Dövlət Aqrar Universiteti
ruzanesuleymanova@gmail.com

# YUNUS ƏMRƏ ƏDƏBİ İRSİ İNGİLİS TƏDQİQATINDA

**Xülasə**

Məqalədə türk ədəbiyyatının böyük mütəsəvvüf şairi Yunus Əmrə ədəbi irsinin ingilis şərqşünaslığında tədqiqi və poetik incilərinin ingilis dilinə tərcüməsindən bəhs edilir. Burada, əsasən, şairin ədəbi irsininin tədqiqatçısı şotland əsilli Elyas Con Vilkinson Gibbin və Şərq aləminin dünyada tanınmasında böyük rolu olan Paul Smitin tədqiqatından bəhs edilir. Türk ədəbiyyatının, eləcə də Azərbaycan ədəbiyyatı klassik şairlərinin ədəbi irsinin Qərb dünyasında tanınmasında əvəzsiz rolu olan bu şərqşünasların Yunus Əmrə ilə bağlı fikir və düşüncələri məqalədə öz əksini tapır. Yunus Əmrə yaradıcılığına dərindən bələd olan Gibb və Paul Smit yeri gəldikcə şairin poeziyasından ingilis dilinə tərcümə etmişlər. Məqalədə həmçinin Yunus Əmrənin həyatı, yaşadığı dövr, ünsiyyətdə olduğu şairlər, təsirləndiyi şəxslər, dövrün mütəfəkkirləri haqqında da məlumat verilir. Xüsusilə, bu böyük şairin Mövlana Cəlaləddin Rumidən təsirlənməsi, dövrünün görkəmli şəxsiyyətləri ilə görüşləri barədə də danışılır. Məqalədə Yunus Əmrənin ingilis dilinə tərcümə edilmiş qəzəlləri orijinalla tutuşdurularaq oxşar və fərqli cəhətləri göstərilir və dəyərləndirilir.
***Açar sözlər:*** *ədəbiyyat, poeziya, şair, şərqşünas, səmavi eşq*

**Ruzana Nemat Suleymanova**

## Yunus Amre's literary heritage in English research

**Abstract**

The article discusses the study of the literary heritage of Yunus Emre, the great Sufi poet of Turkish literature, in English oriental studies and the translation of his poetic pearls into English. Here, the research of Scottish-born Elias John Wilkinson Gibb, a wonderful researcher of the poet's literary heritage, and Paul Smith, who played a great role in the recognition of the Eastern world in the world, are discussed here. The opinions and thoughts of these orientalists, who have an invaluable role in the recognition of the literary heritage of Turkish literature, as well as the literary heritage of the classical poets of Azerbaijani literature in the Western world, are reflected in the article. Gibb and Paul Smith, who are deeply familiar with Yunus Emre's works, have translated the poet's poetry into English. The article also provides information about Yunus Emre's life, the period he lived in, the poets he communicated with, the people he was influenced by, and the thinkers of the time. In particular, the influence of this great poet on Maulana Jalaladdin Rumi and his meetings with prominent personalities of his time are also discussed. In the article, Yunus Emre's ghazals translated into English are compared with the original, and their similarities and differences are shown and evaluated.
***Keywords:*** *literature, poetry, poet, orientalist, divine love*

## Giriş

Zaman-zaman türk xalqlarının olduqca zəngin olan ədəbiyyatı dünya şərqşünaslarının, istər Yaxın və Orta Şərq, istərsə də Avropa şərqşünaslarının nəzər-diqqətini cəlb etmişdir. Bu ədəbiyyat mütəmadi olaraq tədqiqat obyekti olmuş, klassiklərin əsərləri müxtəlif xalqların dillərinə tərcümə edilərək dünyaya yayılmışdır. Bu baximdan türk klassiklərinin ədəbi irsinin ingilisdilli ədəbiyyatşünaslıqda öyrənilməsi və tərcümə edilməsi böyük əhəmiyyət kəsb edir. “Xüsusən tərcümə ədəbiyyatı bu və ya digər xalqın adət-ənənəsi, mədəniyyəti, dünyagörüşü və ictimai-siyasi həyatı ilə yaxından təmas üçün böyük imkanlar açır” (Əliyeva, 1997:3).

Türk dünyasının böyük simalarından sayılan Yunus Əmrə XIII yüzilliyin ən qüdrətli şairlərindəndir. Onun zəngin ədəbi yaradıcılığı dünyanın bir çox şərqşünasları tərəfindən araşdırılmış, poetik inciləri qərb dillərinə tərcümə edilmişdir.

Böyük şair haqqında ilkin olaraq ingilis şərqşünaslığında tədqiqatçı-alim Çarz Riyonun kataloqlarında rast gəlinsə də, bunlar şair haqqında qısa məlumat xarakteri daşıyır. XIX yüzilliyin ilkin çağlarından ingilis şərqşünaslığında ədəbi irsi öyrənilən Yunus Əmrə ilə bağlı biz daha çox şotland əsilli şərqşünas Elyas Con Vilkonson Gibbin altı cildlik “Osmanlı poeziyasının tarixi” (Gibb, 1900:164-175) əsərinin birinci cildində rast gəlirik. Onu da qeyd edək ki, türk dilinin, türk ədəbiyyatının, eləcə də klassik Azərbaycan ədəbiyyatının görkəmli şairlərindən Qazı Bürhanəddin, İmadəddin Nəsimi və Məhəmməd Füzuli kimi dünya şöhrətli şairlərimizlə də bağlı Gibbin çox dəyərli tədqiqatları var. Elyas Con Vilkonson Gibb Yunus Əmrə dünyasına bələd olan araşdırmaçıdır. Şairin həyatı, yaradıcılığı, ədəbi irsi ilə bağlı geniş məlumat verən Gibb onun yaşadığı dövrü xarakterizə edərkən yazır: “Səlcuq imperiyasının təlatümlü çağlarında bəylərin öz kiçik dövlətlərini yaratmağa çalışdıqları bir vaxtda Anadoluda Yunus Əmrə adlı bir müqəddəs övliya yaşayırdı. Deyilənə görə, təhsil almayan, az miqdarda oxumağı bacaran bu şəxs Qərb Türklərin ilk doğma şairi kimi tanınmışdır” (Gibb, 1900:164). Şərqşünas eyni zamanda Taşköprizadənin “Şakaikun-Numaniyye” əsərində Yunus Əmrə ilə bağlı qısaca məlumat verdiyini qeyd etsə də, təzkirəsində dövrünün şairləri ilə bağlı olduqca maraqlı və qiymətli məlumat verən Aşıq Çələbini Yunus Əmrədən bəhs edən ilk təzkirəçi adlandırır. Gibb daha sonra “yüzillər boyu saysız türk şairləri arasında adı sonsuz ehtiramla çəkilən Yunus Əmrə” (Bəydili, 2004:4) haqqında bir çox soltanların hökmdarlıq dövrlərindən bəhs edən dindar və elm sahibləri olan Sadəddin və Əlinin tarixi əsərlərində məlumat verildiyini də vurğulayır. Şərqşünas bütün bu qaynaqlara əsasən Yunus Əmrənin XIII yüzilliyin sonlarında, hazırda Kastamonun Qızıl Əhmədli adlı bir bölgəsində, Bolu deyilən bir kənddən olduğunu da xatırladır və eyni zamanda onun Tapdıq Əmrə adında bir şeyxin müridi-tələbəsi olduğu da göstərilir. Onu da qeyd edək ki, təzkirəçilər Yunus Əmrənin yazıb-oxumaq bacarığı olmadığını söyləsələr də, onda olan qabiliyyətin Allah vergisi olduğunu da demişlər. Şərqşünas Gibb Aşıq Çələbiyə istinadən qeyd edir ki, Yunus Əmrə elə bir kamil insanlardandır ki, o, oxumuş olmasa da, Allahın lütfü ilə elm sahibi olmuşdur. Şair dünyəvi dili qəlb dilinə çevirən, qeyb dünyasının dilinin səsiylə sirlər söyləyən vəlilərdəndir. Onun qeyri-adi savada sahib olduğunu təsdiqləyən “Şakaikun-Numaniyye” əsərinə əsasən şərqşünas yazır: “Türk dilinin incəliyini, gözəlliyini, kinayə və mükəmməlliyini ehtiva edən varsağı formasında yazılan şeirlərindən aydın və dəqiq görünür ki, Yunus Əmrə Tövhid elminin ilahi sirlərinə vaqif olan, fövqaladə bir bilik sahibidir. Digər bir tarixçi Əli onun savadı barədə heç nə deməmiş, lakin şairin türk dilində sirlərlə dolu gözəl şeirlər yazdığını söyləmişdir” (Gibb, 1900:167).

Şairin əldə olan daşbasma şeirlərinə əsasən onun təxminən altı yüz beyt məsnəvi formasında yazılmış bir əsəri, üç yüz və ya dörd yüz qəzəldən ibarət Divanı olduğunu söyləmək olar. Şərqşünas bütün bu şeirlərin heca vəznində yazıldığını, Taşköprüzadənin yazdığına əsasən bu şeirlərin varsağı formasına uyğun gəldiyini söyləyir. Həqiqətən də “XIII əsrdə milli ənənəyə söykənən, heca vəznli türk sufi poeziyası artıq yaranıb inkişaf edirdi. XIII əsrin təsəvvüf şeirinin ən böyük nümayəndəsi də Yunus Əmrə idi” (Hümmətova, 2006:126). Bir çox qəzəllərində isə şair türk dilində daha çox işlədilən və sevilən müsəmmət formasından istifadə etmişdir. “Qəzəllərinin əksəriyyəti müsəmmət qafiyəlidir və bu, şeirə bir musiqi rövnəqi verməklə onun məna və məzmununa da dolğunluq, zənginlik bəxş edir” (Azadə, 2011:355). Böyük şairin daşbasma Divanında olan şeirlərindən danışarkən Gibb bu qəzəllərin heç də hamısının orijinal bir biçimdə saxlanılmadığını, tam mühafizə olunmadığını söyləsə də, buna səbəb heç də yüzilliklər boyu edilən dəyişikliklərin nəticəsi kimi baxmır. Şərqşünasın fikrincə, şairin fövqəladə türk xarakteri onun yazdığı şeirlərin hər bir misrasında görünür: “Sonda və içdə işlədilən qafiyələr qüsurludur. Yunus Əmrə şeirlərində bəlağət olmasa da, hər hansı bir süni bənzətmə yoxdur. Özünə xas olmayan, kəlmə və ibarələr işlədən Yunus Əmrənin dili “Rebab-namə”nin dili yox, daha çox Osmanlı dilidir. Əlbəttə, bir çox hallarda onun şeirlərinə düzəliş edilmişsə də, bu bir danılmaz faktdır ki, şairimiz məhz şimali türklərindəndir” (Gibb,1900:167).

Yunus Əmrə şeirlərini birər-birər təhlil edən şərqşünas onun qəzəllərinin əsasən axirət aləminə həsr edildiyini qeyd edir. Şairin diyar-diyar gəzən bir dərviş, mütəsəvvüf olduğunu, qəlbində təsəvvüf düşüncəsindən başqa heç bir şeyin onu maraqlandırmadığını söyləyən Gibb eyni zamanda şairi bütün türk ədəbiyyatında ən səmimi şair kimi səciyyələndirir belə ki, şairin təsəvvüf düşüncəsində hər şeyin böyük

eşqlə vəhdətə işarət etdiyi göstərilir. Şair bunu belə təsvir edir: "Başlanğıcda hər şey Alllahla birlikdədir, o da Ondan bir parçadır, bir kəs Sina dağında Musa ilədir, kimi İbrahimdir, oğlunun yerinə qurban edilən qoçdur, Yusifdir, Yusifi satın alan Kuteyfədir, Mənsurdur, Mənsuru dara çəkən cəlladdır, yer altındakı ilandır, səma boyu gəzişən buluddur, yer üzünə tökülən yağışdır. Yunus daha da irəli gedərək açıq-aşkar israr edir ki, o, insanı toxumdan, quşu yumurtadan yaradan Allahdan qeyri bir şey deyildir. Yunusun bu panteizmi açıq və səmimidir, bir çox şairlər kimi özünü məcaz və alleqoriya pərdəsi altında gizlətmir. Bir qoca dərviş nə söyləmək istəyirsə, onu açıq bir formada izhar edir" (Gibb,1900:168).

Şərqşünasın fikrincə, Yunus Əmrə poeziyası forma baxımından heç bir şairin poeziyasına bənzəmir, fərqli bir vəzndə yazılmışdır: "Gördüyümüz kimi Sultan Vələd, Yunus Əmrənin müasirləri və ondan sonra gələn davamçıları davamlı olaraq İran əruzundan istifadə etməsələr də, onlar İran şeir vəznində, İran şeir üslubunda yazmışdılar və bu mədəniyyətin abı-havası onların əsərlərinə hopmuşdur" (Gibb, 1900:168). Gibbə görə bu təsir nadir olsa da, şairin əsərlərində açıq-aydın dövrünün ruhuna hakim olan Mövlana Cəlaləddinin təsiri görünür. Şərqşünas Yunus Əmrənin digər türk şairlərlərindən fərqli olaraq lirik şair olduğunu, ilhamını daha çox Mövlananın Divanından yox, Məsnəvisindən aldığını söyləyir.

Gibb haqlı olaraq Yunus Əmrənin poeziya aləmində öz yolu olduğunu qeyd edərək göstərir ki, şair Mövlanadan ilham alsa da, fars ustadlarını təqlid edən digər ilk məsnəvi yazarlarından fərqli olaraq fars şairlərini təqlid etməmişdir. Yunus Əmrəni yüksək dəyərləndirən Gibb onun kimi qərbi Türkiyədə lirik şair olmadığını bir daha vurğulayır. Şairin poetik incilərinin hər bir halda gözəl bir biçimdə yazıldığını qeyd edən şərqşünas "yazıb-oxumağı bacarmayan" bir şair adlandırılan Yunus Əmrənin şeirlərinə heyrandır. Gibb Yunus Əmrə Divanından üç qəzəl və bir məsnəvini ingilis dilinə tərcümə etmişdir. Onun Yunus Əmrədən etdiyi ilk tərcümə "Kə'bə vü büt iman bənəm, çərx uruban dönən bənəm" misrası ilə başlanan qəzəldir. Qərb poeziyasından tam fərqli olan Şərq poeziyası forma, üslub və dil cəhətdən fərqlənsə də, Gibb bu çətinliyin öhdəsindən məharətlə gəlmiş, Yunus Əmrə poeziyasının gözəlliyini, forma və məzmununu saxlamışdır. Onu da qeyd edək ki, Gibbin özünün də qeyd etdiyi kimi "rədif" ingilis poeziyasına xas olmayan bir formadır. Lakin bu incə və vacib məqam Gibbin nəzərindən qaçmamış, türk poeziyasının vurğunu olan şərqşünas tərcümədə bunu saxlamışdır. Biz Yunus Əmrə qəzəlinə və Gibbin ingilis dilinə tərcüməsinə baxaq:

Kə'bə vü büt iman bənəm, çərx uruban dönən bənəm,
Bulut olub həvaya ağub, yağmur olup yağan bənəm.

Yıldırım olup çakıyan şakıyup nəfsin doqiyan,
Ol yer karında bərkiyən şol agılu ılan bənəm.

Həmzəyı Qafdan aşuran əlin-ayağın şeşüren,
Çokları tahtdan aşıran hikmet issi sultan bənəm.

Bulut olup göge agan yağmur olup yerə yagan,
Göz süzlerin gözündeki boz pusarık duman bənəm.

Dertli kişi gəlsün bəri göstərin ana yeri,
Könlüm evin gözin sehri devr içində zaman bənəm

Yunus degil bunu deyən, kudret dilidir söyləyən,
Kafir olsa inanmıyan əvvəl ahır həmən bənəm (Gibb, 1998:116).

Bu misralar Gibbin tərcüməsində belə səslənir:

Faith, idol, Kaba-fane am I; who smites the sphere a-spin am I;
The cloud upon the heavens' face, likewise the rains that rain am I.

The thunderbolt that flasheth forth, that, flashing, weaves itself in birth;
The poison-snake that deep in earth to creep and cower is fain am I.

The one who Hamza drew o'ver Qaf, who swelled his hands and feet therwith;
Who many from their throne drave off, the King of Wisdom's Rayne am I.

The cloud that doth to heaven ascend, the rain that doth to earth descend,
The haze and mist that doth before the sightless eyes remain am I…

Let him come here who suffers woe that I to him a place may show;
My heart his home, mine eye his town; Time in the Cycle-train am I.

It is not Yunus sayeth this, 'tis Power's Tongue that speaketh thus;
Who credits not a paynim is, the First and Latest e'en am I
(Gibb, 1900:171).

Gibb Şərq ədəbiyyatının, türkdilli poeziyanın bütün incəliklərinə bələd olduğundan Yunus Əmrə dünyasına daxil olmuş, şairin şeirində ən incə məqamları belə nəzərdən qaçırmamışdır. Qəzəldə olan "Bənəm" rədifi də ingilis dilinə edilən poetik tərcümədə olduğu kimi "am I" qalmışdır.

Gibbin Yunus Əmrədən etdiyi digər qəzəl "Yoldaş olalım ikimiz gel dosta gedəlim gel" misrası ilə başlayan qəzəldir. Qəzəldən bir neçə beytin tərcüməsinə baxaq:

Bu dünya kalmayalım fanidir aldanmıyalım,
İkimiz ayrılmiyalım gel dosta gidelim gel…

Ölüm haberi gelmedi ecel yakamız almadın,
Azrail hamle kılmadın gel dosta gidelim gel.

Gerçek Aşiki görelim hakkın haberin alalım,
Aşik Yunusu bulalım gel dosta gedelim gel
(Gibb, 1998:118).

Bu beytlərin ingilis dilinə tərcüməsinə baxaq:

Let us quit the world together, cheated not, for it doth wither;
Let us two be parted never, come and let us seek the Loved one.

Ere the clutch of Fate impel us, ere the voice of Death do hail us,
Ere that Azrail assail us, come and let us seek the Loved one.

Let us see the loyal lover tidings of The Truth to gather;
Let us find the lover, come and let us seek the Loved One
(Gibb, 1900:173).

Burada böyük sənətkar Allaha olan sevgisini, ona qovuşmaq arzusunu və beləliklə, eşqin ən uca məqamını məhz bunda görür. Tərcümədə şairin fikri, yaratdığı lövhə, Allaha eşqinin təzahürü olduğu kimi əks olunmuşdur. Bu, bir daha Gibbin tərcüməçilik bacarığından xəbər verir. Onun tərcüməsi orijinalla tam eyniyyət təşkil edir.

Yunus Əmrənin ədəbi irsini tədqiq edən qərb şərqşünasları arasında müasir tədqiqatçılardan Paul Smitin xüsusi mövqeyi vardır. Paul Smit həm də bir şair, dramaturq kimi yazıb-yaradır və eləcə də 80-dən çox şairlərin, o cümlədən Şərqin nəhəng simalarından olan Sədi, Hafiz, Rudəki, Ömər Xəyyam, həmçinin Nizami, Nəsimi, Füzüli və digər sənətkarların sənət incilərini ingilis dilinə tərcümə etmişdir. 1945-ci ildə Avstraliyada dünyaya gələn Paul Smit hələ səkkiz yaşında olarkən klassik üslubda şeir

yazmağa başlamış, dünyanın fani olduğunu hələ erkən yaşlarından dərk etmiş və orta məktəbi bitirən kimi dünya səyahətinə çıxmışdır. Həqiqət axtarışına çıxan gələcək şair-tərcüməçi müxtəlif işlərdə çalışmış və bu, onun zəngin həyat təcrübəsinə malik olmasına zəmin yaratmışdır. Paul Smitin tədqiq etdiyi şairlərdən biri özünün də qeyd etdiyi kimi ilk şeirlərindən heyran olduğu və bütün Şərq ölkələrində şöhrət qazanmış Yunus Əmrədir. Tədqiqatçı Yunus Əmrəni dövrünün ən qüdrətli şairi kimi xarakterizə edir və özündən sonrakı şairlərə böyük təsir göstərdiyini vurğulayır. Şairin həyatı haqqında digər şairlərdən fərqli olaraq çox az məlumat olduğunu diqqətə çəkən tədqiqatçı yazır: "Təsəvvüf şairi kimi Yunus Əmrənin təsvir etdiyi ilahi eşq dünyavi eşq ilə vəhdət təşkil edir və onun bütün şeirlərində bəşəri dəyərlər, bərabərlik, haqq və ədalət, kamil insan, sevgili, dost, ləyaqət kimi ülvi hisslər başlıca yer tutur" (Smith, 2012:6) Şairin müasiri olan Mövlana Cəlaləddin Rumi ilə görüşməsindən söz açan Paul Smit hər iki aşiqi iki böyük qəlb şairi adlandırır.

Yunus Əmrənin divanından seçilmiş şeirləri ingilis dilinə tərcümə edərkən Paul Smit çalışmışdır ki, şairin sənətkarlıq baxımından zəngin olan şeirlərinin üslub və dil cəhətdən orijinala yaxın bir formada tərcümə etsin. Məhz bu baxımdan şairin şeirlərini qərb oxucularına çatdırmaq üçün şeirin ritm və quruluşunu, ölçü və ahəngini, məzmununu, intonasiyasını saxlamış, qərb şeir fopmasından fərqli olsa da, Yunus Əmrə dünyasına bələd bir mütərcim kimi bu mistik şeirlərdə olan gözəllik və mənanı saxlayaraq şərəfli və çətin işin öhdəsindən ləyaqətlə gəlmişdir.

Yunus Əmrənin yaşadığı dövrü xatakterizə edən, həyatı haqqında olan məlumatların ancaq rəvayətlərdən əldə edildiyini söyləyən mütərcim, eləcə də bir çox tarixçilərin və alimlərin fikirlərinə əsasən şairin 1260-cı ildə Anadoluda anadan olduğu qənaətinə gəlir. Paul Smit şair haqqında ilkin məlumatların daha çox Hacı Bektaşi Vəlinin "Vilayətnaməsində" olduğu fikrini də diqqətə çəkir. Onun müxtəlif diyarlara səfərindən, eləcə də Suriya və Azərbaycana getdiyini söyləyən mütərcim şairin səfər zamanı miskin adamların məşəqqətli həyatı ilə tanış olan, yol boyu sadə adamların danışdığı türk dilində öz şeirlərini oxuyan və dövründə şeirlərini türk dilində yazan ilk şair kimi dəyərləndirir, dilinin xalq dilinə çox yaxın olduğunu, poetik dünyasının başdan-başa Allaha sevgi, təsəvvüf və humanizm ideyaları ilə zəngin olduğunu qeyd edir. Şairin fikir dünyasına daha dərindən bələd olmaq əzmilə Paul Smit onun 416 şeirdən ibarət olan Divanı və "Risalətün Nüshiyyə" adlı didaktik məsnəvisindən də söz açır. O, şairin bu əsərini təsvir edərkən onun əsasən kainatın, Adəmin yaradılışını, Əzab, Ruh, Qəzəb, Nifrət kimi hiss və duyğuları rəmz və simvollarla əks edən bir əsər adlandırır. Yunus Əmrənin "türk dilində qələmə aldığı "Risalətün-Nüshiyyə" didaktik məsnəvisi türkdilli poeziyada ilk didaktik məsnəvidir. Əsərdə fars-ərəb tərkibli izafətlərə rast gəlmirik. Risalə aydın qədim türk söz və ifadələri ilə yanaşı, müasir oxucunun başa düşəcəyi bir türkcədə yazılıb...Yunus Əmrə "Risalətün-Nüshiyyə" əsərini insan varlığının dərkinə həsr etmişdir. O, bu risaləsi ilə insan xislətini tanımaq, islami qaydalar əsasında onu tərbiyələndirməyi qarşısına məqsəd qoymuş və onun yollarını göstərmişdir" (Hümmətova, 2013:16,18). Paul Smit qeyd edir hər iki əsər daha çox Allaha olan Eşqə, islam dünyasının müqəddəs kitabı Quran-i Kərim, Peyğəmbər və onun əhli-beytinə yönələn əsərlərdir.

İstedadlı mütərcim Paul Smit "Türk dərviş Yunus Əmrənin seçilmiş şeirləri" adlı əsərində türk dili, qəzəl və türk poeziyası, sufilər və dərvişlər: onların sənətkarlığı və poeziyası haqqında müfəssəl məlumat verir. O, Yunus Əmrə ədəbi irsindən ingilis dilinə bir məsnəvi və yüz otuz iki qəzəl tərcümə etmişdir.

## Nəticə

Buradan belə bir nəticəyə gəlirik ki, türk ədəbiyyatı xəzinəsini ölməz əsərləri ilə zənginləşdirən böyük təsəvvüf şairi Yunus Əmrənin ingilis şərqşünaslığında öyrənilməsi ən vacib və gərəklidir. Şair haqqında ingilis dilində olan qaynaqlar bir daha göstərir ki, XIX yüzillikdən etibarən ingilis şərqşünasları şairin ədəbi irsinə maraq göstərmiş, yeri gəldikcə poetik incilərini ingilis dilinə tərcümə etmişlər. Əlbəttə, bir məqalədə böyük şairin bütövlükdə zəngin ədəbi irsini əhatə etmək mümkün deyil. Yunus Əmrə tədqiqatçıları arasında fərqli bir mövqe tutan Elyas Con Vilkinson Gibb bir örnək olaraq şair haqqında geniş tədqiqat aparmağa zəmin yaradır.

**Ədəbiyyat**

1. Əliyeva, L. (1997). Füzuli və ingilis şərqşünaslığı. Bakı: "Ozan".
2. Gibb, E.J.W. (1900). A history of Ottoman poetry. Volume I, London, 168 p.
3. Bəydili, C. (Məmmədov). (2004). Həqq didarın görən şair. Yunus Əmrə. Əsərləri. Bakı: "Öndər nəşriyyat".
4. Gibb, E.J.W. (1900). A history of Ottoman poetry. Volume I, London.
5. Hümmətova, X. (2006). Yunus Əmrə. Bakı: "Elm", s.118.
6. Azadə, R. (2011). "Yunus İmrə cazibəsi". Mənəvi dünənimiz bu günün işığında. Bakı: "Elm" nəşriyyatı.
7. Gibb, E.J.W. (1900). A history of Ottoman poetry. Volume I, London, 171 p.
8. Gibb, E.J.W. (1998). History of Ottoman Poetry. I-II (Translation by Ali Chavushoghlu), Akchagh Publications, 118 p.
9. Gibb, E.J.W. (1900). A history of Ottoman poetry. Volume I, London, 173 p.
10. Gibb, E.J.W. (1998). History of Ottoman poetry, I-II (Translation by Ali Chavushoghlu), Akchagh Publications.
11. Smith, P. Yunus Emre: The Turkish selected poems (Translation and introduction). New humanity books.
12. Hümmətova, B.X. (2013). Yunus Əmrənin dövrü, həyatı və "Risalətün-Nüshiyyə" məsnəvisində əxlaqi təlqin. Bakı: "Elm və Təhsil", s.16, 18.

**Rəyçi: fil.ü.f.d. Leyli Əliyeva**

Göndərildi: 30.07.2022 Qəbul edildi: 20.09.2022

DOI: https://doi.org/10.36719/2663-4619/83/50-54

**Ülvüyyə Şirzad qızı Hüseynova**
Bakı Dövlət Universiteti
ulka.huseyn1011@mail.ru

# İNVEKTİV ANLAYIŞI VƏ İNVEKTİVLƏRİN TƏYİNİ MƏSƏLƏLƏRİ HAQQINDA

**Xülasə**

Məqalədə invektiv lüğət yaratmaq vasitələri açıqlanır. İnvektiv lüğət tez-tez dil aqressiyasına gətirib çıxarır, kobud stilistik cəhətdən standart olmayan nitq davranışı yaradır. Kütləvi informasiya vasitələrində invektiv lüğətin yaradılması funksiyalarına və şifahi aqressiya vasitələrinə xüsusi diqqət yetirilir. Məqalədə nümunələr verilir, həmçinin kontekstdə yaradılan invektiv lüğətin istifadəsinin hərtərəfli təhlili araşdırılır.

***Açar sözlər:*** *kollokvializmlər, invektiv leksika və frazeologiya, linqivistik ekspertiza, loru sözlər, qeyri-normativ sözlər*

**Ulvuyya Shirzad Huseynova**

## About the concept of invective and issues of definition of invectives

**Abstract**

The article reveals with the means of creating invective vocabulary. The invective vocabulary often leads to language aggression, creating rude stylistically substandard type of speech behavior. Special attention is paid to the functions of creating invective vocabulary and means of exercising verbal aggression in mass media. The paper gives examples, and also a thorough analysis of the usage of invective vocabulary, being created in context.

***Keywords:*** *colloquialisms, invective vocabulary and phraseology, linguistic expertise, slang words, non-normative words*

## Giriş

Dilin lüğət fondunun vahidi olan söz fərqli cəhətlərdən öyrənilir. Belə aspektlərdən biri də sözlərin işlənmə dairəsi ilə bağlıdır. Lüğət fondu geniş anlayışdır. Bu anlayış leksemləri, frazeologizmləri və terminləri əhatə edir.

Azərbaycan dilinin leksikologiyası S.Cəfərov, M.Hüseynzadə, H.Mirzəzadə, M.Adilov, Ə.Dəmirçizadə, A.Qurbanov, H.Həsənov, B.Xəlilov və başqa tədqiqatçılar tərəfindən öyrənilmiş, leksik sistemin vahidlərinin təsnifi verilmişdir.

Dilin leksik sistemi cəmiyyətin tarixi və həyatı ilə sıx şəkildə bağlıdır. Obyektiv gerçəklikdə baş verən bütün hadisələr, dəyişikliklər, inkişaf meylləri, predmet və əşyalar dilin lüğət tərkibində ifadəsini tapmışdır.

"*Söz bizi əhatə edən aləm haqqında bilikləri özündə ehtiva edir, toplayır, qoruyur. O, dilin daşıyıcılarının tələbatını ödəyən mühüm vasitədir, mədəniyyət abidəsidir, millətin keçmişinin və bugününün güzgüsüdür, hər bir dəyərli xalqın həyat tərzini anlamağın açarıdır, ümumiyyətlə, bilikləri gerçəkləşdirən vasitədir*" (1962:3).

Bu vasitələr eyni mahiyyət daşımır, funksionallığı, işləkliyi ilə fərqlənirlər. Sözlərin elə bir qismi də vardır ki, onların dildə işlənməsinə müəyyən məhdudiyyətlər qoyulur. Dilin ümumişlək leksik qatına daxil olan sözlər ünsiyyət prosesində məhsuldar şəkildə istifadə olunur. Ümumişlək leksik vahidlərin miqdarı qeyri-fəal sözlərdən azdır.

Ə.Dəmirçizadə dilin lüğət tərkibini ümumişlək və xüsusi, S.Cəfərov isə aktiv və passiv söz qruplarına ayırmışdır (Kuznets, Skrebnev, 1960:78-79; Morokhovskiy, Vorobyeva, Likhosherst, 1984:66). H.Həsənovun və S.Cəfərovun işləkliyə görə bölgüləri eynidir (Adilov, Verdiyeva, Ağayeva, 1989:150-

151). Bu problemə üslubi mövqedən yanaşmış T.Əfəndiyeva lüğət fondunun vahidlərini dörd qrupa ayırmışdır:

1. ümumişlək və funksional üslubi lay;
2. dialektizmlər, peşə-sənət sözləri;
3. emosional və ekspressiv leksika;
4. əcnəbi leksika, neologizmlər və arxaik sözlər (Dəmirçizadə, 1962:127-199).

T.Əfəndiyevanın bölgüsündəki üçüncü qrup işlənməyə məhdudiyyət qoyulma baxımından seçilir. Bu qrupda müsbət və mənfi məna ifadə edən sözlər yer alır. Mənfi mənalı sözlər sırasında söyüş, nifrət, təhqir, qarğış, təhqir ifadə edənlər ayrıca bir lay əmələ gətirir. Dilçilikdə bu sözlər vulqarizmlər adlandırılır. Evfemizmlər də emosional və ekspressiv sözlər qrupuna daxil olur.

Sözlərin bu və ya buna oxşar şəkildə təsnifi əksər dillər üçün aparılmışdır. Məsələn, ingilis dili üçün bu məsələyə baxmış M.Kuznets və Y.Skrebnev bu dilin sözlərini dörd qrupa bölmüşlər:

1) yüksək üsluba aid sözlər (arxaizmlər, bədii sözlər və əcnəbi sözlər);
2) aşağı təbəqənin işlətdiyi sözlər (danışıq dili sözləri, arqolar, vulqarizmlər);
3) neytral sözlər (peşə-sənət sözləri, dialektizmlər);
4) xüsusi sözlər (Cəfərov, 1970:44-58).

A. Voroxovski və O.Vorobyovanın tədqiqatında yüksək üsluba aid sözlər (poetizmlər, arxaizmlər, varvarizmlər və əcnəbi sözlər) və qeyri-ədəbi danışıq dili sözləri (kollokvualizmlər, dialektizmlər, vulqarizmlər, jarqon sözləri və slenqlər) fərqləndirilmişdir (Həsənov, 1988:101-117). Ümumiyyətlə, sözlərin müxtəlif meyarlar üzrə təsnifi ilə bağlı çoxsaylı tədqiqat işləri vardır. Bu işlərdə irəli sürülən əsas fikirlər, təsnif qrupları çox zaman üst-üstə düşür.

İnvektivlərlə bağlı tədqiqatlar dilin lüğət tərkibinə daxil olan və işlənməsinə məhdudiyyət qoyulan sözlərin öz mənaları və onların olduğu kontekstlərin ifadə etdikləri mənaların öyrənilməsi prosesində meydana çıxmışdır. Bu baxımdan, linqvistikada invektiv probleminin tədqiqi tarixinin xülasəsində vulqarizm, kollokvualizmlər, evfemizmlər anlayışları ilə bağlı fikirləri nəzərdən keçirmək lazım gəlir.

Dilçilikdə qeyri-rəsmi şəraitdə işlənən, ədəbi dilin leksik normalarını pozan, açıq-saçıq, kobud, ədəbsiz sözlər və ya söz birləşmələri loru sözlər kimi qruplaşdırılır (Əfəndiyeva, 1980:152). Loru sözlərin ədəbi dil normasını pozmasını iddia etmək olmaz. İstinad etdiyimiz lüğətdə də nümunə kimi verilmiş bəzi sözlərin (kalan, əkilmək, goplamaq və s.) ədəbi dildə işlədilməsinin normanın pozulması olmasını izah etmək çətindir. Loru sözlər danışıq dilində işlənir və onların işləkliyində məhdudiyyətlər dilin inkişafı prosesində üzə çıxa bilir. Ona görə də loru sözləri xüsusi və vulqar olmaqla iki qrupa bölmək mümkündür. Birinci qrupa aid edilən sölərdə ekspressivliyin və kobud qiymətləndirmənin zəifliyi qəbul edilir. Vulqar sözlərdə isə kobudluq, nəzakətsizlik və mənfi ekspressiya güclüdür. Təbii ki, kobudluq və nəzakətsizlik dərəcəsinin təyini üçün konkret meyarlar yoxdur. Buna baxmayaraq bəzi tədqiqatçılar vulqarizmləri kobudluq dərəcəsinə görə ayırmağa cəhd göstərmişlər. Məsələn, H.Həsənov vulqarizmlərin iki qrupundan bəhs etmişdir:

1) kobud sözlər; ədəbi dil normasından uzaq olan kobud sözlər;
2) söyüşlər.

Müəllif ikinci qrupu iki alt qrupa ayırmışdır:

a) nitqdə işlədilənlər; b) parnoqrafik sözlər.

İngilis dilinin vulqarizmlərinin iki qrupa bölünməsi müşahidə edilir:

1) qarğış və andlar;
2) söyüş bildirənlər (Hajiyeva, 2010:206-207).

Bəzən kollokvializmlər adlandırılan söz qrupu da fərqləndirilir və bu qrupa daxil olan sözlərin də mənfi məna daşıması qeyd olunur. Kollokvializmlər (ing. colloquialism < lat. colloqui – danışmaq) – yalnız danışıq dilində işlənən sözlər qrupu hesab edilir (10). Göründüyü kimi, kollokvializmləri fərqləndirən əsas cəhət onların danışıq dilində işlədilməsidir. Danışıq dilində işlənmə isə sözün neqativ məna daşımasını şərtləndirmir.

Müasir dövrdə dilin, dil materiallarının, dil vahidlərinin, həmçinin nitqin, nitq aktlarının kommunikativ-praqmatik, koqnitiv, eləcə də sosial-mədəni, etnokulturoloji planda tədqiq olunmasına xüsusi əhəmiyyət verilir. Dilə antroposentrik yanaşma insanlararası münasibətlərdə, xüsusən ünsiyyət prosesində dil vasitələrindən istifadə olunması xüsusiyyətlərinin, prinsiplərinin və normalarının öyrənilməsinin əhəmiyyətini artırmışdır. Dilçilikdə etiket normaları, etiket qəlibləri, kommunikativlər,

spesifik vokativlər geniş tədqiq olunmuşdur. Bundan fərqli olaraq, etiket normalarının kobud pozulması halları, mənfi emosiyanın dil vasitələri ilə verballaşması, mənfi münasibətin qeyri-verbal ifadəsi məsələləri kifayət qədər araşdırılmamışdır. Kommunikasiya prosesində şəxslərarası münasibətlər və qarşılıqlı təsirlər, insanların stimula nitq vasitəsilə reaksiyasının xüsusiyyətləri və növləri də müxtəlif aspektlərdən öyrənilməsi əhəmiyyət daşıyır. İnsan cəmiyyəti inkişaf etdikcə şəxsiyyətin şərəf və ləyaqəti, heysiyyatı, nüfuzu, cəmiyyətin ona münasibəti də xüsusi diqqət və əhəmiyyət kəsb edir. İnformasiyanın yayılma və ötürülmə vasitələrinin artması, informasiyanın daha geniş miqyasda yayılması şəxsə ünvanlanan, ona aid edilən məlumatların verilməsinə və dil vasitələri ilə ifadə olunmasına ehtiyatla yanaşma tələb edir.

Münasibət adamların bir-birinə qarşılıqlı təsirinin çoxtərəfli mürəkkəb prosesini özündə birləşdirir. Bu prosesə yalnız informasiyanın nitqin köməyi ilə mübadiləsi kimi baxmaq olmaz. Burada informasiyanın emosional əlaqə və şəxslərarası münasibətləri formalaşdırma və dəyişdirmə imkanları da nəzərə alınmalıdır.

Fərdin müsahibinə əxlaqi, fiziki və mənəvi ziyan vurmaq cəhdini özündə birləşdirən davranış invektiv davranış adlanır. Adresata təhqir məqsədli təsirin verbal, eləcə də qeyri-verbal vasitələri invektivlər adlanır. Söyüş və tabuların dildə işlədilməsi invektiv anlayışı ilə bağlıdır. Dilçilikdə bu, *qeyri-normativ leksika* və *qeyri-normativ ifadələr* termin-söz birləşmələri də istifadə olunur.

Müasir dilçilikdə invektiv termini istifadə edilir. Bu termin dilçiliklə yanaşı, sosiologiyada, politologiyada, hüquqşünaslıqda və bəzi başqa sahələrdə də istifadə olunur və tətbiqini tapır. Linqvistikada və hüquqda invektiv, invektiv ifadə, təhqir, şərəf və ləyaqəti alçaldan fikir, ifadə və sözlər kimi termin və termin söz birləşmələrinin də işlədilməsi müşahidə olunur.

İnvektiv latın dilindən olan *invectio* (üstünə getmək, söyüş və s.) sözündəndir. Pamflet janrına aid olub şəxsi və şəxslər qrupunu alçaldan, gülüş hədəfinə çevirən bədii əsəri ifadə etmişdir. Hazırda insanı təhqir edən, onu alçaldan səciyyə daşıyan söz, ifadə, söyləm, fikir, mətn verbal təcavüz − invektiv sayılır. İnvektiv antik ədəbiyyatda janr və kontekst şəklində formalaşmışdır. Azərbaycan ədəbiyyatında bu janra həcvlər uyğun gəlir. Mədəni fenomen kimi invektiv şəxsi təhqir və diskkreditasiya edən verballaşdırılmış məlumatdır. Xüsusi halda verbal forma jestlərlə də ifadəsini tapa bilir. İnvektivi adi ekspressiyadan ayıran cəhət onun konkret şəxsə və ya şəxslərə ünvanlanmasıdır. Ünvanlama eksplisit və implisit formada təzahür edə bilər.

Dilçilikdə invektiv müxtəlif tədqiqat işlərində öyrənilmişdir. Q.V.Kuskovun tədqiqat işində invektiv leksika və frazeologiya anlayışlarının təyin edilməsinə cəhd göstərilmişdir. Müəllifin fikrinə görə, invektivlərin üç forması vardır:

1) ədəbi söyüşlər;
2) məişət-danışıq invektivləri;
3) ümumişlək invektivlər (Kuskov, 2004:12-13).

Bəzi tədqiqatçılar invektiv nitqi müxtəlif səciyyəli söyüşlər şəklində ümumiləşdirmişlər (Pozolotin, 2005:9-10).

A.V.Kuryanoviç invektivin kontekstlə bağlılıq fikrini irəli sürmüş, neytral sözlərin emosional çalarlı sözlərlə bir ətrafda işlənərək invektiv məna yaratmasını göstərmişdir (Kuryanovich, 2005:109-110).

Hər bir sosiumda invektivlər müəyyən çoxluq təşkil etdiyi kimi, bir sosiumda invektiv hesab olunan vahidin başqa bir sosiumda invektiv sayılmaması faktları da vardır. Bu baxımdan hər bir dilə aid invektivlərin müəyyənləşdirilməsi və onların invektiv olması meyarlarının təyin olunması aktuallığı ilə seçilən linqvistik məsələdir.

Dilin invektiv-qiymətləndirmə vasitələrinin təyin olunması müəyyən meyarlara əsaslanmalıdır. Belə meyarların tapılması, ilk növbədə, invektiv leksikanın müəyyənləşdirilməsi məsələsini həll etməyi tələb edir. Lakin bununla yanaşı, invektiv leksikanın işlənmə kontekstləri, invektiv leksikanın distributiv imkanları, tabular, invektiv frazeoloji vahidlər və invektiv qəliblər (söyüşlər) də tədqiqat obyekti kimi xüsusi maraq doğurur. İnvektivin kontekstdə işlənməsi sətiraltı məna daşıya bilər. Bu baxımdan invektiv və podtekst məsələsinin araşdırılması da əhəmiyyətli məsələlərdən biridir.

Müxtəlif dillərdə, o cümlədən müxtəlif sistemli dillərdə invektivlərin sırf linqvistik və etnolinqvistik səviyyələrdə müqayisəli tədqiqatı, invektivlərin tipologiyası məsələləri də müasir dövr dilçiliyində aktuallığı ilə seçilir. Azərbaycan dilçiliyində bu günə qədər qeyd olunan istiqamətdə tədqiqatlar

aparılmamışdır. Doğrudur, dilçiliyimizdə qeyri-normativ leksik vahidlərə aid bəzi tədqiqatlar olmuşdur. Lakin bu işlər azdır və müasir dilçiliyin qoyduğu tələblərə cavab vermir.

N.D.Qolev invektivi kəskin (dava-dalaş) mübahisə janrı hesab etmişdir (Golev, Lebedeva, 2000:159-160). Adətən kəskin mübahisələr zamanı tərəflər bir-birini təhqir edir, söyüş söyür, fikirlərini ədəbsiz formada ifadə edirlər.

Şəxsin şərəf və ləyaqətini alçaldan, onun işgüzar nüfuzuna xələl gətirən halların linqvistik ekspertiza işlərində araşdırılması məsələləri də bilavasitə invektivlərlə bağlıdır. Ekspert bu və ya digər mətn və kontekstdə işlədilmiş söz və ifadələrin ünvanlandığı şəxsin şərəf və ləyaqətinə, işgüzar nüfuzuna xələl gətirib-gətirməməsi məqsədilə linqvistik tədqiqat aparır. Məsələn, "...Sizə qarşı çevrilmiş xalq qarşısında olan kobud səhvlərinizi və dövləti cinayətlərinizi yalnız xalq qarşısında səmimi etiraf etməklə günahınızı yumuş olarsınız...", "…vəzifə hərisliyi sizi yeni cinayətlər törətməyə sövq edir…", "Seçki günü edəcəyin bütün hər cür səhvlər sənin cinayətlərini daha da qəlizləşdirəcək. Mən inanıram, sən növbəti cinayətlərdən də çəkinməyəcəksən", "Çünki artıq bu cinayətlərə çoxdan alışmısan. Sən bu cinayətlərə məhkəməni aldadanda, saxta sənədlər yazanda, kasıb, sadə, zəhmətkeş adamlara böhtan atanda, ayrı-seçkilik salanda alışmısan", "Nə qədər ki gec deyil, səni bu cinayətlərdən əl çəkməyə dəvət edirik" (2004:5). Tədqiqat prosesində bu cür kontekstlərdəki invektiv ifadələr, söz və fikirlər müəyyənləşdirilir.

"Paralel" qəzetinin 12 dekabr 2004-cü il tarixli sayının 5-ci səhifəsində çap edilmiş "Açıq məktub" yazısının birinci abzasından götürülmüş "Sizə qarşı çevrilmiş xalq qarşısında olan kobud səhvlərinizi və dövləti cinayətlərinizi yalnız xalq qarşısında səmimi etiraf etməklə günahınızı yumuş olarsınız" cümləsində "sizə qarşı çevrilmiş xalq" ifadəsi işlədilmişdir. Bu ifadə xalqın (müəllif xalq sözünü … rayonunun … kəndinin sakinləri anlamında işlədir) … əleyhinə olması məzmunu kəsb edir. Şəxs haqqında belə ifadənin işlədilməsi onun hansısa neqativ (mənfi) əməlləri ilə əlaqələndirilməlidir. Yazıda ifadənin işləndiyi kontekstdə eyni şəxsə aid edilən belə əməllər sadalanır: "xalq qarşısında olan kobud səhvlərinizi və dövləti cinayətlərinizi". Səhv mənfi məzmun daşısa da, onun kobud və ya adi olmasını təyinetmə meyarı yoxdur. Hər kəsin səhv edə biləcəyi nəzərə alınarsa, "kobud səhvləriniz" ifadəsini aid edildiyi subyektin şərəf və ləyaqətinə, işgüzar nüfuzuna xələl gətirən ifadə kimi qəbul etmək olmaz. Bundan fərqli olaraq "dövləti cinayətlərinizi" ifadəsi şəxs haqqında neqativ (mənfi) informasiya daşıyır. Linqvistik ekspertizaya aid elmi ədəbiyyatda "mənfi (neqativ) informasiya" anlayışı belə təyin olunur: "Mənfi (neqativ) informasiya − sağlam düşüncə və əxlaq ("yazılmamış qanun") yaxud hüquqi baxımdan (ekspert-linqvistlə müqayisədə hüquq sahəsində xüsusi bilikləri olmayan fəaliyyət qabiliyyətli hər bir vətəndaş tərəfindən mənfi qəbul edilən) hüquqi və ya fiziki şəxsin əməlləri və ya özü haqqında mənfi səciyyə daşıyan informasiyadır. Əgər mənfi informasiya (məlumat) həqiqətə uyğun olmazsa, onda bu informasiya aid edildiyi subyekti ləkələyir. Əgər yayılan mənfi informasiya (məlumat) həqiqətə uyğundursa, onda onun aid edildiyi subyektin şərəf və ləyaqətinə xələl gətirir" (2004:26). Bu nümunə invektivlərin müəyyənləşdirilməsinin üsullarının çoxluğunu təsdiq etməklə yanaşı, onların təyini zamanı kontekstin nəzərə alınmasının vacibliyini də aşkar şəkildə göstərir.

## Nəticə

Son dövrlərdə şəxsin şərəf və ləyaqətinin alçaldılması, onun işgüzar nüfuzuna xələl gətirilməsi, təmiz adının ləkələnməsi, təhqir olunması, şəxsə böhtan atılması, hədə-qorxu gəlinməsi ilə bağlı məhkəmə işlərinin sayı xeyli artmışdır. Bu cür məsələlərin həlli dilçi mütəxəssislərin rəyinə və linqvistik ekspertizaya olan tələbi çoxaltmışdır. Lakin nə mütəxəssislər, nə də ekspertlər dilçiliyimizdə bu sahədə aparılmış kompleks tədqiqatlara əsaslana bilmir. Çünki bu cür tədqiqatlar Azərbaycan dilçiliyində yox dərəcəsindədir.

İngilis və Azərbaycan dilində invektiv leksika və onun işlənmə xüsusiyyətlərini öyrənmək, invektiv leksikanın təyin olunması meyarlarını müəyyənləşdirmək aktual məsələlərdən biridir. Aparılmış təhlil göstərir ki, bu istiqamətdə tədqiqat prosesində ingilis və Azərbaycan dillərində invektiv qiymətləndirmə leksikasının toplanması, invektivlik şərtlərinin təyin olunması, ünsiyyətin başqa kateqoriyaları arasında invektivlərin yerinin müəyyənləşdirilməsi, invektiv nitq aktının xüsusiyyətlərini öyrənmək kimi məsələlərin həlli zərurəti ortaya çıxır.

Beləliklə, aydın olur ki, invektivlik və invektivlər dilçilikdə ayrıca tədqiqat obyekti olub çoxplanlı mahiyyət daşıyır. Bu vahidlərin təyini onların ifadə və məzmun planlarını qarşılıqlı əlaqəli şəkildə araşdırmaq yolu reallaşa bilər.

## Ədəbiyyat

1. Slovari i lingvostranovedeniye. (1962). M., 667 s.
2. Kuznets, M.D., Skrebnev, YU.M. (1960). Stilistika angliyskogo yazyka. L.: UCHPEDGIZ, 172 s.
3. Morokhovskiy, A.N., Vorobyeva, O.P., Likhosherst, N.I. (1984). Stilistika angliyskogo yazyka. Kiyev: Vishcha shkola, 247 s.
4. Adilov, M.İ., Verdiyeva, Z.H., Ağayeva, F.M. (1989). İzahlı dilçilik terminləri. Bakı: Maarif, 364 s.
5. Dəmirçizadə, Ə.M. (1962). Azərbaycan dilinin üslubiyyatı. Bakı: Azərtədrisnəşr, 268 s.
6. Cəfərov, S.A. (1970). Müasir azərbaycan dili (leksika). Bakı: Maarif, 235 s.
7. Həsənov, H.Ə. (1988). Müasir Azərbaycan dilinin leksikası. Bakı: Maarif, 306 s.
8. Əfəndiyeva, T.Ə. (1980). Azərbaycan dilinin leksik üslubiyyatı. Bakı: Elm, 250 s.
9. Hajiyeva, U.D. (2010). A guide to English stylistics. Baku: ASPU, 341 p.
10. https://rus-foreign-words-dict.slovaronline.com
11. Kuskov, G.V. (2004). Oskorbleniye kak illokutivnyy lingvokulturnyy kontsept: avtoref.dis.kand.filol.nauk. Volgograd, 27 s.
12. Pozolotin, A. YU. (2005). Invektivnyye oboznacheniya cheloveka kak lingvokulturnyy fenomen (na materiale nemetskogo yazyka): avtoref.dis.kand. filol.nauk. Volgograd, 36 s.
13. Kuryanovich, A.V. (2005). Invektivnyye rechevyye zhanry v prostranstve sovremennoy mezhlichnostnoy kommunikatsii. Vestnik Tomskogo gosudarstvennogo pedagogicheskogo universiteta: sbornik nauch. st. Seriya: «Gumanitarnyye nauki. Filologiya». Tomsk: Izd-vo TPGU, №3(47), s.106-112.
14. Golev, N.D., Lebedeva, N.B. (2000). Rechevoy zhanr ssory i konfliktnyye stsenarii v rasskazakh V.M. Shukshina. Yurislingvistika – 2: russkiy yazyk v yego yestestvennom i yuridicheskom bytii: mezhvuzovskiy sbornik nauch.st. Barnaul: Izd-vo Altayskogo gos.un-ta, №2, s.158-171.
15. Açıq məktub. (2004). "Paralel" qəzeti. 12 dekabr.
16. Pamyatka po voprosam naznacheniya sudebnoy lingvisticheskoy ekspertizy. (2004). Moskva: Meleya.

**Rəyçi: fil.ü.f.d. Abbas Abbasov**

Göndərildi: 25.07.2022 Qəbul edildi: 24.09.2022

DOI: https://doi.org/10.36719/2663-4619/83/55-60

**Tənzilə Sərvər qızı Qasımova**
ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedoqoji Kolleci
qasimovatanzila@gmail.com

# SADƏ CÜMLƏNİN MƏQSƏD VƏ İNTONASİYAYA GÖRƏ NÖVLƏRİNDƏ SÖZ SIRASI

**Xülasə**

Məqalədə söz sırası cümlənin məqsəd və intonasiyaya görə növləri üzərində nəzərdən keçirilir. Dildə söz sırası dedikdə dili, nitqi təşkil edən sözlərin müəyyən bir qanunauyğunluq əsasında düzülməsi nəzərdə tutulur. Bu qanunauyğunluq hər bir dilin daxili qanunlarına əsasən formalaşır. Söz sırası bütün sintaktik vahidlərdə ən mühüm xüsusiyyətlərdəndir. Cümlədə söz sırası cümlənin qrammatik üzvlənmə elementlərinin cümlə üzvlərinin müəyyən bir qaydaya əsasən düzülməsidir. Söz sırası cümlənin kommunikativ xarakterini müəyyənləşdirməkdə aparıcı rol oynayır. Cümlənin kommunikativ xarakteri danışanın cümlədən hansı məqsədlə istifadə etməsini nəzərdə tutur və bu məqsəddən asılı olaraq söz sırası pozula bilər. Danışıq dilində söz sırası demək olar ki, danışanın iradəsindən asılıdır və sərbəstdir. Amma bu sərbəstlik fikrin anlaşılmasında çətinlik yaratmamalıdır.

***Açar sözlər*:** *cümlə üzvləri, kommunikativ funksiya, nəqli cümlə, sual cümləsi, əmr cümləsi, nida cümləsi*

**Tanzila Sarvar Gasimova**

## Word order in types of simple sentences according to purpose and intonation

**Abstract**

In the article, word order is considered based on the purpose and intonation of the sentence. Word order in a language means that the words that make up the language and speech are arranged according to a certain law. Compliance with this law is formed based on the internal laws of each language. Word order is one of the most important features of all syntactic units. Word order in a sentence is the arrangement of the grammatical elements of the sentence-sentence members according to a certain rule. Word order plays a leading role in determining the communicative character of a sentence. The communicative character of the sentence is the purpose for which the speaker uses the sentence implies, and the word order may be broken depending on this purpose. Word order in spoken language almost depends on the will of the speaker and is free. But this freedom should not cause difficulty in understanding the idea

***Keywords*:** *sentencemembers, communicative function, transitive sentence, interrogative sentence, command sentence, exclamatory sentence*

## Giriş

Azərbaycan dilində sadə cümlələr müxtəlif prinsiplərə görə təsnif olunur. Təsnifat prinsiplərindən biri də məqsəd və intonasiyadır. Dili təşkil edən cümlələr danışanın məqsədinə görə bir-birindən fərqlənir və bu məqsədə müvafiq olaraq da intonasiyasından istifadə olunur. Danışan cümlədən hər hansı bir məlumatı, xəbəri vermək, informasiya almaq, öz xahiş, arzu, əmrini ifadə etmək, hiss və həyacanını bildirmək üçün istifadə edə bilər.

Azərbaycan dilçiliyində cümlənin məqsəd və intonasiyaya görə bölgüsündə fikir ayrılığı özünü göstərmişdir. Bəzi mənbələrdə cümlənin məqsəd və intonasiyaya görə təsnifatında nida cümlələri ayrıca növ kimi qəbul edilməyərək üç növ, bəzilərində isə dörd növ göstərilmişdir. Biz sonuncu təsnifatı əsas götürərək bu məqalədə cümlənin dörd növü: nəqli, sual, əmr və nida cümlələri üzərində söz sırasını nəzərdən keçirəcəyik.

Sintaktik vahid olan cümlənin aparıcı əlamətlərindən biri də intonasiyadır. İntonasiya nitqlə bağlı olan bir faktordur ki, onun yazıda göstəricisi durğu işarələridir. Bəzən ancaq bu durğu işarələri vasitəsilə biz cümlənin məqsəd və intonasiyaya görə növünü fərqləndirə bilirik. A.Qurbanov intonasiyanın cümlədə

rolu haqqında yazır: "Cümlənin əsas əlamətləri intonasiya, predikativlik, modallıq və s. keyfiyyətlərdən ibarətdir" (Qurbanov, 2019:164).

Cümlənin məqsəd intonasiyaya görə növləri quruluşuna, tərkibinə görə də fərqlənir. Ədəbi dildə hər bir cümlə növü sabit söz sırasına malik olur. Danışıq dilində söz sırasının sərbəstliyi, dəyişkənliyi cümlənin məqsəd və intonasiyasından asılı olaraq müxtəlif formada özünü göstərə bilər. Danışıq dilində söz sırası haqqında Q.Kazımov yazır: "Canlı danışıq dilində söz sırası normaları pozulmuş olsa da, nitqin ritmik, melodik axını, fasilə, vurğu fikrin düzgün başa düşülməsinə imkan yaradır" (Kazımov, 2007:164). Nəqli, sual, əmr, nida cümlələri inversiyanın tezliyinə, əhəmiyyətinə və yerdəyişmədən sonra cümlə üzvlərinin söz sırasındakı yerinə görə bir-birindən fərqlənir.

**1. Nəqli cümlələrdə söz sırası**

Cümlənin daha çox istifadə olunan növü nəqli cümlələrdir. Nəqli cümlələrin əsas kommunikativ funksiyası məlumat verməkdir. Bu cümlələrdə hər hansı bir əlamət, keyfiyyət, əşya, hərəkət haqqında məlumat verilir. Nəqli cümlələrin özlərinə məxsus intonasiyası vardır ki, bu nəqli intonasiya adlanır. Danışanın kommunikativ məqsədindən asılı olaraq nəqli intonasiyanın müxtəlif növləri meydana çıxır. A.Axundov nəqli intonasiyanın bu növlərini göstərmişdir: "Nəqli intonasiyanın xəbər vermə, elan etmə, söyləmə, nağıl etmə, replika, bildiriş, raport kimi kommunikativ növləri vardır. Bu növlər qrammatik və semantik amillərlə bağlıdır" (Axundov, 1984:299). Buradan belə aydın olur ki, cümlədə baş verən hər hansı bir dəyişiklik nəqli cümlənin intonasiyasının dəyişilməsinə səbəb olur. Qrammatik dayişikliklər sırasına cümlə üzvlərinin sırasının pozulması da daxildir və nəqli cümlədə söz sırasının pozulması bu və ya digər nəqli intonasiya növünün meydana çıxmasına şərait yaradır.

Nəqli cümlələrdə söz sırasının pozulması həm qrammatik, həm də aktual üzvlənmə baxımından müşahidə olunur. Məlumdur ki, danışıq dilində söz sırasının pozulması kommunikativ məqsədlə əlaqədardır. Yəni hər hansı bir cümlə üzvünün söz sırasındakı yeri danışanın ifadə etmək istədiyi fikirdə nə dərəcədə əhəmiyyətli rol oynamasından asılıdır. Danışan cümlədə ifadə olunan fikrin əsasını təşkil edən, əsas informasiya mərkəzi olan cümlə üzvünü çox vaxt cümlənin əvvəlinə gətirir, fikrin çatdırılmasında əhəmiyyətli rol oynamayan, ən az informasiya daşıyan cümlə üzvünü isə cümlənin sonunda işlədir. Cümlə üzvünün ifadə olunan fikirdə nə qədər əhəmiyyətli olması kontekstdən, situasiyadan asılı olur.

Azərbaycan dilində nəqli cümlələr quruluşuna görə fərqlənir. Burada sadə nəqli cümlədə söz sırasını nəqli cümlənin tərkibinə görə növləri: müxtəsər, geniş, şəxsiz, qeyri-müəyyən şəxsli, ümumi şəxsli, adlıq cümlə üzərində nəzərdən keçirmək məqsədəuyğundur.

Müxtəsər cümlələr baş üzvlərdən ibarət olduğu üçün söz sırası xəbərin cümlənin əvvəlinə keçməsi ilə pozulur:

*Bitdi havayı gəzmək (İ.Əfəndiyev).*
*Qızılmış sənin əllərin (Elçin).*
*Mənim yadımdadı atanın ondan borc istəməkliyi (C.Məmmədquluzadə).*
*Mehtər Qulunun oğluyam mən (M.Süleymanlı).*

Geniş cümlələrdə bütün cümlə üzvləri iştirak etdiyinə görə söz sırasının pozulmasının müxtəlif formaları meydana çıxır:

*Şeytanın nağılını danış sən mənimçün (M.Süleymanlı).*
*Muxtar elə bu vaxt çıxdı binadan (Anar).*
*Birtəhər əllərimi qopartdım həmşərimin əlindən (C.Məmmədquluzadə).*
*Yazıq Kübranın ürəyi nisgillidi uşaq sarıdan (Elçin).*

Bu geniş cümlələrdə inversiyanın müxtəlif versiyalarını görə bilərik: birinci cümlədə mübtəda və tamamlıq xəbərdən sonra işlənərək, ikinci cümlədə yer zərfliyi xəbərdən sonraya keçərək, üçüncü cümlədə tərzi-hərəkət zərfliyi və tamamlıq yerini dəyişərək, dördüncü cümlədə isə səbəb zərfliyi xəbərdən sonra gələrək söz sırasını pozmuşdur.

Cüttərkibli cümlələrə nisbətən təktərkibli cümlələrdə söz sırası təsadüfi hallarda pozulur:

*Bu gün mütləq yoxlayacaqlar yuxarıdan (M.Süleymanlı).*
*Onu aparacaqlar harasa (M.Süleymanlı).*
*İki aya təhvil verəcəklər məktəbi (Anar).*
*Telefona çağırırlar məni (Elçin).*

Yuxarıdakı qeyri-müəyyən şəxli cümlələrdə söz sırası müxtəlif şəkildə pozulmuşdur. Birinci və ikinci cümlədə yer zərfliyi, üçüncü, dördüncü cümlədə isə tamamlıq xəbərdən sonra işlənərək inversiya yaradıb:
*On ikinin yarısıdır burda (Anar).*
*Mənim yazığım gəlir sənin gününə (C.Məmmədquluzadə).*
*Zəhləm gedir bu otaqdan (Elçin).*
*Sənə dəxli yoxdu bunun (Elçin).*

Bu şəxsiz cümlələrdə də tamamlıq və ya yer zərfliyinin yerdəyişməsi ilə söz sırası pozulub:
*Çörəyi ver çörəkçiyə bir çörək də üstəlik* (Atalar sözü).
*Sözü bir dəfə deyərlər adama (C.Məmmədquluzadə).*
*Yorğan döşəyin yaxşısını qonağa saxlayarlar biz tərəflərdə (M.Süleymanlı).*

Verilmiş şəxssiz cümlələlərdə müxtəlif cümlə üzvləri öz yerlərində işlənməyərək inversiya əmələ gətirib.

Təktərkibli cümlələrdə söz sırasından bəhs edərkən Ə.Cavadov yazır: "Təktərkibli cümlələrdə söz sırası xüsusi əhəmiyyətə malikdir. Çünki təktərkibli cümlələrdə sözlərin sıralanması cümlənin formalaşmasında əsas rol oynayır. Təktərkibli cümləyə məxsus sıranın dəyişdirilməsi, ümumiyyətlə, təktərkibli cümlə quruluşunun dəyişdirilməsi, onun cüttərkibliyə keçməsi deməkdir" (Cavadov, 1977:84). Yuxarıda verilən nümunələr bu fikirləri doğrultmur. Cünki həmin nümunələrdə söz sırası pozulduğu halda təktərkibli cümlələrin nə məzmunu, nə də forması dəyişməyib.

**2. Sual cümlələrində söz sırası**

Sual cümlələri istifadə tezliyinə görə nəqli cümlələrdən sonra ikinci yeri tutur. Danışan sual cümləsindən hər hansı bir məlumatı öyrənmək, dəqiqləşdirmək, öz münasibətini bildirmək və qismən də hiss-həyacanını ifadə etmək üçün istifadə edir.

Azərbaycan dilində sual cümlələrinin özünəməxsus sintaktik quruluşu yoxdur. Sintaktik quruluş dedikdə burada, ilk növbədə, söz sırası nəzərdə tutulur ki, sual cümlələrində söz sırası digər cümlələrdən fərqlənmir. Dilçilikdə sual cümlələri məzmununa və yaranma yoluna görə növlərə bölünür. Burada yaranma yoluna görə sual cümlənin növləri: sual intonasiyası ilə əmələ gələn sual cümlələri, sual ədatı ilə əmələ gələn sual cümlələri, sual əvəzlikləri ilə əmələ gələn sual cümlələri üzərində söz sırasını nəzərdən keçirək.

İntonasiya vasitəsilə əmələ gələn sual cümlələrini nəqli cümlədən fərqləndirən sual intonasiyasıdır. İntonasiyanın rolu haqqında B.Xəlilovun fikri belədir: "İntonasiyanın cümlələrdə yaratdığı emosional münasibətləri digər formal qrammatik vasitələr yarada bilməz (Xəlilov, 2017:77). Yazıda isə sual işarəsi vasitəsilə nəqli cümlədən seçilir. Yəni bu sual cümlələrinin heç bir qrammatik göstəricisi olmur. Söz sırası, əlaqə vasitələri olduğu kimi qalır. Digər cümlə növlərində olduğu kimi danışıq dilində bu tip sual cümlələrində də cümlə üzvləri müxtəlif formada yerlərini dəyişərək söz sırasını pozur:
*Həmin Lalədir bu? (S.Qədirzadə)*
*Yoldaş olmuşuq biz? (Elçin)*
*Sizin qəti cavabınızdır bu? (İ.Əfəndiyev)*
*İşləyir radio? (Anar)*

Yuxarıda verilmiş müxtəsər sual cümlələrində söz sırası pozulub.
*Başa düşürsüz məni? (S.Qədirzadə)*
*Qalxmaq olar yuxarı? (Elçin)*
*Şəhərdən bura gəlmisən ev dağıtmağa? (İ.Əfəndiyev)*
*Sizi atam çağırtdırmışdı axşam? (İ.Hüseynov)*
*Zavod sənə bir şey verdi barmağın kəsiləndən sonra? (Y.Çəmənzəminli)*

Bu sual cümlələrinin bəzilərində tamamlığın, bəzilərində isə zərfliyin müxtəlif məna növlərinin xəbərdən sonra gəlməsi söz sırasını pozmuşdur.

Sual cümlələrinin digər növündə sözlərdən biri ədatla işlənərək sual cümləsi əmələ gətirir. Bu cümlələrin də spesifik qrammatik quruluşu, söz sırası yoxdur. Sual ədatı ilə əmələ gələn sual cümlələrində də söz sırası danışıqda pozula bilər:
*Gördünmü arvadının vəfasını? (Ə.Haqverdiyev)*
*Küləkmi qovmuşdu onu? (G.Hüseynoğlu)*
*Süd tökümmü çayınıza? (İ.Əfəndiyev)*

*Üç gündən sonramı gedəcəksən Bakıya? (S.Qədirzadə)*
*Mənə acığın tutdumu o gün? (Y.V.Çəmənzəminli)*

Yuxarıda verilmiş sual cümlələrində cümlə üzvləri müxtəlif formalarda yerlərini dəyişərək söz sırasını pozmuşlar.

Sual cümlələrinin ən geniş yayılmış növü sual əvəzlikləri vasitəsilə əmələ gələn sual cümləələridir. Sual cümləsinin bu növündə sual əvəzliyi bu və ya digər cümlə üzvünün yerində işlənir və həmun cümlə üzvünə aid məlumat əldə etmək üçün istifadə edilir. Sual əvəzlikləri yerində işləndikləri cümlə üzvünün bütün qrammatik xüsusiyyətlərini, o cümlədən, söz sırasındakı yerini özündə əks etdirir. O.Musayev sual əvəzliklərinin yeri haqqında yazır: "Azərbaycan dilində sual əvəzliyinin yeri həmişə bilavasitə xəbərdən əvvəl durur. Bu hər şeydən əvvəl onunla izah olunur ki, sual cümlələrində sual əvəzlikləri həmişə qüvvətli vurğu altında olur. Dilimizdə ən qüvvətli vurğuya malik olan yer isə xəbərdən əvvəlki yerdir" (Musayev, 1960:59).

Burada deyilən fikri daha çox danışıq dilinə aid etmək olar. Ədəbi dildə söz sırası sabit olduğu üçün sual əvəzliyi də əvəz etdiyi cümlə üzvünün yerində işlənməlidir. Danışıq dilində isə başqa cümlə növlərində olduğu kimi sual cümləsinin bu növündə də söz sırası sərbəst və dəyişkən ola bilər. Bu zaman sual cümləsinin məzmunu dəyişmir.

F.Ağayeva danışıq dilində sual əvəzliyinin yeri ilə əlaqədar qazandığı məzmun haqqında belə bir fikir irəli sürmüşdür: "Bəzi sual əvəzlikləri nitqdə sual məzmunu ilə yanaşı digər emosional-ekspressiv çalarlıqlar da ifadə edir. Özü də cümlənin sonunda gəlməklə onların emosionallığını qüvvətləndirir: Bunu bilməyən kimdir? Oxumaq nədir? Bəyəndiyin nədir, bəyənmədiyin nədir?" (Ağayeva, 1987:22). Müəllif verdiyi bu nümunələrdə sual əvəzliyi xəbərin yerində işləndiyi üçün cümlənin sonunda gəlməsi çox təbiidir. Başqa cümlə üzvü yerində işlənən sual əvəzliyinin cümlənin sonunda işlənməsi halına demək olar ki, rast gəlinmir.

*Nədi onun dərdi? (İ.Hüseynov)*
*Nə etmişəm mən ona? (İ.Əfəndiyev)*
*Kimdi sənin razılığını soruşan? (Ə.Haqverdiyev)*
*Kimdi bu gecə vaxtı piano çalan? (Anar)*
*Kimdi oğru İmaşla bir yerdə işləmək istəyən? (Elçin)*

Verilmiş nümunələrdə xəbərin yerində işləyən sual əvəzliyi cümlənin əvvəlinə keçərək söz sırasını pozur.

Sual əvəzlikləri vasitəsilə əmələ gələn sual cümlələrində hər hansı bir cümlə üzvünü əvəz edən sual əvəzliyi əvəz etdiyi cümlə üzvünün sabit yerində işlənsə də, başqa cümlə yerini dəyişərək söz sırasını poza bilər:

*Kimə lazımdı bu ziyarət? (Anar)*
*Hansı mahnını oxuyacaq Səriyyə? (İ.Əfəndiyev)*
*Nə təhər başa düşək bunu? (İ.Hüseynov)*
*Bəs mənə indiyəcən niyə deməmisən bunu? (G.Hüseynoğlu)*
*Qəndi neçəyə verəcəksən mənə? (C.Məmmədquluzadə)*
*Haçan gedirsən əsgərliyə? (Elçin)*
*Niyə dalğınsan bu gün? (S.Qədirzadə)*

Yuxarıda verilmiş sual cümlələrində sual əvəzliyi əvəz etdiyi cümlənin yerində işlənsə də digər cümlə üzvləri: mübtəda, tamamlıq, yer və zaman zərflikləri müvafiq sabit yerlərində işlənməyərək inversiya yaradıblar.

**3. Əmr cümlələrində söz sırası**

Əmr cümləsinin adına əsaslanaraq bu nəticəyə gəlmək olmaz ki, bu cümlələr ancaq əmr məzmunu daşıyır. Bu cümlələr əmr məzmunu ilə yanaşı, təkid, arzu, yalvarış, xahiş, nəsihət məzmunu da daşıyır. Həmin bu məna çalarlıqları heç bir qrammatik göstərici olmadan yalnız intonasiya vasitəsilə bir-birindən seçilir. Z.Budaqova əmr cümlələrinin məna çalarlıqlarında olan intonasiya fərqini belə qeyd etmişdir: "Təkid ifadə edən əmr cümlələri: məsləhət, öyüd, nəsihət, xahiş bildirən əmr cümlələri nisbətən aşağı intonasiya ilə tələffüz olunur" (Budaqova, 1963:194).

Başqa cümlə növlərində olduğu kimi ədəbi dildə əmr cümlələrində söz sırası sabit, danışıq dilində isə sərbəst olur. Əmr cümlələrində söz sırasının pozulması xəbərin cümlənin əvvəlinə keçməsi ilə meydana

çıxır. Bu cümlələrdə əksər vaxtlarda mübtəda olmur və cümlədə emosionallıq yüksək olur. C.Əfəndiyev əmr cümlələrində söz sırası haqqında yazır: "Əmr cümlələrinin xəbəri çox vaxt felin əmr şəklinin bütün şəxs və kəmiyyətlərində işlənə bilir .Belə xəbərlər, adətən, cümlənin sonunda yerləşir. Lakin bəzən verilən hökmün daha kəskin, daha qüvvətli olmasını bildirmək üçün o, cümlənin əvvəlinə keçirilir" (Əfəndiyev, 1985:104). Əmr cümlələrində söz sırasının pozulması daha çox xəbəri birinci şəxsin təkində işlənən əmr cümlələrində özünü göstərir:

*Al quzunun pulunu (C.Məmmədquluzadə).*
*Çək mənim şəklimi burda (Anar).*
*Yandır işığı (S.Qədirzadə).*
*Dınqıldat bir az o pianinonu (İ.Əfəndiyev).*

Xəbəri başqa şəxslərdə olan əmr cümlələrində də söz sırası pozularaq xəbər cümlənin əvvəlinə keçə bilər:

*Bölək heykəli iki yerə (S.Qədirzadə).*
*Odlayın bu quldurların yuvasını (Elçin).*
*Qoyun hər şeyi bir tərəfə (İ.Əfəndiyev).*
*Qurban olsun sənə xalan (C.Məmmədquluzadə).*

Əmr cümlələrində söz sırasının pozulması xəbərin yerdəyişməsi ilə məhdudlaşmır, digər cümlə üzvlərinin yerdəyişməsi hallarına da rast gəlinir:

*Bir də qapı bacaya çağırma onu (İ.Hüseynov).*
*Bunu verərsən sizin qalavaya (C.Məmmədquluzadə).*
*Bu saat neçə gədə ilə gedərsən qaya başına (Ə.Haqverdiyev).*
*Televizora baxın ha bu axşam (Anar).*
*Mənə məktub yaz tez-tez (S.Qədirzadə).*

**4. Nida cümlələrində söz sırası**

Nida cümlələrinin əsas kommunikativ funksiyası danışanın hiss və həyacanını ifadə etməsidir. Y.Seyidov nida cümlələrinin semantikası haqqında yazır: "Nida cümlələri həm danışanın emosional duyğu və həyacalarını, həm də onun başqa şəxs və əşyalara olan emosional əqli münasibətlərini ifadə edə bilir" (Seyidov, 2007:110).

Nida cümlələri nəqli, sual, əmr cümlələri əsasında yaranır və əsas göstəricisi nida intonasiyasıdır. Nidalar, sual əvəzlikləri, xitablar nida cümlələrinin formalaşmasında müəyyən rol oynayır. Nida cümlələrinin yaranma amillərindən biri də söz sırasının pozulmasıdır. Bu barədə F.Əlizadənin fikri belədir: "Söz sırası rəngarəng emosiyaların ifadə vasitəsidir. Bir qayda olaraq emosiyalar sözlərin tərs sırası ilə verilir" (Əlizadə, 1998:69). Nida cümlələrinin əsas vəzifəsi emosianallıq yaratmaq olduğu üçün söz sırasının pozulması təbiidir. Xəbəri felin əmr şəklində olan nida cümlələrində inversiya daha çox müşahidə olunur. Bu haqda R.Xəlilov yazır: "Xəbəri felin əmr şəkli ilə ifadə olunan bir sıra nida cümlələrində xəbər cümlənin əvvəlində, mübtəda isə sonunda gəlir. Bu halda nitqdə ifadəlilik daha da artır, qüvvətlənir, güclü emosionallıq özünü göstərir" (Xəlilov, 1970:288):

*Al bu da sənin girovun! (Ə.Haqverdiyev)*
*Yansın ciyəri qiyamətəcən! (Elçin)*
*Batsın bu zəngin həyat! (Y.V.Çəmənzəminli)*
*And olsun bizim dostluğumuza! (Cəlil Məmmədquluzadə)*
*Eşq olsun əqilli insanlara! (İ.Əfəndiyev)*
*Eh, cəhənnəm olsun hamısı! (C.Cabbarlı)*
*Vay, üstü açılacaq yalanın! (M.Süleymanlı)*
*Pah atonan, əjdaha imiş bu! (Anar)*

## Nəticə

Cümlənin məqsəd və intonasiyaya görə bütün növlərində danışıq dilində söz sırası pozula bilər. Əlbəttə, bu inversiyalar kontekst və situasiyadan asılıdır. Cümlə növlərinin hər birində söz sırasının pozulması müxtəlif kommunikativ məqsəddən asılı olaraq fərqli şəkillərdə özünü göstərir. Kommunikativ xarakter dedikdə, cümlədən hansı məqsədlə istifadə olunması nəzərdə tutulur. Belə ki, cümlənin bir qismində danışan müəyyən bir əşya və hadisə haqqında məlumat verir, bir qismində hər hansı əşya, hadisə

haqqında məlumat almaq istəyir, digər qismində öz əmr, xahiş və arzusunu, yaxud da hiss-həyəcan və emosiyalarını ifadə edir. Sadalanan bu kommunikativ məqsədlər söz sırası vasitəsilə əks olunur. Azərbaycan dilində sözlər məhz kommunikativ yükündən asılı olaraq cümlədə müəyyən mövqe tutur. Söz sırasının əsas funksiyalarlndan olan kommunikativ funksiyaya görə cümlənin məqsəd və intonasiyaya görə növləri formalaşır. Nəqli cümlələrdə ifadə olunan informasiyanı daha tez çatdırmaq, sual cümləsində məlumatı daha dəqiq öyrənmək, əmr cümləsində təsir gücünü artırmaq, nida cümlələrində isə emosionallığı qüvvətləndirmək məqsədi ilə söz sırası pozula bilər. Ancaq söz sırasının pozulması fikrin çatdırılmasına xələl gətirməməlidir.

**Ədəbiyyat**

1. Qurbanov, A. (2019). Müasir ümumi dilçilik (l cild). Bakı: AMEA, 488 s.
2. Kazımov, Q. (2007). Müasir Azərbaycan dili. Sintaksis. Bakı: Təhsil, 468 s.
3. Axundov, A. (1984). Azərbaycan dilinin fonetikası. Bakı: Maarif, 388 s.
4. Cavadov, Ə. (1977). Müasir Azərbaycan ədəbi dilində sintaktik vahidlərin sırası. Bakı: Elm,127 s.
5. Xəlilov, B. (2017). Müasir Azərbaycan dili (sintaksis). Bakı: Adiloğlu, 418 s.
6. Musayev, O. (1960). İngilis və Azərbaycan dili cümlələrində söz sırası. Bakı: Azərtədris, 81 s.
7. Ağayeva, F. (1987). Azərbaycan danışıq dili. Bakı: Maarif, 192 s.
8. Budaqova, Z. (1963). Müasir Azərbaycan dilində sadə cümlə. Bakı: ASSR Elmlər Akademiyası, 217 s.
9. Əfəndiyev, C. (1953). Azərbaycan dilinun qrammatikası (ll hissə, sintaksis). Bakı: ASSREA, 344 s.
10. Seyidov, Y., Abdullayev, Ə., Həsənov, A. (2007). Müasir Azərbaycan dili. Sintaksis. Bakı: Şərq-Qərb, 424 s.
11. Əlizadə, F. (1998). Cümlənin aktual üzvlənməsi. Bakı: Elm, 125 s.
12. Xəlilov, R. (1970). Azərbaycan bədii dilin üslubiyyatı. Bakı: Maarif, 350 s.

**Rəyçi: fil.ü.f.d. Vəfa Yunusova**

Göndərildi: 10.07.2022 Qəbul edildi: 30.09.2022

DOI: https://doi.org/10.36719/2663-4619/83/61-66

**Mələk Anday Rifat qızı Tolunay**
Bakı Dövlət Universiteti
doktorant
andaytolunay@gmail.com

# POSTPARTRUM DÖVRDƏ AŞKARLANAN CİNSİ DİSFUNKSİYALARIN QADININ PSİXOLOGİYASINA TƏSİRİ

## Xülasə

Həyatın müxtəlif dövrlərində cinsi həyatda bəzi eniş-yoxuşlar və normal dalğalanmalar ola bilər. Hamiləlik və doğuşdan sonrakı dövr, yetkinlik və menopoz da daxil olmaqla, qadının bütün həyat mərhələlərinin cinsi cəhətdən ən durğun dövrüdür. Bu dövrdə cütlük valideynlik rollarına uyğunlaşır və doğuşdan sonra cinsi fəaliyyətlərinə davam edir. Doğuşdan əvvəl yaşanan problemlər unudulur, lakin özünəməxsus problemlərin və stresin olduğu bir dövrdür. Doğuşdan sonrakı qadının həyatında onun cinsi ehtiyaclarını dəyişdirəcək və münasibətlərinə təsir edəcək bir çox vəziyyət yaranır. Hormonal dəyişikliklər, laktasiya dövrü, doğuş şəkli, doğuş travmaları, körpəyə aid problemlər, enerji səviyyəsi, bədən görünüşü, cinsi münasibətlər, sosial rol dəyişikliyinə uyğunlaşma, ər-arvad münasibətləri kimi bir çox fiziki, zehni və sosial dəyişikliklər qadınların cinsi sağlamlığına və davranışlarına təsir göstərir.

***Açar sözlər***: *cinsi disfunksiya, Postpartum psixologiya, seksuallıq, vaginizm, hamiləlik sonrası depressiya, Lohusalık kədəri*

**Melek Anday Rifat Tolunay**

# The influence of sexual dysfunctions detected in the postpartum period on the psychology of women

## Abstract

There may be some ups and downs and normal fluctuations in sex life at different times of life. Pregnancy and the postpartum period are the most sexually stagnant of all the stages of a woman's life, including puberty and menopause. During this period, the couple adjusts to their parenting roles and resumes sexual activity after childbirth. Problems experienced before birth are forgotten, but it is a period with its own problems and stress. Many situations arise in the life of a postpartum woman that will change her sexual needs and affect her relationships. Many physical, mental and social changes such as hormonal changes, lactation period, birth pattern, birth trauma, baby related problems, energy level, body image, sexual relations, adjustment to social role change, spousal relationship affect women's sexual health and behavior. shows.

***Keywords:*** *sexual dysfunction, Postpartum psychology, sexuality, vaginismus, post pregnancy depression, Postpartum blues*

## Giriş

Vaginismus vagina: (qılıf) və ismus: (hərəkət) sözlərinin birləşməsindən formalaşmış, ağrı qorxu ilə birləşdikdə cinsi əlaqənin mümkün olmadığı və ya çox ağrılı olduğu pozğunluğu təsvir edir. Təkcə cinsi əlaqə zamanı deyil, barmaq, tampon və ya ginekoloji müayinə zamanı istifadə olunan spekulum üçün oxşar maneələr vardır. Bundan əlavə, vajinismus vajinaya daxil olan bir cismin və ya cinsiyyət orqanının təsəvvürü (təxəyyülü) zamanı da baş verə bilər. Cinsi fəaliyyətlə əlaqəli ağrı və qorxu nəticəsində şərti cavab kimi də ifadə etmək olar. Bu vəziyyətdən əziyyət çəkən qadınlar üçün cinsi əlaqə cəhdləri zamanı baş verən şiddətli fiziki ağrı ilə yanaşı, şiddətli ruhi ağrılara səbəb olan ciddi problemdir (Doghan, Ozkorumak, 2008:135-142). Vaginizm, vaginaya daxil olmaqla əlaqəli fobiya səviyyəsində bir qorxu və müşayiət edən vaginanın aşağı 1/3 hissəsində pubo-koksigeal və yaxın əzələlərin (sfinkter vajina və levator ani) qeyri-ixtiyari sıxılmağı ilə müşayiət olunan qorxudan ibarətdir. Çox vaxt bu simptomlar qaşınma ilə müşayiət olunur (Mahler, Cham, Bergman, 2012). Spazm, fobiya və qaşınma bir-birini

dəstəkləyən dövrəyə gətirib çıxarır. Salerno Trotula 1547-ci ildə yazdığı "Ginekologiya" dissertasiyasında indi vaginizm adı verdiyimiz statusu "bir qadının cinsi olaraq qıcıqlandırılmasına baxmayaraq bakirə kimi qalmasına səbəb olacaq şəkildə vulvasının daralmağı" kimi ifadə etmişdir (Cunningham, Gant, Leveno, Gilstrap, Hauth, Wenstrom, 2010:1420-32). Sonradan amerikalı ginekolog J.Marion Sims XIX əsrdə "fizioloji oyanmanın artması ilə vaginal sfinkterin spazmodik sıxılması" tərifini vermişdir. Sims tərəfindən ilk dəfə 1861-ci ildə "vaginizm" anlayışı müəyyən edilmişdir. Sims, vaginizm mövzusunda demişdir: "Araşdırmalarıma əsasən, evlilik münasibətində hər iki tərəf üçün bu qədər bədbəxtlik yaradan başqa bir xəstəlik tanımıram. Ancaq deyə bilərəm ki, asan, etibarlı və qəti şəkildə müalicə oluna bilən xəstəlikdir". Valtard, Simsin cinsi orqanlara xas olaraq xarakterizə etdiyi həssaslıq anlayışını şübhə altına aldı və vaginal əzələ spazmının ağrı duyğusuna qarşı "fobik cavab" olduğu fikrini müdafiə etdi. Bu səbəbdən vaginizmin müalicəsində cərrahiyyə və ya genişləndirici tətbiqlərdən daha çox "cinsi tərbiyə" və "psixoterapiya" yanaşmalarının əhəmiyyətli olduğunu vurğuladı. DSM-IV-də vaginizm spesifik qadın cinsi disfunksiyası kimi təsnif edilmiş və cinsi ağrı pozuqluqları alt kateqoriyasına daxil edilmişdir.

Müvafiq olaraq, vaginizmin əsas diaqnostik meyarları aşağıdakılardır (APA 2000):

1. Vaginanın xarici üçdə birinin əzələlərində cinsi əlaqənin (koitus) qarşısını alacaq şəkildə, təkrarlanan və ya davamlı qeyri-iradi sıxılmağın olmağıdır;
2. Bu pozuqluq nəzərə çarpacaq narahatlıq və ya şəxsiyyətlərarası münasibətlərdə çətinliklər yaradır;
3. Bu pozuqluq başqa bir eksen1 pozuqluqla daha yaxşı izah olunmur (məs. somatizasiya pozğunluğu) və sadəcə ümumi tibbi vəziyyətin birbaşa fizioloji təsirlərinə bağlı deyildir.

Bu tərifə əlavə olaraq, DSM-IV-də həmçinin; bütün ilkin cinsi disfunksiyaların alt növləri müəyyən edilir: əgər problem, fərdin ilk cinsi təcrübəsindən etibarən baş verirsə ilkin (ömür boyu), vaginizm söz edilir.

İkinci dərəcəli (qazanılmış) vaginizmdə fərdin cinsi həyatında heç bir əlamətin olmadığı qənaətbəxş bir dövr vardır və problem sonradan yaranır.

Situativ (qismən) vaginizmdə problem müəyyən mühitlərdə meydana gəldiyi halda, digər mühitlərdə baş vermir. Əgər cinsi problem, mühitindən asılı olmayaraq və hər hansı cinsi fəaliyyət zamanı baş verirsə, buna diffuz (total) vaginizm deyilir. DSM-IV vaginizmin diaqnostik meyarları B, C ve vaginizmin alt tipləri bütün digər cinsi disfunksiyalara da aiddir. Bu baxımdan vaginizmin yeganə diferensial diaqnozu cinsi əlaqənin qarşısını alan vaginal sıxılma meyarıdır.

Sübut edilmiş tək bir etioloji faktor olmasa da, müxtəlif səbəblər araşdırılmışdır. Bu səbəblər fiziki və ya psixoloji səbəblər kimi təsnif edilə bilər.

Vaginizmin mümkün somatik səbəbləri ilə bağlı; vaginal atrofiya və bununla əlaqədar adezyonlar, vaginal əməliyyat və ya intravaginal şüalanma, uterus prolapsiyası, vulvar vestibülit sindromu (VVS), endometriyozis, infeksiyalar, vaginal lezyon və şişlər, cinsi yolla keçən xəstəliklər və pelvik qan təzyiqi anormallikləri daxildir (Abdool, Thakar, Sultan, 2009:133-137). Lakin bu sadalanan səbəblərin klinikada müşahidə olunan hallar nəzərə alındıqda onların etiologiyaya töhfəsi məhdud görünür.

Psixoanalitik yanaşma vaginizmin etiologiyasını izah etmək üçün digər fərziyyələrdən fərqli olaraq şüuraltı münaqişələrin mərkəzində tez-tez, cinsi münasibətdən zərərgörmə qorxusu ilə qarşı cinsə, yəni kişiyə qarşı qısqanclıq və düşmənçilik düşüncələrinin olduğu qeydə alınır.

Vaginizm bəzən qadının statusuna, şəxsiyyətinə, kişiyə və cütlüyə aid olan amillərlə əlaqəli ola bilər. Qadının yoldaşı ilə bir yerdə olmaq istəməməsi, münasibət qurmağa çalışdıqları mühitdə özünü rahat hiss etməməyi, ailədaxili problemlərin olmağı və ya partnyoruna qarşı gizli qəzəb hissi yaranması bu vəziyyətin ən çox görülən səbəblərindən biridir.

Qadınlarda doğuşdan sonrakı dövrdə də cinsi disfunksiyalar müşahidə olunur. Doğuşdan sonrakı dövrdə doğuşun bitməsi və laktasiyanın başlanğıcı ilə anada mühüm anatomik, fizioloji və endokrinoloji dəyişikliklər baş verir. Bundan əlavə, doğuşdan sonrakı dövrdə ailəyə yeni üzv daxil olması ilə əlaqədar ailədə yeni nizam yaranır. Ana bu yeni nizama, analıq roluna və bədən imicindəki dəyişikliklərə uyğunlaşmaqda çətinlik çəkə bilər. Doğuşdan sonrakı dövrdə cinsi əlaqəyə başlama vaxtı qadının fiziki bərpasından və hər iki tərəfdaşın psixoloji hazırlığından asılıdır. İkinci həftədən sonra qanaxma və infeksiya riski azaldıqda cinsi fəaliyyətə başlamaq olar. Doğuşdan sonra cinsi əlaqənin bərpası mədəniyyətə görə dəyişir. Doğuşdan sonrakı dövrdə qadınlarda baş verən fizioloji, endokrinoloji və

psixoloji dəyişikliklər qadınların cinsi həyatına təsir edə bilər. Reproduktiv orqanlarda travma, vaginal qanaxmanın olması, yeni doğulmuş körpənin stress və təzyiqi, fiziki narahatlıq, infeksiya qorxusu, döşlərin dolğunluğu, yorğunluq, cinsi istəyin azalması, cazibə hisslərinin azalması və bədən imicinin dəyişməsi cinsi funksiyaları dəyişə bilər.

Bundan əlavə, bir çox qadın doğumdan sonrakı dövrdə plasentanın çıxarılmasından sonra estrogen səviyyəsinin dəyişməsi və vaginal sürüşkənliyin azalması səbəbindən cinsi əlaqə zamanı ağrı (disparanoiya) yaşayır. Doğuşdan sonrakı dövrdə cinsi əlaqə ilə bağlı narahatlıq orta hesabla 3 ay (1-11 ay) davam edə bilər. Thompson və digərlərinin (2002) doğuşdan sonra 6-cı aylarında olan 1193 qadınla apardıqları araşdırmada qadınların 20,0%-nin cinsi problemləri olduğu bildirilmişdir.

Vaginal doğuşdan sonra vagina boş və ödəmli olur, əzələ tonusu azalır. Estrogen çatışmazlığı səbəbindən vaginal selikli qişa nazikdir və rugeas yoxdur. Doğuşdan sonra altıncı-səkkizinci həftələrdə vagina normala qayıdır. Bu dövrdə vaginanın həcmi azalır və vagina əzələ tonusunu bərpa edir. Normal doğuşdan təxminən üç-dörd həftə sonra yenidən əmələ gəlir, vaginanın ödəmi və vaskulyarlığı azalır. Amma normal doğuş etməyən qadında olduğu kimi qabarıq deyil və əksəriyyəti yastılaşmışdır. Süd verən qadınlarda menstruasiya bərpa olunana qədər vaginal mukoza atrofik qalır. Qadınların cinsi funksiyalarında mühüm rol oynayan estrogenin doğuşdan sonra aşağı səviyyədə olmağı (50 pg/ml) simpatik və parasimpatik sinirlərin həssaslığını azaldır. Bu zaman vaginal divar qalınlığı daha incələşir, daha tez zədələnir və vaginal mühit daha az asidik olur. Bütün bu dəyişikliklər nəticəsində vaginal quruluq və disparanoiya inkişaf edir. Disparanoiya yumurtalıq funksiyaları və menstruasiya yenidən başlayana qədər davam edə bilər .

Doğuşdan sonrakı qadınların perineal sahəsi epizyotomiya və ya sağalmış yaralar ola bilər. Ölkəmizdə epiziotomiyadan tez-tez istifadə olunur. Təbii doğuş edən qadınların 64,0%-nə (ilk doğuşların 95,0%-nə, ikinci doğuşların 48,0%-nə və üç və ya daha çox doğuşların 12,0%-nə) epiziotomiya edildiyi bildirilir. ABŞ-da təbii doğuş edən qadınların 13,2%-nə epiziotomiya (birinci doğuşların 19,2%-nə, çoxlu doğuşu olan qadınlar 8,7%-nə) həyata keçirildiyi bildirilir. Epiziotomiya yerində ilkin yara sağalması iki-üç həftə ərzində baş verir. Bu bölgənin tam sağalması üçün təxminən dörd-altı həftə vaxt lazımdır (Mert, Erberk, 2011:85-93). Bir araşdırmada, epiziotomiya ilə tebii yolla doğuş edən qadınların epiziotomiya olmayanlara nisbətən daha çox cinsi problem yaşadıqları bildirildi (Lydon-Rochelle, Holt, Martin, 2001:232-240). Doğuş zamanı perineal travma və ya epiziotomiya həyata keçirilməsi, qadınlarda qısa və uzunmüddətli morbidlik ilə əlaqələndirilir. Perineal travmalar sidik ifrazı və sidiyin saxlanmaması, disparanoiya və davamlı perineal ağrı ilə nəticələnə bilər (Okumuş, Mete, 2009:55-56). Signorello (2001) müxtəlif dərəcəli perine travması olan primipar qadınlar arasında, perine zədələnməsinə təsir edən şərtlər doğuşdan sonrakı cinsi həyata (disparanoiya, cinsi əlaqəyə yenidən başlamaq vaxtı, cinsi istək, məmnuniyyət və orqazm potensialı) təsirini araşdırmaq üçün görülən işdə perineal zədəsi olan və olmayan qadınların əksəriyyətinin disparanoiya yaşadığını müəyyən etdi. Bununla belə, onlar bu nisbətin daha çox perineal laserasiya olan qrupda daha yüksək olduğunu müəyyən etdilər. Goetsch (2000) işində isə təbii doğuş edən qadınların 42,0%-da keysəriyyə ilə doğuş edənlər 29,0%-da doğuşdan sonra disparanoiya yaranıb. Uşaqlıq və vaginanın dəstəkləyici strukturları doğuş zamanı zədələnə bilər və sonrakı dövrdə ginekoloji və cinsi problemlərin inkişafına səbəb ola bilər. Doğuş zamanı çanaq döşəməsinin cırılmış dəstəkləyici toxumalarını yenidən köhnə tonusunu bərpa etmək üçün altı ay lazımdır. Doğuşdan sonra qadınlar sağalmanı sürətləndirən və perine əzələlərini gücləndirən Kegel məşqlərini etməyə təşviq edilməlidir. Perineal əzələlərin gücləndirilməsi doğuşdan sonrakı cinsi problemlərin qarşısını ala. Baytur (2005) pelvik əzələ dəstəyinin doğuşdan sonrakı cinsi problemlərə təsirini araşdırdı. Bu araşdırmada vaginal doğum edən qadınların çanaq əzələlərinin keysəriyyə ilə doğum edən qadınlara nisbətən daha zəif olduğu və cinsi funksiya skorlarında əhəmiyyətli fərq olduğu bildirildi. Signorello (2001) vaginal doğuşda birinci dərəcəli perineal laserasiyası olan qadınların daha yaxşı cinsi funksiyalara sahib olduğunu, daha asan orqazm olduğunu və cinsi əlaqə zamanı daha az ağrı hiss etdiklərini aşkar etdi.

Doğuş sonrası cinsi disfunksiyanın formalaşmasında və qadının psixi problemlər yaşamağına doğuş şəklindən başqa təsir göstərən amillər də mövcuddur. Bunlardan biri qadının doğuş sonrası bədən şəklidir.

Bədən şəkli (imic) fərdin öz bədənini qavraması və zehnində təsəvvür etdiyi şəkil kimi müəyyən edilir. Başqa bir tərifə görə, bədən görüntüsü insanın öz bədəninin hissələrinə və onların funksiyalarına qarşı müsbət və mənfi hisslərinin qiymətləndirilməsidir. Bədən obrazı bədənlə bağlı bütün köhnə və yeni

hisslər, münasibət və qavrayışlardan ibarətdir. Bir insanın şəxsiyyəti, dəyərləri, digər insanlarla münasibətləri və fərdi düşüncələri bədən imicini formalaşdırır. Bədən imici fərdin öz və başqalarının nöqteyi-nəzərindən, eləcə də fərdin öz qavrayışından təsirlənir və dəyişə bilər. Bədən imicinin formalaşması böyümə və inkişaf prosesində illər çəkir və dəyişikliklər ümumiyyətlə bu zaman daxilində qəbul edilir. Bədənin hər hansı bir hissəsinin görünüşü və ya funksiyası müxtəlif səbəblərdən dəyişdikdə, bədən imici də dəyişə bilər və insan özünü tamamilə fərqli görə bilər. Bədən görünüşü ilə seksuallıq arasında sıx əlaqə olduğu düşünülür. Bədən imicinin dəyişməsi ilə bağlı qorxu və narahatlıqlar seksuallığa təsir edə bilər. Qadınlarda aşağı bədən imici onların özünü daha az seksual hiss etməsinə və cinsi əlaqədən qaçmasına səbəb ola bilər (Akhan, 2009:77-85).

Qadınlar cinsi yetkinlik və hamiləlik həyatlarının müxtəlif mərhələlərində bədənlərində müxtəlif dəyişikliklər yaşayırlar. Doğuşdan sonra onların görünüşündə qəfil dəyişikliklərin qəbul edilməsi prosesi digər proseslərdən fərqlidir. Bəzi qadınlar bu dəyişikliklərin normal olduğunu asanlıqla qəbul etsələr də, bəziləri üçün bunu qəbul etmək bir qədər çətindir.

Yeni analar bədənlərinin onlara aid olmadığını hiss edə bilərlər. Doğuşdan sonrakı dövrdə qarın əzələlərinin zəifləməsi, vaginal doğuş edən qadınlarda perineal laserasiya və ya epiziotomiya olmağı və sinənin ancaq cinsi obyekt olmaqdan çıxıb körpəsini əmizdirməkdə rol alması qadınların bədən imicini dəyişə bilər. Qadınların bədənlərindəki bu dəyişiklikləri qəbul etməyin müxtəlif yolları var. Bəzi qadınlar vaxtı gələndə normala dönəcəklərini ümid edərək dəyişikliklərə məhəl qoymurlar, bəziləri hamiləlikdən əvvəlki görünüşünü qısa müddətdə bərpa etmək üçün səy göstərir. Bildirilir ki, qadınların doğuşa fiziki və emosional hazırlığı kifayət qədərdirsə, onlar yeni bədənlərini asanlıqla sevərək qəbul edir və körpələrinin ehtiyaclarını qarşılamağa diqqət yetirir və bədənlərindəki dəyişiklikləri anlamağa çalışırlar (Ozturk, 2009:184-190). Şəxslərin fərdi xüsusiyyətlərindən, xüsusi qabiliyyətlərindən və problemlərindən asılı olmayaraq, bütün valideynlərin bədən imicində, rollarında və məsuliyyətlərindəki dəyişikliklərin öhdəsindən gəlməyi bacarması vacibdir. Doğuşdan sonrakı dövrdə qadının özünə və bədən imicinə dair hissləri onun valideynliyə uyğunlaşmasına və davranışına təsir edə bilər. Qadının mənlik anlayışı və bədən imici onun seksuallığına da təsir edə bilər. Doğuşdan sonrakı dövrdə cinsi həyatda baş verən dəyişikliklər ananın narahatlığının səbəblərindən biridir. Yeni doğuş etmiş ana ağrı səbəbiylə cinsi əlaqəni davam etdirmək istəməyə bilər və cinsi əlaqənin perineal toxumaların yaxşılaşmasına zərər verəcəyindən narahat ola bilər (Lurie, Aizenberg, Sulema, Boaz, Kova, Golan, Sadon, 2013). Olsson doğuş edən qadınların cinsi həyatı haqqında qrup müsahibələri ilə etdikləri işlərində, doğuşdan sonrakı dövrdə qadınlar bədən imici ilə bağlı çoxsaylı fiziki dəyişikliklər yaşayırlar və bu dəyişikliklərin öhdəsindən gəlməkdə çətinlik çəkdiklərini bildiriblər.

Qadınların doğuşdan sonrakı bədən imici ilə bağlı bildirdiyi mənfiliklər, döşlərdə və vaginada (boş və daha böyük hiss edir) fiziki dəyişikliklərə görə daha az cəlbedici hiss edirlər, vaginal və perineal yırtıqlar səbəbiylə cinsi həyatlarından narahat olmaq, körpələrini əmizdirməyə başladıqlarından bəri döşlərini cinsi obyekt ile əlaqəli görə bilməmələri və döşlərin bu iki fərqli funksiyanı birləşdirə bilməmələri. Bu araşdırmada bəzi qadınların bədənlərindəki dəyişikliyi müsbət qəbul etdikləri və doğuşdan sonra bədənlərini daha yaxşı tanıdıqları müəyyən edilib. Onlar əzələlərini daha asan müəyyən edə bildikləri və cinsi məmnuniyyətə daha asan çatmağı öyrəndikləri bildirildi.

Doğuşdan dərhal sonra ana südü ilə qidalanma dövrü və körpənin bir yaşına qədər olan müddət, doğum sonrası psixiatrik xəstəliklərin görülə biləcəyi əhəmiyyətli bir dövrdür. Postpartum depressiyanın yayılması 10-15% arasındadır (6). Postpartum depressiya yalnız ana üçün deyil, həm də körpə və bütün ailə üçün mənfi nəticələrə səbəb ola bilər. Postpartum depressiyada ana-körpə əlaqəsi ciddi şəkildə pozula bilər. Depressiyada olan analar körpələri ilə emosional bağlar qurmaqda çətinlik çəkə bilərlər. Bu anaların övladlarında təkcə davranış və emosional problemlər deyil, həm də idrak problemləri ola bilər. Doğuşdan sonra progesteron və estrogenin hamiləlikdən əvvəlki səviyyələrə sürətlə azalması və hamiləlik zamanı artan depressiyaya səbəb kimi göstərilsə də, hormon səviyyəsi ilə əhval-ruhiyyə arasında birbaşa əlaqənin mövcudluğu tam sübuta yetirilməmişdir. Doğuşdan sonrakı ilk həftənin sonuna qədər prolaktin səviyyəsi estrogenin azalmasına tərs olaraq artır. Süd verməyən analarda prolaktin səviyyəsinin sürətlə azalması ilə doğuşdan sonrakı depressiya arasında mümkün əlaqənin olduğu bildirilmişdir (Haeri, Baker, Ruano, 2013:948-952).

Postpartum depressiya üçün risk faktorlarını müəyyən etmək üçün müxtəlif tədqiqatlar aparılmışdır. Bu tədqiqatların ən ətraflı və hərtərəfli öyrənilməsi Bekin (1996) doğuşdan sonrakı depressiyanın risk faktorları ilə bağlı meta-analiz tədqiqatıdır. Bek, 1974-1994-cü illərdə doğuşdan sonrakı depressiyanın proqnozlaşdırıcılarını araşdıran tədqiqatı nəzərdən keçirdi. Bu meta-analiz araşdırması nəticəsində doğuşdan sonrakı depressiya üçün ən ümumi risk faktorları:

- prenatal depressiya və narahatlığın olması;
- əvvəlki bir dövrdə depressiya keçirilməyi;
- uşaq baxımı ilə bağlı stress yaşanmağı;
- sosial dəstəyin əskik olmağı;
- stresli həyat hadisələri;
- analıq kədəri;
- mənfi evlilik münasibətləri;
- aşağı özünə hörmət;
- körpənin narahatlığı;
- ananın evlilikdən məmnunluğu;
- sosial-iqtisadi vəziyyət.

Postpartum depressiyanın simptomları doğuşdan sonra iki-üç həftədən bir-iki ilə qədər davam edə bilər. Postpartum depressiyanın simptomları:

- Özünü dəyərsiz hiss etmək;
- Anksiyetə və hətta panik ataklar;
- Günahkarlıq hissi;
- Körpə ilə bağlı narahatlıqlar;
- Daimi ağlama halı və idarə oluna bilməyən ağlamalar;
- Hərəkət və nitqdə yavaşılıq;
- Aqressiya və ya hiperaktivlik;
- Yemək (iştaha) pozulmaları (çox az və ya çox yemək);
- Yuxu balanssızlığı;
- Düşüncələrdə qarışıqlıq və daha çox unutqan olmaq;
- Emosional qeyri-sabitlik;
- Qəzəb hissi;
- Ümidsizlik və qeyri-adekvatlıq hissləri;
- Ölüm və intihar haqqında düşüncələr;
- Konsentrasiya və qərar vermə qabiliyyətinin azalması;
- Seksi əhatə edən fəaliyyətlərin azalması.

Doğuşdan sonrakı depressiya cinsi istəyin və cinsi əlaqənin tezliyinin əhəmiyyətli bir determinantıdır (Sungur, 1986:11-14). Doğuşdan sonra depressiyası olan qadınlar depressiya olmayanlara nisbətən daha çox cinsi problem yaşayırlar (O'Hara, Swain, 1996:17-54). Morof, Postpartum depressiyası olan qadınların olmayanlara nisbətlə cinsi əlaqəyə başlamaq üçün daha az istəkli olduqlarını, depressiyaya düşən qadınların əksəriyyətinin ərinin istəyi ilə cinsi əlaqəyə girdiyini bildirib. Bundan əlavə, bu araşdırmada depressiyaya uğramış qadınların əhəmiyyətli bir hissəsinin doğumdan sonra altıncı ayda olmasına baxmayaraq yenidən cinsi həyatlarına başlamadığı bildirilmişdir (Milgrom, Gemmill, Bilstza, Hayes, Barnett, Brooks, 2008:147-157). Bu qadınların cinsəlliyə marağının itdiyi, libidolarının azaldığı və cinsi fəaliyyətə başlamaq üçün özlərini kifayət qədər aktiv hiss etmədikləri bildirilir (Akman, Uguz, Kaya, 2007:343-347).

## Nəticə

Doğuşdan sonrakı ilk 12 həftə ərzində baş verən postpartum depressiya orta hesabla 13% yayılır. Tez-tez altıncı həftədə müşahidə olunan xəstəliyin simptomları arasında disforiya, emosional labillik, yuxusuzluq, qarışıqlıq, günahkarlıq hissi və intihar düşüncələri olur. Bütün bunlar təkcə ananın doğuşdan sonrakı cinsi həyatına təsir etmir. Doğuşdan sonrakı dövrdə psixoloji vəziyyətə və cinsi həyata təsir edən bir çox amillər vardır. Ananın yaşının aşağı olmağı, aşağı sosial-iqtisadi səviyyə, aşağı təhsil səviyyəsi, şəxsi və ailə keçmişində depressiyanın olması, aşağı sosial dəstək, düşük və ya abort olması kimi faktorlara əlavə olaraq, utancaq, asılı və obsesif kompulsif şəxsiyyət pozğunluğu diaqnozunun olması

postpartum depressiyanın və cinsi disfunksiyanın inkişafı üçün risk faktorları arasında hesab olunur. Postpartum dövrdə yaranan psixoloji böhranların qarşısını alarkən və müalicə zamanı diqqət yetirməli olduğumuz bəzi məqamlar mövcuddur. Diaqnoz qoyulan qadınlara müalicəni planlaşdırarkən ananın əmizdirmə vəziyyəti, dərmanların mümkün yan təsirləri, psixoterapiya üsullarının və somatik müalicə üsullarının tətbiqi kimi məsələləri nəzərdən keçirmək faydalıdır. Ancaq prenatal dövrdən başlayaraq aparılacaq müayinə və təqiblər zamanı skrininqlə xəstəliyin qarşısını almaq üçün ən uyğun üsuldur.

Doğuşdan sonra cinsi disfunksiyaya səbəb olan başqa bir amil isə Lohusalık kədəri (Postpartum blues). Doğuşdan sonra ilk 10 gündə müşahidə olunan əsəbilik, narahatlıq, yuxu pozğunluğu, labil affektivlik ilə xarakterizə olunan və yeni doğulmuş qadınların 80%-də baş verə bilən bir vəziyyətdir. Orta hesabla iki həftə ərzində öz-özünə keçən və heç bir müalicə tələb etməyən bir vəziyyət olduğundan, mövcud simptomların müddəti uzandıqda depressiya ehtimalını nəzərə almaqda fayda vardır. Doğuşdan sonrakı dövrdə qadını psixoloji və fiziki cəhətdən hərtərəfli təmin etmək, cinsi disfunksiya, doğuş sonrası depressiya və s. bu kimi baş verə biləcək bütün psixoloji problemlərin qarşısını ala bilər.

## Ədəbiyyat

1. Doghan, S., Ozkorumak, E. (2008). Difficulties in the diagnosis of painful genital sexual activity and vaginismus. Clinical Psychiatry, 11:135-142.
2. Mahler, M.S., Cham, F. & Bergman, A. (2012). Psychological birth of the human baby (2nd ed.) (AN Babaoghlu, Trans.). Istanbul: Metis Publications.
3. Cunningham, FG, Gant, FN, Leveno, KJ, Gilstrap, CL, Hauth, JC, Wenstrom, K. (2010). Neurologic and psychiatric disorders. Williams Obstetrics. 23rd ed. New York: McGraw Hill, pp.1420-32.
4. Abdool, Z, Thakar, R, Sultan, AH. (2009). Postpartum female sexual function. European Journeal of Obstetric & Gynecelogy and Repraductive Biology, 145(2):133-137.
5. Mert, D.G, Erberk, O.N. (2011). Evaluation of sexual dysfunction and related sociocultural parameters in female patients admitted to the general psychiatry outpatient clinic. Clinical Psychiatry, 14:85-93.
6. Lydon-Rochelle, M.T., Holt, V.L., & Martin, D.P. Delivery method and self-reported postpartum general health status among primiparous women. Paediatric and Perinatal Epidemiology, 15(3):232-240.
7. Okumush, H., Mete, S. (2009). Birth preparation for mothers. Istanbul: Deomed Printing, p.55-56.
8. Akhan, S.E. (2009). Pelvic floor pathologies and their effects on female sexuality. Turkiye Klinikleri Gynecology Obstetrics Special Topics, 2(2):77-85.
9. Ozturk, O. (2009). Mental health and disorders. Feryal Press, Volume 9, Ankara. Factors affecting mothers' postpartum comfort. Dicle Medical Journal, 36(3):184-190.
10. Lurie, S., Aizenberg, M., Sulema, V., Boaz, M., Kova, M., Golan, A., Sadon, O. (2013). Mode of delivery and postpartum sex life: A prospective study. Arch Gynecol. Obstet. Published Online.
11. Haeri, S., Baker, M.A., Ruano, R. (2013). Do pregnant women with depression have a pro-inflammatory profile? J Obstet Gynaecol Res., 39(5):948-52.
12. Sungur, M.Z. (1986). Psychiatric problems in women. Journal of Neurology Neurosurgery Psychiatry, 2(1):11-14.
13. O'Hara, M., Swain, A. (1996). Rates and risk of postpartum depression − a meta-analysis. Int. Rev. Psychiatry, 8(1):37-54.
14. Milgrom, J., Gemmill, A.W., Bilstza, J.L., Hayes, B., Barnett, B., Brooks, J, et al. (2008). Antenatal risk factors for postnatal depression: a large prospective study. J Affect Disord, 108(1-2):147-57.
15. Akman, C., Uguz, F., Kaya, N. (2007). Postpartum-onset major depression is associated with personality disorders. Compr. Psychiatry, 48(4):343-7.

**Rəyçi: ped.e.n. Sevinc Allahyarova**

Göndərildi: 19.07.2022 Qəbul edildi: 28.09.2022

DOI: https://doi.org/10.36719/2663-4619/83/67-72

**Aidə Rasim qızı Xanbutayeva**
Azərbaycan Dillər Universiteti
doktorant
aida_khana@mail.ru

# DİSTANT TƏHSİLİN GƏLƏCƏK PERSPEKTİVLƏRİ

**Xülasə**

Müasir dövrdə onlayn şəkildə həyata keçirilən distant təhsil bütün dünyada geniş miqyas alıb. Distant təhsil ənənəvi təhsildən fərqli olaraq coğrafi cəhətdən maneələrin olmaması, dövrün tələbatına uyğun olaraq müasir materiallardan istifadə edilməsi, yüksək texnologiya, mühazirə tipli dərslərə daha az diqqət yetirməklə tələbəyönümlülüyü ilə seçilir. Distant və ya onlayn təhsilin tərkib hissəsi olan həm sinxron, həm də asinxron təhsil *videokonfrans, hibrid təhsil, açıq cədvəlli onlayn kurslar (kütləvi açıq onlayn kurs), sabit vaxtlı onlayn kurslar* şəklində həyata keçirilir. “Hibrid öyrənmə” müasir öyrətmə metodu olub, texnologiya və rəqəmsal media vasitəsilə tapşırıqları həll etməyə, tələbələrə öyrənməni daha tez aşılamağa kömək edir. Həm üz-üzə, həm də onlayn öyrənmənin üstünlükləri və zəif tərəfləri var, lakin hibrid öyrənmənin məqsədi tək bir öyrənmə təcrübəsi yaratmaq üçün iki formatı birləşdirməkdir.

Distant təhsil müsbət xüsusiyyətləri ilə müasir elmin böyük neməti, təhsilin tərkib hissəsidir.

***Açar sözlər:*** *sinxron, asinxron, hibrid, kütləvi açıq onlayn kurslar, distant təhsil*

**Aida Rasim Khanbutayeva**

## Future perspectives of distance education

**Abstract**

In modern times distance education has become widespread all over the world. Unlike traditional education, distance education is characterized by the absence of geographical barriers, the use of modern materials in accordance with the need of the time, high technology, student-orientedness with less emphasis on lecture-type classes. Both synchronous and asynchronous education which is part of distance or online education, is carried out in the form of video conference, hybrid education, open schedule online courses (massive open online course), fixed-time online courses. "Hybrid learning" – a component of distance education, is a modern teaching method that uses technology and digital media to solve tasks and help students to learn more quickly. Both face-to-face and online learning have their advantages and disadvantages, but the goal of hybrid learning is to combine the two formats to create a single learning experience.

Distance education is a great blessing of modern science with its positive features and it is an integral part of education.

***Keywords:*** *synchronous, asynchronous, hybrid, massive open online courses, distance learning*

## Giriş

Distant təhsil uzaqdan və ya məsafədən onlayn şəkildə həyata keçirilən təhsil növüdür. Sosial və iqtisadi inkişafa töhfə verən bir qüvvə kimi distant təhsil həm inkişaf etmiş, həm də inkişaf etməkdə olan ölkələrdə sürətlə əsas təhsil sistemlərinin vacib hissəsinə çevrilir və onun qloballaşması ölkələrə öz ümumtəhsil sistemi məqsədlərinin həyata keçirilməsi üçün çoxlu imkanlar yaradır. Günümüzdə distant təhsilə marağın artmasına səbəb həm COVID-19 pandemiyası, həm də davamlı bacarıqların təkmilləşdirilməsi və yenidən hazırlanması, texnoloji irəliləyişlər olmuşdur.

İlk dəfə olaraq “distant təhsil” termini Britaniya Açıq Universitetinin “Journal of Distance Education” jurnalının birinci sayında peyda oldu. Bu termininin rəsmi olaraq tanınması 1982-ci ildə baş verdi (Korsunka, 2000:58).

Təşkil baxımından təhsilin 4 forması vardır: əyani, qiyabi, distant (məsafədən) və sərbəst (eksternat).

Ənənəvi təhsil tələbə və müəllimin qarşılıqlı əlaqəsi üçün geniş imkanlar yaratdığına görə ən effektiv üsul hesab olunur və burada formal rejim dəstəklənir.

Distant təhsil anlayışı onunla çox qarışdırılan qiyabi təhsil anlayışından daha genişdir. Qiyabi tədris distant təhsilin ən erkən üsulu olduğu üçün onun mənşəyi kimi götürülür. Bu, tələbələrə öz maraqlarına uyğun olaraq fərdiləşdirilmiş fəaliyyət, yəni təlim sistemidir.

B. Holmberqə görə, distant təhsil bir çox tədris metodları ilə dəstəklənən təhsildir. Burada tələbələrin və müəllimlərin fiziki ayrılığına görə, tədrisin interaktiv mərhələsi çap, mexaniki və ya elektron cihazlar vasitəsilə həyata keçirilir (Holmberg, 2003:11).

Distant təhsil durmadan inkişaf edir və müasir mərhələdə onun aşağıdakı növləri fərqləndirilir (Korsunka, 2000:59).

1) "Təhsil təşkilatı – İnternet". Distant təhsil əyani təhsilin qarşıya qoyduğu vəzifələri icra edir. Təhsilalanlar əyani, ənənəvi şəkildə müəllimlərlə əlaqə saxlayır və beləliklə, internetə çıxış təmin olunur.

Bu tip öyrənmədə əsas rolu təhsil serveri oynayır, tələbələrin və müəllimlərin tədris materialları şəbəkələrə yerləşdirilir və beləliklə, digər materiallara keçid təmin olunur. Bu tip distant təhsilin nəticələrini qiymətləndirmək üçün praktiki olaraq heç bir meyar yoxdur.

2) "Təhsil təşkilatı − İnternet − Təhsil təşkilatı".

Distant təhsil əyani təhsil formasını tamamlayır və ona daha intensiv təsir göstərir. O, distant proyektlərdə iştirak edən iki və ya daha çox əyani təhsil müəssisəsinin tələbə və müəllimlərini əhatə edir. Bu tip distant təhsil üçün elektron poçtdan istifadə əsasdır.

3) "Tələbə – İnternet – Müəllim". Qismən distant təhsil əyani təhsili əvəz edir. Dərslər e-mail, chat, web resurslarından istifadə etməklə aparılır.

4) "Tələbə – İnternet – Mərkəz". Distant təhsil ənənəvi təhsilə bərabərdir. Telekommunikasiya texnologiyalarından istifadə əsasdır (Korsunska, 2000:60).

Distant təhsilin tarixi XIX əsrin 30-cu illərinə, qiyabi təhsilin yarandığı dövrə gedib çıxır. Lakin internetin yaranması ilə distant təhsilin rolu dramatik şəkildə dəyişdi. Distant təhsil təhsilin formalarından biridir, o, ənənəvi təhsil forması kimi mövcuddur və durmadan inkişaf edir. V.Y.Bıkova görə distant təhsil universal, sintetik, şagirdlərə şərait yaradan inteqral, humanist təhsil forması olub, tələbənin bilik səviyyəsinə və konkret məqsədlərinə uyğunlaşdırılmışdır (Bykov, 2001:61).

Ənənəvi təhsillə distant təhsil mahiyyətcə fərqlənsələr də, onlar arasında ümumi cəhətlər vardır və bunu V.Y.Bıkov aşağıdakı kimi qeyd edir: çeviklik, modulluq, paralellik, məsafədən idarə, asinxroniya, əhatə dairəsi, mənfəətlilik, xüsusi müəllim və tələbə statusu və yeni kommunikasiya texnologiyalarından geniş istifadə (Bykov, 2001:62).

1. Çeviklik. Distant təhsil alan tələbələr mühazirə və seminarlar şəklində müntəzəm dərslərdə iştirak etmirlər.
2. Modulluq (və ya tədris materialının modul təqdimatı).
3. Paralellik. Təlim prosesində öyrənən və öyrədən iştirak edir.
4. Məsafədən idarə.
5. Asinxroniya. Bu, təlim prosesində müəllim müstəqil şəkildə cədvəl üzrə öyrənmə və öyrətmə texnologiyasını vaxtında, yəni münasib vaxtda həyata keçirə bilir.
6. Əhatə dairəsi. Tələbə və müəllimlər rabitə şəbəkələri və ya digər informasiya vasitələrindən istifadə etməklə bir-biri ilə əlaqə saxlaya bilir.
7. Mənfəətlilik. Bu xüsusiyyət iqtisadi səmərəliliyə aiddir. Distant təhsil ənənəvi təhsilə nisbətən təxminən 50% daha ucuz başa gəlir.
8. Müəllimin xüsusi statusu. Burada söhbət müəllimin (tərbiyəçinin) yeni rolundan gedir.
9. Tələbənin xüsusi statusu. Daha doğrusu, tələbənin yeni rolu − motivasiya, təşkilatçılıq, çalışqanlıq və s.
10. Yeni informasiya texnologiyaları. Distant təhsildə yeni informasiya texnologiyalarından (kompüterlər, audio, video avadanlıqlar, sistemlər və telekommunikasiya vasitələri və s.) istifadə edilir.

Müasir informasiya-kommunikasiya texnologiyaları distant təhsilin səmərəliliyinə öz töhfəsini verir. Distant təhsili inkişaf etdirmək, tətbiq etmək və idarə etmək üçün yaradılmış xüsusi təşkilatlar var. Onların vəzifəsi distant təhsil alanları əlaqələndirmək və effektiv dəstəyi həyata keçirməkdir. Onları adekvat

olaraq dəstəkləyici təşkilatlar adlandırmaq olar. XIX əsrdə yaranan distant təhsil innovativ xarakter daşıyıb və indi də bu missiyanı qoruyub saxlayır (Holmberg, 2003:88).

Müasir dövrdə onlayn təhsil aktuallığını qoruyub saxlayan təhsil növü olub sinxron və asinxron formada həyata keçirilir.

“Eyni vaxtda” mənasını ifadə edən “sinxron” təhsil canlı kommunikasiya tələb edir. Sinxron öyrənməyə misal olaraq telekonfransları göstərə bilərik. Bu təhsil növü digər məsafədən təhsil formalarından çevikliyinə görə seçilir, müəllim və tələbələrin görüşmələrinə şərait yaradır. Asinxron öyrənmə isə sinxron öyrənmənin əksi olub tələbələrə daha çox azadlıq verir, onların mobilliyini artırır, onlayn şəkildə ünsiyyət qurmaq, viktorinalar təşkil etmək, video komentlərlə rəy bildirməyə imkan verir (8).

Müasir dünyamızda həm müəllim, həm də tələbələr anlayır ki, tədris prosesində xarici faktorların rolu olduqca böyükdür. Asinxron öyrənmənin çevikliyi onlara yeni məzmun yaratmağa kömək edir və materialları daha əlçatan edir. Asinxron öyrətmə metodu tələbələrə məzmuna nəzər yetirməyə və onlarda motivasiyanın yaranmasına kömək edir.

Həm sinxron, həm də asinxron təhsil distant və ya onlayn təhsilin tərkib hissəsi olub *videokonfrans, hibrid təhsil, açıq cədvəlli onlayn kurslar (kütləvi açıq onlayn kurs), sabit vaxtlı onlayn kursları* özündə ehtiva edir.

Videokonfrans ənənəvi görüş olub, iki və ya daha çox iştirakçının internet üzərindən video vasitəsilə əlaqə qurmasıdır. Videokonfranslar Zoom, Blackboard Collaborate, Adobe Connect və başqa proqramlar vasitəsilə həyata keçirilir.

Hibrid təhsil sinxron və asinxron metodları özündə cəmləşdirir. Bu haqda məqalədə geniş məlumat verəcəyik (9).

Açıq cədvəlli onlayn kurslar adından da bəlli olduğu kimi, tələbələrə azadlıq vəd edir. Kursu bitirmək üçün tələbələr onlayn kitablar, bülleten lövhələri, imeyl və digər tapşırıqlardan istifadə etmək şansı qazanır. Bu kurslar güclü intizam və motivasiya tələb edir.

Sabit vaxtlı onlayn kurslarda isə adından göründüyü kimi tələbələr təyin olunmuş vaxtda sayta giriş edir, müəyyən vaxt aralığında çalışmaları yerinə yetirirlər. Bu çalışmalara çat və müzakirə forumları aiddir. Sabit vaxtlı onlayn kurslar tələbələrin qarşılıqlı əlaqəsini yüksəltməyə xidmət edir. Müəllimlər informasiyanı onlayn olaraq internet üzərindən göndərir və buraya onlayn kitablar, qeydə alınmış videolar, səsli prezentasiyalar və müəllimlə tələbə arasında yazılan yazışmalar aiddir.

Bu gün distant təhsilin ən çox yayılmış növü sabit vaxt kurslarıdır. Sabit vaxtlı dərslər ciddi şəkildə reallaşan onlayn dərslərdir. Bu növ tədris prosesində tələbələrdən müəyyən vaxtda onlayn öyrənmə mühitinə daxil olmaq tələb olunur. Sabit vaxt kurslarının bir sıra üstünlükləri var (11). Onları aşağıdakı kimi qruplaşdıra bilərik:

1. Sabit onlayn dərslər bütün dünyada tələbələrə eyni şəbəkəyə qoşulmaq və öyrənmək şansı verir;
2. Tələbələr dünyanın istənilən yerindən əlaqə yarada bilir və bu, zəngin fikir və qlobal perspektiv mübadiləyə imkan verir;
3. Bu dərslər tələbələrə onlayn dərsdə iştiraklarını və tələbəyə real sinif təcrübəsini hiss etdirir.

Sabit vaxtlı onlayn kursların müsbət cəhətləri ilə yanaşı, bəzi çatışmayan cəhətləri də vardır. Belə ki, bu distant təhsil növü tələbələrə lazımi qədər çeviklik imkanı vermir, cədvəllər bəzən uyğun gəlmir, dil maneələri onlayn söhbətlərdə problem yaradır.

Distant təhsilin tərkib hissəsi olan “hibrid öyrənmə” qarışıq öyrənmə kimi də tanınır. O, öyrətmə metodu olub, texnologiya və rəqəmsal media vasitəsilə tapşırıqları həll etməyə, tələbələrə öyrənməni daha tez aşılamağa kömək edir. “Flipped classroom” qarışıq öyrənmə olub, tələbələrə materialları dərsdən əvvəl görməyə şərait yaradır. Müəllim nəzarəti altında tapşırıqlar sinif ortamında həll olunur (10).

Qarışıq təlim metodlarının gücü onların tələbə təcrübəsini təkmilləşdirmək bacarığındadır. Tədqiqatlar göstərir ki, “qarışıq öyrənmə” uğursuzluq nisbətlərini azaldır, öyrənməni yaxşılaşdırır və qarşılıqlı əlaqəni artırır. Qarışıq öyrənmə üzbəüz tədrisin və onlayn təlimin ən yaxşı aspektlərini birləşdirir, bu yolla tələbələrə öz sürətlərində öyrənməyə imkan verir.

Qarışıq kurslara həm üz-üzə, həm onlayn və ya rəqəmsal kurs komponentlərinin qarışığı daxildir. Bu təlim növündə fərdi və onlayn elementlər daha zəngin öyrənmə təcrübəsi yaratmaq üçün birlikdə işləyir və sadəcə müxtəlif formatlarda kurs məzmununu təkrarlamır. Qarışıq öyrənmədə istifadə edilən ən çox

yayılmış texnologiya videodur, lakin adaptiv təlim platformaları, planşetlər, smartfonlardan da istifadə olunur (Neeru, 2016:7).

Bir çox pedaqoqlar üçün video qarışıq öyrənmədə əsas çatdırılma vasitəsidir. Məsələn, çevrilmiş sinif otaqları (flipped classroom) tələbələrdən dərsdən əvvəl mühazirə materiallarını nəzərdən keçirməyi tələb edir və buna görə də müəllimlər və ya təlimçilər qısa video mühazirələr hazırlayırlar. Bununla yanaşı, slaydların ekran yazısı, müəllimin veb-kamera qeydi, nümayişin videosu və ya üçünün kombinasiyasını da bura daxil etmək olar.

Hibrid təhsil tələbələrin dərsə şəxsən qatıldığı, digərlərinin isə virtual olaraq evdən dərsə qoşulduğu təhsil modelidir. Pedaqoqlar videokonfrans aparatları və proqram təminatı kimi alətlərdən istifadə etməklə, eyni zamanda, uzaqdan və üzbəüz tələbələrə dərs deyirlər (12).

Hibrid dərslər fərdi və onlayn öyrənmənin ən yaxşı aspektlərini birləşdirir, eyni zamanda bir çox tələbələr üçün təhsili daha əlçatan edir.

"Hibrid öyrənmə" və ya "qarışıq öyrənmə" çox vaxt bir-biri ilə səhv salına bilər, lakin hər ikisi eyni təlimat elementlərini özündə ehtiva edir. Qarışıq öyrənmə fərdi tədrisi asinxron təlim metodları ilə birləşdirir, burada tələbələr onlayn məşqlər üzərində işləyir və öz vaxtları ərzində təlimat videolarına baxırlar.

Həm üz-üzə, həm də onlayn öyrənmənin üstünlükləri və zəif tərəfləri var. Hibrid öyrənmənin məqsədi hər hansı zəif nöqtələr olmadan tək bir öyrənmə təcrübəsi yaratmaq üçün iki formatı birləşdirməkdir.

Müasir dövrdə distant təhsil öz aktuallığı ilə digər təhsil növlərindən məhz təhsil proqramlarının zənginliyi ilə seçilir. Belə proqramlardan biri də KAOK-dur (kütləvi açıq onlayn kurs) (13).

KAOK (massive open online course) nədir? Bu kurs çoxlu sayda coğrafi cəhətdən səpələnmiş tələbələr üçün nəzərdə tutulmuş pulsuz internet əsaslı distant təhsil proqramıdır. O, akademik kredit təklif etməsə də, sertifikatlaşdırma, məşğulluq imkanlarını artıra və ya əlavə tədqiqatlar təklif edə bilir. Tipik olaraq, KAOK ali təhsil və karyera yüksəlişi üçün istifadə olunur.

KAOK ilk dəfə 2008-ci ildə Şahzadə Edvard Adası Universitetindən Deyv Cormier tərəfindən Manitoba Universitetinin təklif etdiyi "Connectivism and Connective Knowledge" onlayn kursu üçün istifadə edilmişdir. Universitetdə təhsil haqqı ödəyən 25 tələbə və ümumi əhali arasından 2300 ödənişsiz tələbə həmin onlayn kursda iştirak etmişdir (13).

KAOK kursları adətən ümumi struktura uyğun olub, modullardan ibarət olur. Hər bir modul adətən mühazirələr, interaktiv qrafika və diaqramlar, viktorina və ya testlərdən ibarət olur. Tipik modula kurs proqramı, təyin edilmiş oxunuşlar, video mühazirələr avtomatik qiymətləndirilən viktorina daxil ola bilər.

KAOK tələbənin internet vasitəsilə daxil olduğu onlayn kurslardır. Tipik olaraq, bu kurslar onlayn əldə edilə bilən ənənəvi tədris materiallarından ibarətdir və bunlara aşağıdakılar daxil ola bilər: *lenta və ya qeydə alınmış video mühazirələr, onlayn viktorina və imtahanlar, interaktiv təlim modulları və forumlar vasitəsilə digər tələbələrlə qarşılıqlı əlaqə.* Hər bir KAOK kurs provayderini və kurs platformasını ehtiva edir.

KAOK-ların təminatçıları əsasən universitetlərdir. Harvard, Massaçusets Texnologiya İnstitutu və Stanford kimi ən yaxşı təhsil müəssisələri və universitetləri onlayn kursların aparıcı təchizatçılarıdır. Microsoft və Accenture kimi korporasiyalar da açıq onlayn kurslar təqdim edir (Wang, 2015:11).

KAOK-ların xərci həm qiymət, həm də struktur baxımından əhəmiyyətli dərəcədə dəyişə bilər. Bir çox KAOK-lar tamamilə pulsuzdur, halbuki bir sıra kursları ehtiva edən onlayn dərəcə proqramları on minlərlə dollara başa gələ bilər.

KAOK-ların onlayn təhsildə bir sıra üstün cəhətləri vardır:

1. Belə ki, tələbənin gündəlik gediş-gəlişini aradan qaldırmaqla əməkdaşlıq səylərini təkmilləşdirə və vaxta qənaət edə bilər.

2. Ali təhsilə çıxışın yaxşılaşdırılması. İnkişaf etməkdə olan ölkələrdə yüksək keyfiyyətli təhsilə çıxış əlçatan təhsil infrastrukturu təmin etməklə həyat səviyyəsini artırır və davamlı inkişaf səylərinə töhfə verir.

3. Çevik öyrənmə cədvəli. Bir çox kursların tələbələrin iş qrafiklərinə uyğunlaşması daha çox çeviklik tələb edir.

KAOK-ların üstün cəhətlərilə yanaşı, bəzi çatışmazlıqları da var. Belə ki, çeviklik bəzən kursun idarə olunmasını çətinləşdirir. Bəzi tələbələr fərdi öyrənmə strukturunu tələb etdiyinə görə, təlimatçıların

əlçatanlığı az olur, effektiv istifadə üçün rəqəmsal savadlılıq tələb olunur. Tələbələrin müəllimlər və digər tələbələrlə əlaqə qurma ehtimalı məhdud olur. Görmə və ya eşitmə qüsuru olan tələbələr bu kursu qəbul edə bilmir. Kurslar güclü internet bağlantıları tələb etdiyindən, bu da inkişaf etməkdə olan ölkələrdə və imkansız icmalarda problem yaradır.

"Essentials for Blended Learning" kitabında qarışıq öyrənmənin bir neçə növü − hibrid, çevrilmiş (flipped) və hifleks göstərilir. "Hyflex" (hybryd+flexible) sözlərinin ixtisar vasitəsilə birləşməsindən əmələ gəlib "çeviklik" mənasını verir (Stein, 2020:13).

Hyflex elə öyrətmə modelidir ki, burada bəzi tələbələr fiziki olaraq auditoriyada iştirak etdiyi halda, digərləri dərsə məsafədən qoşulur.

Bir çox tələbələr üçün tam onlayn kurslar sərfəlidir. Bu, tələbələrə coğrafi məsafədən asılı olmayaraq kurslara yazılmağı və öyrənmə vaxtlarını şəxsi cədvəlləri əsasında planlaşdırmağa imkan verir. Qarışıq kurslar tam onlayn kurslar qədər çeviklik təmin etməsə də, onlar öz üstünlüklərini təmin edirlər. Bu mühitə öyrəşmiş müəllim və tələbələr üçün üzbəüz öyrənmə nəinki daha rahatdır, həm də üzbəüz şəxsi münasibətlərin sürətlə qurulması üçün əlverişlidir. Beləliklə, qarışıq kurslar əlavə giriş və rahatlığa ehtiyacı olan, lakin üz-üzə ünsiyyətin rahatlığını və faydalarını tamamilə qurban vermək istəməyən tələbə və müəllimlər üçün ideal təklif verir.

1. Qarışıq öyrənmə tələbələrə səmərəli imkanlar əldə etməyə kömək edir. Məsələn, Öyrənmə fəaliyyətlərinə daha asan giriş. Lazımi materialların onlayn platformada yerləşdirilməsi daha çox tələbənin bu prosesdə iştirak etməsinə və məşğul olmasına imkan verir (Stein, 2020:15).
2. Nəzarətin artırılması. Üzbəüz sinifdə işləyən tələbələr dərs vaxtı müəllimdən və təkbaşına işləyərkən tədris planından təlimat alırlar. Yaxşı tərtib edilmiş qarışıq kurslarda kurs mühiti resurslar, fəliyyət və qiymətləndirmələr vasitəsilə aydın, ətraflı, istiqamətləndirilmiş yol təklif edir.
3. Fərdiləşdirilmiş öyrənmə imkanlarının olması. Onlayn öyrənmə mühitində istifadə edilən avtomatlaşdırılmış qiymətləndirmələr fərdiləşdirilmiş öyrənmə imkanlarının dərhal və düzgün fidbəkini təmin edir.
4. Artan sosial qarşılıqlı əlaqə. Üzbəüz kursda olan tələbələrin hər birinin qrup yoldaşı ilə ünsiyyət qurma imkanları məhdud ola bilər və üzbəüz mühitin özü bəzi tələbələrin iştirakına mane ola bilər. Onlayn müzakirələr, əməkdaşlıq sənədləri və s. zaman və məkan məhdudiyyətlərini yüngülləşdirməklə tələbə − tələbə qarşılıqlı əlaqəsinin həcmini artıra bilər.
5. Tapşırıq üçün daha çox vaxt. Qarışıq və onlayn kurslarda tez-tez tələbələrin diqqətini çəkmək üçün yerinə yetirməli olduqları vəzifələrə yönələn vebsaytlar olur. Avtomatik bildirişlər və xatırlatmalar tələbələrin öyrənmə ilə məşğul olmasına kömək edə bilər.
6. Təkmilləşdirilmiş tədris dizaynı. Qarışıq kurslar əlavə diqqət tələb edir və buna görə də üzbəüz kurslara nisbətən daha məqsədyönlü şəkildə tərtib oluna bilər.
7. Azaldılmış xərclər. Qarışıq kurslar tələbələrin, müəllimlərin və təşkilatların bir çox xərclərini (nəqliyyat, enerji sərfi və s.) azaldır (Stein, 2020:16).

## Nəticə

Distant təhsil yox olacaq müasir bir tendensiya deyil. Dəyişən dünyanın ehtiyaclarını ödəmək üçün gələcəkdə bu təhsil növünə daha çox üstünlük verilməlidir. Aparılan araşdırmalar göstərir ki, distant təhsil öz müsbət xüsusiyyətləri ilə təhsilimizin parlaq gələcəyini təmin edir. O, müasir elmin böyük neməti, formasından və istifadə olunan texnologiyalardan asılı olmayaraq təhsilin tərkib hissəsidir.

## Ədəbiyyat

1. Korsunska, N.O. (2000). Distance education: approaches to implementation. Modern information technologies and innovative methods of training in vocational training: methodology, theory, experience, problems: Collection. of science works. Kyiv-Vinnytsia: DOV Vinnytsia, p.29-32.
2. Holmberg, B. (2003). Distance education in essence. An overview of theory and practice in the early twenty-first century 2nd ed. Bibliotheks-und Information ssystem der University Oldenburg, 119 p.
3. Bykov, V.Yu. (2001). Distance education is a promising way to the development of professional education. Pedagogichna gazeta. No. 1, p.2.
4. https://www.techsmith.com/blog/distance-learning/#synchronous-vs-asynchronous
5. https://eztalks.com/elearning/different-types-of-distance-learning.html
6. https://www.panopto.com/blog/what-is-blended-learning
7. https://www.campusexplorer.com/college-advice-tips/7021E31E/Different-Types-of-Distance-Learning
8. Neeru, S. (2016). Distance education. Tripura University, Publishing House LTD., p.212.
9. https://resources.owllabs.com/blog/hybridlearning
10. https://whatis.techtarget.com/definition/massively-open-online-course-MOOC
11. Wang, Yu., Baker, R. (2015). Content or platform: Why do students complete MOOCs? Columbia University New York, USA. Merlot Journal of Online Learning and Teaching, Vol.11, No.1, 18 p.
12. Stein, J., Graham, C.R. (2020). Essentials for blended learning. A standards-based guide. Routledge Taylor & Francis Group. New York and London. Second edition. 201 p.

**Rəyçi: ped.ü.f.d. Əmralı Şirəliyev**

Göndərildi: 05.07.2022 Qəbul edildi: 16.09.2022

DOI: https://doi.org/10.36719/2663-4619/83/73-81

**Sümeyra Hüseyin qızı Avcı**
Bakı Dövlət Universiteti
doktorant
sumeyra.awci07@gmail.com

# OYUNLAR ZAMANI KƏKƏLƏYƏN UŞAQLARIN NİTQİNİN İNKİŞAF İSTİQAMƏTLƏRİ VƏ XÜSUSİYYƏTLƏRİ

**Xülasə**

Oyunlar zamanı kəkələyən uşaqların nitqinin inkişaf istiqamətləri və xüsusiyyətləri müəyyənləşdirilmişdir. Kiçik yaşlı uşağın nitqi böyüklərin təsiri, onlarla ünsiyyət prosesində formalaşır. Ünsiyyət prosesində uşaqda həm idraki, həm də əşya fəaliyyəti inkişaf edir. Nitqə yiyələnməklə uşağın psixikası yenidən qurulur, bu da ona ətraf aləmi şüurlu və iradi qavramağa imkan verir. Nitq inkişafının ən mühüm mərhələsi məktəbəqədər yaşın sonu hesab edilir. Bu mərhələdə uşaqlarda situativ nitqin rolu azalır, fikrin ifadəsi müsahibinə yönəlmiş şərhedici nitq və suallara ətraflı və ardıcıl cavab vermək istəyinin inkişafı ilə əvəz olunur. Bunun əsasında nitqin intellektual inkişafı başlanır, müsbət şəraitdə və düzgün nitq tərbiyəsi alan uşaq gələcəkdə savad təlimi üçün çox vacib olan nitq vərdişlərindən şüurlu istifadə bacarığına malik olur.
***Açar sözlər:*** *kəkələmə, nitq, kiçik motorika, loqoritmik məşğələ, qıcolma*

**Sumeyra Huseyin Avji**

## Development directions and features of speech of children who stutter during games

**Abstract**

Development directions and features of the speech of stuttering children during games have been determined. The speech of a young child is formed under the influence of adults and in the process of communication with them. In the process of communication, the child develops both cognitive and physical activity. By mastering speech, the child's psyche is rebuilt, which allows him to perceive the world around him consciously and willingly. The end of preschool age is considered the most important stage of speech development. At this stage, the role of situational speech in children is reduced, the expression of opinion is replaced by interpretive speech aimed at the interviewer and the development of the desire to answer questions in detail and consistently. Based on this, the intellectual development of speech begins, a child who receives proper speech education under positive conditions has the ability to consciously use speech habits, which is very important for literacy training in the future.
***Keywords:*** *stuttering, speech, motor skills, logarithmic training, convulsions*

## Giriş

Kiçik yaşlı uşağın nitqi böyüklərin təsiri, onlarla ünsiyyət prosesində formalaşır. Ünsiyyət prosesində uşaqda həm idraki, həm də əşya fəaliyyəti inkişaf edir. Nitqə yiyələnməklə uşağın psixikası yenidən qurulur, bu da ona ətraf aləmi şüurlu və iradi qavramağa imkan verir. Təfəkkürün ifadə vasitəsi, psixi proseslərin qurulmasının əsasını təşkil edən nitq insanlarla ünsiyyət zamanı ondan əməli istifadə prosesində inkişaf edir. Nitq inkişafının ən mühüm mərhələsi məktəbəqədər yaşın sonu hesab edilir. Bu mərhələdə uşaqlarda situativ nitqin rolu azalır, fikrin ifadəsi müsahibinə yönəlmiş şərhedici nitq və suallara ətraflı və ardıcıl cavab vermək istəyinin inkişafı ilə əvəz olunur. Bunun əsasında nitqin intellektual inkişafı başlanır, müsbət şəraitdə və düzgün nitq tərbiyəsi alan uşaq gələcəkdə savad təlimi üçün çox vacib olan nitq vərdişlərindən şüurlu istifadə bacarığına malik olur. Bu bir tərəfdən uşaqda ünsiyyət dairəsinin genişlənməsi, digər tərəfdən isə dərketmə maraqlarının artması və kontekst nitqə yiyələnməsi ilə bağlıdır. Nitqin bu forması onun məzmununun kontekstdə açılması, bu və ya digər vəziyyətdən asılı olmadan dinləyici üçün anlaşıqlı olması ilə xarakterizə edilir. Uşaq kontekst nitqə sistemli təlimin vasitəsilə yiyələnir. Bu, eyni zamanda ana dilinin qrammatik quruluşuna yiyələnmədə

kontekst nitqin aparıcı rolunu qeyd edir. Kəkələyən uşaqlar evdə, yaxud təhsil müəssisələrində təşkil edilən məşğələlərdə nitqin yeni vasitə və formalarından istifadə imkanlarını yaradır.

Uşaqlarda rabitəli nitqin sürətlə inkişafı, dəqiq və düzgün tərtib edilmiş geniş və ya müxtəsər cümlələrdən istifadə bacarığı, öz nitqində baş verən pozulmaları qiymətləndirmək və aradan qaldırmaq cəhdləri yüksək səviyyəyə çatır. Oyunlar uşağın psixi inkişafına təsir göstərməklə yanaşı, həm də nitqin formalaşmasında da böyük rol oynayırlar. Oyunlarda uşaqlar bir-biri ilə ünsiyyətdə öz fəaliyyətləri haqqında fikir mübadiləsi aparır, nitq vərdişlərini möhkəmləndirir və təkmilləşdirirlər. Oyunlar tələffüz vərdişlərinin formalaşdırılmasında, lüğət ehtiyatının zənginləşdirilməsində, fikrin qrammatik cəhətdən düzgün tərtib edilməsində də mühüm əhəmiyyət daşıyır.

Kəkələyən uşaqlarla nitq inkişafı üzrə təşkil olunan loqopedik işin xüsusi pedaqoji ədəbiyyatlarda aşağıdakı istiqamətləri müəyyən edilmişdir:

1. Mühafizəedici rejimin yaradılması;
2. Emosional və əzələ vəziyyətinin tənzimlənməsi, emosional və əzələ gərginliyinin aradan qaldırılması. Relaksasiyanın öyrədilməsi və sakitlik formulunun təlqin edilməsi;
3. Motor funksiyaların inkişafı, hərəkətlərin koordinasiya və ritminin inkişafı;
4. Nitq (fonasiya) tənəffüsünün yaradılması;
5. Nitq səlisliyinin və onun müxtəlif formalarının, intonasiya növ və xüsusiyyətlərinin inkişafı;
6. Kəkələyən uşaq şəxsiyyətinin inkişafı;
7. Nitqin mühafizəedici rejimi.

**Mühafizəedici rejimin yaradılması**

Mühafizəedici rejim uşağın nitqli ünsiyyətini məhdudlaşdırmaqla düzgün olmayan nitq vərdişlərinin sönməsinə, uşağın sinir sistemini yeni nitq vərdişlərinin formalaşdırılmasına kömək edir. Korreksiya işinin başlanğıc mərhələsində mühafizəedici nitq rejimi kəkələyən uşağı nitqin inkişafı, ilişmə və pauzaların aradan qaldırmağa hazırlayır. Kəkələyən uşaqların nitqdən çox az, məhdud səviyyədə istifadə etmələri üçün "Susma" rejimi həm gündəlik həyatda ailədə, həm də tədris prosesində təşkil olunmalıdır. Məşğələlərdə uşaqdan hər hansı bir nitq materialının danışılması və ya soruşulması xeyli məhdudlaşdırılır. Bu mərhələdə uşaqların az danışması üçün müxtəlif oyunlardan (başını yelləmək, rəsm çəkmək, applikasiya quraşdırmaq və s.) istifadə edilir. Nitqin mühafizə rejimi uşaqları eyni zamanda münaqişə vəziyyətlərindən də uzaqlaşdırır, onlara böyüklərin sakit və düzgün nitqini mənimsəmələri üçün şərait yaradır. "Susma" rejimi gün rejiminin tərtibi, pedaqoji aktın gözlənilməsində, uşağın emosional tədbirlərdə iştirakının qarşısının alınmasında mühüm rol oynayır. Bu mərhələdə uşağın nitqli ünsiyyəti sadə formada müşaiyət və əksedici nitqdən ibarət olmalı, bir sözdən ibarət cavab məzmunu daşımalıdır. Məsələn: "Adın nədir? − Səlim. Neçə yaşın var? − Altı".

Nitqi mühafizə rejiminin müddəti müxtəlif ola bilər. Adətən, nitqi mühafizə rejimi korreksiya işinin başlanğıcında, bir və ya iki həftə ərzində aparılır. Bu zaman uşağın fəallığı tədricən artsa da, nitq rejimi yenə də gözlənilir. Nitqi mühafizə rejimində müəyyən oyunlardan da istifadə edilir (susma-oyunu, və ya nağıl üzrə albom, applikasiya hazırlamaq və s.).

**Kəkələyən uşaqlarda emosional vəziyyəti və əzələ gərginliyinin azaldılması, relaksasiya, rahatlıq vəziyyətinin təlqini və təlimi**

Kəkələyən uşaqlara relaksasiya vərdişinin təlimi uşağa gərginlik və rahatlıq arasında fərqi hiss etməyə imkan verir və bu iş çalışmalarla başlanır. Çalışmalar zamanı uşaqlar çox asanlıqla əl və ayaqlarındakı gərginliyi hiss edə bilirlər. Bunun üçün rahatlaşmadan öncə onlara əllərini yumruqda güclü sıxmaq, ayaqlarını gərginləşdirmək təklif olunur. Kəkələyən uşaqlarda emosional vəziyyəti və əzələ gərginliyi azaltmaq üzrə çalışmalar müəyyən ardıcıllıqla: öncə əl, ayaq və bütün gövdə əzələləri, sonra isə boyun, üst çiyin xətti və artikulyasiya aparatı əzələlərinin gərginliyini azaltmaq üçün aparılır. Məsələn: 1) "Saatın əqrəbləri fırlanır". Başı saat əqrəbi istiqamətində və əksinə fırlatmaq. 2) "Yelləncək". Başı yelləncəkdə sallanan kimi irəli və arxaya əymək. 3) "Saat". Gövdə sola və sağa əyilir. 4) "Çiyinlər atlanır". Çalışmanın I mərhələsində qollar bədən boyunca sərbəst, çiyinlər yuxarı və aşağı qaldırılıb endirilir: 2 və 3-cü mərhələlərdə hərəkət bir qədər çətinləşdirilir: çiyinlər növbə ilə qaldırılır və endirilir (yaxud biri yuxarı, digəri aşağı). 5) "Dəyirman". Qollar irəli və geri sinxron fırladılır, sonra əks fırlanma əlavə olunur (bir qol dairəvi yuxarı qalxır, digəri aşağı enir). Gövdə, baş və ətraf əzələlərdə gərginliyi azaltmaq üçün kəkələyən uşaqlarla aşağıdakı kompleks relaksasiya gimnastikasının aparılması tövsiyə edilir: "Yumruqcuqlar".

Oturub əlləri sərbəst diz üzərinə qoymaq, ayaqları yumşaq yerə dirəmək. Əlləri yumruqda sıx yumub bir neçə saniyə saxlamaq, sonra açıb sakitcə diz üzərinə qoymaq. "Qıfıl". Ayaqüstdə durub ayaqları çiyin bərabərində qoymaq. Əllər aşağıda, barmaqları bir-birinə toxuyub qolları yuxarı baş üzərinə gərgin qaldırmaq və loqopedin sayı ilə qolları kəskin aşağı salmaq. "Saat". Ayaqüstdə ayaqları çiyin bərabərində bir qədər aralı qoyub, gövdənin ağırlığını növbə ilə ayaqlara keçirtmək. Hərəkət sözə paralel yerinə yetirilir: tik-tak, tik-tak saat edir, tik-tak sağa-sola, sola-sağa. "Yağış". Oturaq vəziyyət alıb başı qaldırmaq və boynu yuxarı dartmaq. Aşağıda qeyd edilən şeir oxunana qədər boyun əzələlərinin belə gərgin vəziyyətini saxlamaq, şeir bitdikdən sonra başıaşağı salıb boyun əzələrini boşaltmaq: Kap-kap-kap. Səs kimindir? Tap! Yağ, ey yağış, yağ! Sulansın çöl, bağ. Qeyd edilən belə çalışmalardan sonra loqoped autotrenninq çalışmalarına keçə bilər. Loqoped autotrenninq çalışmalarını iki mərhələdə təşkil edir. I mərhələdə o, "rahatlayıcı formulu"n təlqininə təqribən belə başlayır: "Mən sakitəm. Mən istirahət edirəm. Gözlərim bağlıdır. Bütün bədənimdə xoş bir istilik var. Yorulmuş əl və ayaqlarım dincəlir. Əl, ayaq, kürək, boynum isti və boşalmışdır. Rahat olmağı hiss etmək çox xoşdur. O, formulun hər bir cümləsini iki dəfə təkrar edir və uşaqlara bir-bir yaxınlaşıb onların başını və ya kürəklərini sığallayır. Bu mərhələdə loqopedin yumşaq və sakit səsi, intonasiyası mühüm rol oynayır. II mərhələdə o, nitq qaydalarını gözləyib, kifayət qədər yüksək və ifadəli intonasiya ilə kəkələyən uşaqlara: "Biz tələsmədən və sakit danışırıq" təlimatını verir və kəkələmədən danışmağı təlqin edir (Vygodskaya, Pellinger, Uspenskaya, 1993:223).

**Motor funksiyaların və söz koordinasiyasının inkişafı və hərəkətin ritmləşdirilməsi**

Bu mərhələdə həm ümumi, həm də artikulyasiya motorikasının inkişafı, hərəkətin ritmləşdirilməsi üzərində iş aparılır. Bu zaman nitq və hərəkət pozulmalarının quruluşu, kəkələmənin forması, ağırlığı, həmçinin ümumi nitq və psixomotor inkişafın vəziyyəti mütləq nəzərə alınır, müxtəlif temp və ritmli hərəkət çalışmalarından istifadə edib müxtəlif əzələ qruplarının tonusunu normallaşdırırlar. Məsələn: "Külək" oyunu. Bu oyun zamanı loqoped söz və hərəkətlərdən birgə istifadə edib, kəkələyən uşaqları ritmik sözlər əsasında hərəkət koordinasiyası, keçiriciliyi, dəqiqliyi üzrə çalışdırır. Oyun uşaqların loqopedin ardınca söz və hərəkətləri yamsılaması ilə aparılır: Qəfildən əsdi külək: şşş-şşş-şşş. Uladı canavar tək: u-u-u. Toz qaldırdı o qoçaq: fiş-fiş-fiş. Yarpaqları xışıldatdı: xış-xış-xış. Yarpaqları fırlatdı: vıy- vıy -vıy. Damları tappıldatdı: dom-dom-dom.

− uşaqlar əllərini bir-birinə sürtürlər;
− əllər boru şəklinə salınıb ağıza yaxınlaşdırılır;
− əllər baş üzərinə qaldırılıb əsdirilir;
− əllər yumruqda sinə önündə açıb-yumulur;
− uşaqlar durduğu yerdə fırlanırlar;
− ayaqlarını bərk-bərk yerə vururlar. Ağaclar şaqqıldadı: tax-tax-tax;
− qolları yanlara açıb növbə ilə fırladırlar. Gör, bir nə etdi külək: ax-ax-ax;
− əllərini yanaqlarına qoyub başlarını yellədirlər.

Kəkələyən uşaqlarda ümumi motorikanın inkişafı, hərəkətin ritmləşdirilməsi üzərində iş zamanı loqoped oyunlardan istifadə edilə bilər. Məsələn, "Taxta və parça kuklalar" oyunu. Bu oyun zamanı uşaq əllərini yüngülcə yanlara açır, ayaq, gövdə, əl əzələlərini gərginləşdirir, boyun, əl və çiyinlər hərəkətsiz, gövdə sağa-sola dönməklə öncə "taxta", sonra gövdəni qısa, təkanvari hərəkətlərlə sağa-sola yırğalayıb əlləri aşağıda sərbəst, gövdə ətrafında fırlatmaqla "parça" kuklanı imitasiya edir. Bu çalışmalar loqopedin sayı və işarəsi ilə aparılır.

1. Artikulyasiya motorikasının inkişafı artikulyasiya vəziyyətlərini almaqla başlanır. Bu zaman kəkələyən uşağın diqqəti mimiki əzələrə cəmlənir və ona paralel olaraq səs tələffüzünün korreksiyası aparılır. Səslərin qoyulmasında ənənəvi olaraq M.F.Fomiçevanın artikulyasiya motorikası metodikasından istifadə edilir. Bu zaman uşağın diqqəti, görmə və kinestetik nəzarəti öz nitqinə yönəldilir. Ritm − müxtəlif yüksəklikdə və müddət ərzində səslərin ardıcıl növbələşməsidir. K.V.Tarasova ritm hissinin üç əsas komponentini fərqləndirir: 1) temp − istinad edilən səslərin gəlmə ardıcıllığının sürətini qavramaq və ifadə etmək bacarığı;

2) metr − vurğulu və vurğusuz səsləri qavramaq və ifadə etmək bacarığı;

3) ritmik təsvir − səslərin və fasilələrin müddəti arasındakı əlaqəni qavramaq və ifadə etmək bacarığı (2011:268).

Ritm əsasında uşaqlara ritmin təsviri hissi tərbiyə olunur. Bu çalışmalar ritmik olaraq düzgün qurulduqda onlar asanlıqla və yorğunluq yaratmadan uzunmüddət istifadə edilib nitqin temp-ritm çatışmazlıqlarını aradan qaldıra bilər. Kəkələyən uşaqlarda ritm çatışmazlıqlarının effektiv korreksiya vasitələrdən biri loqopedik ritmikadır. Loqopedik ritmika nitq patologiyası sindromunda nitqsiz psixi funksiyaları tərbiyə etməklə bərabər, inkişaf və pozulma qanunauyğunluqlarına istinad edərək, loqopedik ritmik tərbiyənin vəzifələrini, mahiyyətini müəyyənləşdirir, loqoritmik məşğələlərin təşkili vasitələrini, metod və formalarının məqsədəuyğunluğunu açıqlayır. Loqoritmik işin əsas məqsədi nitq pozulmaları olan uşaqlarda ritm-hərəkət sahəsinin inkişafı və çatışmazlıqlarının korreksiyasıdır. Loqopedik ritmika sözün musiqi ritmi ilə birləşməsinə istinad edən nitq pozulmalarının aradan qaldırılmasında bir qədər yeni vasitədir. Bu məşğələlər uşağın motorika, ümumi tonus, əhval ruhiyyəsinə xüsusi təsir göstərir, baş beyin qabığının fəallığının artmasına, mərkəzi sinir sisteminin sinir proseslərinin mütəhərrikliyinə təsir göstərir. Loqopedik ritmikanın fəal müşaiyəti ilə motorikanın temp-ritm inkişafına, nitq səslərinin avtomatlaşdırılmasına, onların heca birləşmələrində fasiləsiz səslənməsinə nail olunur. Loqoritmik məşğələlərdə sensor və hərəkət pozulmalarının aradan qaldırılması zamanı istifadə edilən çalışmalar aşağıdakı vəzifələri həyata keçirir:

1) əzələ tonusunu tənzimləyən çalışmalar;
2) diqqəti fəallaşdıran çalışmalar;
3) tənəffüs, səs və artikulyasiyanı inkişaf etdirən çalışmalar;
4) müxtəlif istiqamətlərdə yeriş və addımlama;
5) ritmik çalışmalar;
6) alətlərdə çalma çalışmaları;
7) musiqi ölçülərinin hissini formalaşdıran saylı çalışmalar;
8) kəkələyən uşaqların müstəqil fəaliyyəti;
9) oyun fəaliyyəti;
10) yaradıcı təşəbbüskarlığın inkişafı üzrə çalışmalar.

Loqoritmik məşğələlər zamanı loqoped və musiqi rəhbəri əsas diqqəti uşağın hərtərəfli inkişafına, onun yenidən tərbiyə, motor və duyğu sahələrindəki nitq pozulmalarının aradan qaldırılması və inkişafına yetirirlər. Bunlarla yanaşı, loqoped eyni zamanda uşağın ətraf mühitdə bələdləşməsi, motor bacarıqlara yiyələnmə, verilən tapşırıqların mənasını anlama, qarşıya çıxan çətinlikləri dəf etmə və yaradıcılıq fəaliyyətinə də xüsusi diqqət yetirməlidir. Loqoritmik tərbiyədə iki əsas istiqamət fərqləndirilir:

1) nitqin inkişafı və pozulmalarının korreksiyası: tənəffüs və nitqin temp və ritminin tərbiyəsi, oral praksis, prosodikliyi, fonematik eşitmədən asılı olaraq nitq pozulmalarının etiologiya, mexanizm, simptomatika və aradan qaldırılma metodikaları;

2) nitq patologiyası olan şəxslərdə nitqsiz proseslərin inkişafı, tərbiyə və korreksiyası: eşitmə hafizəsi, diqqət, optik – məkan təsəvvürlər, hərəkətin koordinasiyası, hərəkətin ritm və temp hissiyyatı, görmə ilə müsahibinə səmtləşməsi, şəxsiyyətin tərbiyə və yenidən tərbiyəsi. Bütün bu iş növlərinin təşkilinin əsas prinsipini, musiqinin hərəkət və nitq materialının (şeir, mətn, mahnıların xor oxusu, verilmiş mövzu əsasında səhnələşdirmə və s.) mütəhərrik oyunlarla sıx əlaqələndirilməsi təşkil edir. Loqopedik ritmik məşğələlər aşağıdakı kimi təşkil oluna bilər:

1. Ritmik məşqlər. Ritmik məşqlər zamanı uşaqlarda hərəkətlərin ritm, koordinasiya, keçiricilik, müvazinət, düzgün qamət, məkanda bələdləşmə bacarıqları inkişaf etdirilir. Məşq zamanı addımlama, qaçış, hoppanma, bədən tərbiyəsinin bir sıra elementlərindən istifadə olunur.

2. Əzələ tonusunu tənzimləyici çalışmalar. Bu çalışmalar bədən, ətraf və nitq aparatı əzələlərinin gərginlik və sərtliyini aradan qaldırır.

3. Musiqini dinləmə üzrə çalışmalar. Bu, müxtəlif xarakterli musiqi əsərlərinin vasitəsi ilə kəkələyən uşaqda müsbət emosional halın yaradılmasına kömək edir.

4. Nitq koordinasiyasının hərəkətlə inkişafı üçün çalışmalar. Bu çalışmalar musiqi və hərəkətlərin eyni vaxtda müşaiyəti ilə nitq materialının (səs, heca, söz, fraza və s.) tələffüzünü nəzərdə tutur.

5. Nəğmə oxumaq. Bu çalışmalar uşaqların müxtəlif ritm və xarakterli nəğmələri xorla və ya fərdi oxumaqla nitqin sürət və rəvanlığını normallaşdırmağa kömək edir.

6. Oyunlar. Məşğələlər zamanı müxtəlif oyunlardan istifadə etməklə qazanılmış yeni nitq vərdişləri möhkəmləndirilir, eyni zamanda uşaqlarda çeviklik, güc, bələdləşmə, dözümlülük kimi keyfiyyətlər

formalaşdırılır. Loqopedik ritmika məşğələlərində nitq temp və ritminin normallaşmasında eşitmə nəzarətindən istifadə, ritmik hərəkətlərdən (yeriş, əl çalma, tapdalama, döyəcləmə hoppanma və s.) ibarət xüsusi çalışmaların yerinə yetirilməsi böyük əhəmiyyət daşıyır. Məsələn, musiqi parçasının və ya şeirin ritminə uyğun olaraq əl çalma, addımlama, döşəməni ayaqla ritmik döymə və s. Loqopedik ritmik məşğələlərdə nitq nəfəsi, artikulyasiya aparatı üzvlərinin hərəkəti və tələffüz üzrə çalışmalar da yerinə yetirilir. Nitq sürətinin tənzimlənməsi üzrə iş öncə sürətli − ləng nitq çalışmalar, sonra nitq sürətinin artırılması ilə aparılır. Məsələn:

*Çalışma 1.* Yerində və dairə üzrə asta sürətlə yeriməklə öncə müəyyən səs və hecaları, sonra isə söz, rəqəm və ya ifadələri (yanıltmac, atalar sözü) demək: a-o-u; aou -uao; ta-to-tu; at-ot. Tutu, atı tut. Ata, topu at.

*Çalışma 2.* Sağ və sol ayaqla sağa-sola hoppanmaq və loqopedin təqdim etdiyi hecaları nəfəs vermədən tələffüz edir: pa-pa-papapa; ta-ta-ta-tatatata.

*Çalışma 3.* Bu çalışmada kəkələyən uşaq tələffüz edilən hər bir sözdəki hecaların ritminə uyğun əllə özündən və özünə doğru fasiləsiz və rəvan dirijorluq edir.

*Çalışma 4.* Söz və ifadələri sait səslərə uyğun olaraq ritmlə tələffüz etməklə əl çalmaq: Cüt cücə. Cüt-cüt cücə. Üç cüt cücə. Cücüləri cücələrə tapşırdılar cücülər, cücüləri bircə-bircə aşırdılar cücələr.

*Çalışma 6.* İnsan, heyvan, ağac adlarını əl çalmaqla ritmik tələffüz etmək.

*Çalışma 7.* Sayamaların ritminə uyğun əl çalmaq və ya addımlamaq: Kim sevirsə idmanı bir, iki, üç, dörd, sağlam olacaq canı bir, iki, üç, dörd.

*Çalışma 8.* Şeiri topun ritminə uyğun tələffüz etmək:

Oynaq topum, oynaq topum.
Əlvan rəngli qıvraq topum.
Atdım göyə düşdü yerə.
Qaçdı, getdi birdən -birə.

Kəkələyən uşaqlarda tənəffüs aktında baş verən qıcolmaları aradan qaldırmaq üçün loqoritmika məşğələlərində nitq tələffüzü üzərində iş də aparılır. Loqoped ritmli nitq materiallarından istifadə etməklə uşaqlarda: uzun (davamlı) nəfəs vermə, düzgün nitq nəfəsi, bir nəfəs vermədə söz və qısa frazaları tələffüz etmək, həm də onları sintaqmlara bölərək demək vərdişini formalaşdırır. Məsələn:

Gün çıx, gün çıx,
Kəhər atı, min çıx.
Oğlun qayadan uçdu,
Qızın təndirə düşdü.
Keçəl qızı qoy evdə
Saçlı qızı götür çıx.
Dağdan dığırlanır dığır-dığır dığdığa. Çəp keçi çəp keçidi çəpəki keçib, çəpərə keçər.

**Fonasiya (nitq) tənəffüsünün formalaşdırılması**

Fonasiya tənəffüsü nitqin səlisliyini təmin edir, danışıq səsinin və fonem yaradıcılığını normallaşdıraraq nitqi inkişaf etdirir. Məşğələnin gedişində uşaqlar dərindən və qısa nəfəs almaq, uzun və davamlı nəfəs vermək bacarığına yiyələnirlər. *Nitq tənəffüsünün formalaşdırılması*. Bunun üçün A.F.Strelnikovanın "müxalif tənəffüs" gimnasikasından istifadə etmək olar (Shchetinin, 2011:157). A.F.Strelnikovanın "müxalif tənəffüs" gimnasikası tənəffüsün qarışıq növünü (döş qəfəsi-diafraqma) fəallaşdırır və kəkələyən uşaqda davamlı patoloji tənəffüs steriotiplərini dağıdır. Bundan əlavə, gimnasika kəkələyən uşaqda burun-udlağın sanasiyasına kömək edib eyni zamanda sağlamlaşdırıcı təsir göstərir. Tənəffüs üzrə çalışmaların gedişində, həmçinin səsin keyfiyyəti və imkanları artırılır, ləngidilmiş tənəffüslə nitq fəallaşdırılır. Səs üzrə məşğələlərdə əsas məqsəd qırtlaq əzələlərinin gərginliyini azaltmaq, onları qıcolmalardan azad etməkdir. Adətən, kəkələyən uşaqlarda nitq tənəffüsünün (diafraqma tənəffüsünün) formalaşdılması üçün kompleks hərəkətlər: yeriş, marş, gövdənin əyilib-düzəlmələri və s. çalışmalardan istifadə olunur. Nitq tənəffüsünün formalaşdırılması üzrə loqopedik iş aşağıdakı kimi təşkil edilir:

*Ümumi tənəffüs bacarığı üzrə çalışmalar:*

- tənəffüsün qarışıq tipinin inkişafı;
- ağız, burun tənəffüs bacarığının fərqləndirilməsi, ağızla davamlı nəfəs vermənin yaradılması;

- davamlı fonasiya, sonra isə nitq nəfəs verməsinin formalaşdırılması və b.

*Xüsusi nitq tənəffüsünün yaradılması.* Nitq nəfəsinin normallaşdırılması üçün kəkələyən uşaqlarda ilkin olaraq bir nəfəs vermədə düzgün, səlis və ifadəli danışmaq vərdişi yaratmaq, sonrakı mərhələlərdə onları ünsiyyət qurmağa təhrik etmək məsləhət görülür. Məşğələlərdə müxtəlif oyun növlərindən istifadə etməklə onlarda düzgün və davamlı nitq tənəffüsü bacarığı formalaşdırmaq olar. Bunun üçün "Külək əsir", "Topu səbətə at", "Gəmi dənizdə üzür" kimi oyunlardan istifadə edilə bilər (Ağayeva, Hüseynova, 2018).

Uşaqlarla aparılan kompleks tənəffüs çalışmalarında isə müxtəlif oyun növlərindən istifadə edilir. Kompleks tənəffüs çalışmalarında uşaqlara yumşaq və qısa nəfəs alma və bu prosesə diqqəti cəmləmədən rəvan, davamlı dərin nəfəs vermə öyrədilir. Bundan əlavə, yumşaq səs həmləsi zamanı nəfəs verməni idarə etmək, nəfəs almanı gərginləşdirməmək üçün çiyinləri qaldırmaq və bədəni düzgün vəziyyətdə saxlamaq, həmçinin nəfəs vermədə "hava itkisi olmadan" danışmaq bacarığı təlim edilir. Tənəffüs çalışmaları səs, söz, söz birləşmələri və cümlələr əsasında aparılır. Uzunsürən və qənaətli nəfəs vermənin inkişafı üçün cümlələrə tədricən heca, sözlərin artırılması, düz və əksinə say çalışmaları çox faydalıdır. Müxtəlif maraqlı və əyləncəli oyun və oyun komponentli çalışmalar kəkələyən uşaqları sərbəst danışmağa səy göstərməyə, ünsiyyət qurmağa, yalnız nəfəs vermədə danışmağa təhrik edir (İmanova, 2012:222-280).

Səs yaradıcılığı tənəffüs prosesi ilə sıx bağlıdır. Nitq prosesində düzgün olmayan tənəffüs çox zaman pis səslənməyə gətirib çıxarır. Müşahidələr göstərir ki, kəkələyən uşaqlar üçün səsin, onun melodikliyi və intonasiyasının pozulması xarakterikdir. Onlarda daha çox müşahidə edilən çatışmazlıq: nitq prosesində səsin zəif, xırıltılı, nadir hallarda isə nazal olmasıdır. Uşaqlarda səs modulyasiyanın qabarıq pozulması, iradi olaraq səsin ucalığını dəyişə bilməməsi və səsin həmləli olması müşahidə edilə bilər. Kəkələyən uşaqlarda səs pozulmalarının aradan qaldırılması üçün səsin diapazon, güc, tembr, rasionallığı, melodikliyi üzərində işin təşkili də çox vacibdir (İmanova, 2002). Uşaqlarda səsin və nitq səslərinin düzgün olması artikulyasiya aparatının quruluşu və hərəkiliyi ilə bağlı olub, düzgün diksiya vərdişinin yaranmasına kömək edir. Kəkələyən uşaqlarla artikulyasiya hərəkətərinin fəallaşdırılması üzrə işdə M.F.Fomiçeva və A.İ.Boqomolovanın metodikalarından istifadə etmək olar.

**Nitq səlisliyinin, onun müxtəlif formalarının, intonasiya növ və xüsusiyyətlərinin inkişafı**

Bu zaman söz və frazalar üzərində işə xüsusi diqqət yetirilir. Uşaqlardan sözlərin tərkibi saxlanılmaqla sözləri bitişik, vurğu və orfoepik qaydaları gözləməklə tələffüz etmələri tələb olunur (Akgun, 2005). Frazalar üzərində iş özündə bir nəfəs vermədə, bitişik, normal temp, ritm və melodikliyin gözlənilməsini birləşdirir. Bu zaman kəkələyən uşaqlarda nitqin ritm-intonasiya quruluşunun (eşitmə və eşitmə-görmə qavraması və əsas intonasiya strukturunun) bitişiklik və pauza, saitlərin qısa və uzun tələffüzünə, səs gücünə görə modulyasiyasına (normal, daha uca və ya daha asta), hündürlüyünə (normal, daha hündür və ya daha alçaq, səs modulyasiyasının baza melodikliyinin-düzgün intonasiya, səs diapazonunun təbii hüdudları çərçivəsində yüksəlməsi və aşağı düşməsi), söz vurğusu, frazalarda məntiqi və sintaqm vurğusu, frazaların melodiklik quruluşunun, nitq tempinin (normal, tez, yavaş) inkişafına böyük diqqət yetirilir (Şəfiyeva, 1997). Bu zaman kəkələyən uşaqlarda normadan kənara çıxma hallarının qarşısı alınır, nəqletmə, sual və nida intonasiyalarını ifadə etməyi öyrənir, nitq səsləri və səs birləşmələrini düzgün tələffüz bacarıqlarını inkişaf etdirirlər. Bu iş öncə sait səslərdən istifadə etməklə başlanır, sonra isə sait-samit birləşmələri onların ifadələrdə işlənməsi ilə davam edir:

- ayrı-ayrı sait səslərin tələffüzü;
- sait səs birləşmələrinin (iki, üç, dörd, beş) tələffüzü;
- sait- samit birləşmələrinin tələffüzü;
- bir sözdən ibarət ifadələrin tələffüzü;
- qısa frazaların (ibarələrin ) tələffüzü;
- uzun frazaların (ifadələrin) məntiqi fasilə ilə tələffüzü.

Söz və söz birləməsinin quruluşu, intonasiyası üzərində iş zamamı musiqili ritmik hərəkətlərdən istifadə edilir. Musiqinin müşaiyəti və əllərin hərəkəti ilə nitqin səlisliyi, fasilə, temp, məntiqi vurğu və onun melodiklik konturu işlənilir. Nitqin səlislik, fasilə, temp, məntiqi vurğu və onun melodiklik konturu üzrə iş aşağıdakı şəkildə aparıla bilər:

ELMİ İŞ Beynəlxalq elmi jurnal. İmpakt Faktor: 1.790. 2022 / Cild: 16 Sayı: 10 / 73-81 ISSN:2663-4619
SCIENTIFIC WORK International scientific journal. Impact Factor: 1.790. 2022 / Volume: 16 Issue: 10 / 73-81 e-ISSN: 2708-986X

Öncə əllər kəmər səviyyəsində rəvan tempdə aşağı salınmaqla loqopedin təqdim etdiyi bir cümlə nəqli adi intonasiya ilə sonra isə sual, daha sonra xahiş (və ya nida) bildirən intonasiyası ilə tələffüz edilməklə əllər baş üzərinə qaldırılır. Loqoritmikanın tərkib hissələrindən biri olan fonetik ritmika uşaqlarda səs tələffüzü vərdişlərinin formalaşmasında, çatışmazlıqların aradan qaldırlmasında əhəmiyyətli rol oynayır.

Kəkələmə zamanı fonetik ritmik məşğələlərin məzmunu, aparılma mərhələləri, istifadə edilən oyun növlərinin xüsusiyyət və spesifikliyinə görə aşağıdakı kimi təşkil edilir:

a) giriş çalışmaları;
b) mimikanın, üz və oral praksisin inkişafı üçün çalışma və oyunlar;
c) eşitmə, diqqət və hafizənin inkişafı üçün çalışma və oyunlar;
d) məkanda bələdləşmə və ritm hissinin inkişafı üçün çalışmalar və oyunlar;
e) yamsılama bacarığının inkişafı, iradi keyfiyyət və fəaliyyətin inkişafı üçün oyunlar;
f) ümumi və xırda motor bacarıqlarının inkişafı üçün xüsusi oyunlar;
g) nitqin prosodik tərəfinin inkişafı üçün oyunlar;
i) yaradıcı təxəyyül, musiqi yaddaşı və musiqi yaradıcılığının inkişafı üçün oyunlar;
h) yekunlaşdırıcı və ya tamamlayıcı oyun və çalışmalar.

Fonetik ritmik məşğələlərdə “SUVAG” (Zaqreb ş. Xorvatiya ) aparatından istifadə etməklə ayrı-ayrı danışıq səs və nitq materialının tələffüzü baş, gövdə, ətrafların birgə hərəkəti kimi təşkil olunur. Bu məşğələlər adətən musiqinin müşaiyəti, loqopedi / müəllimi yamsılamaqla oyun şəklində aşağıdakı kimi aparılır: əllər yanda, gövdəni bir qədər qabağa əyib çiyin gərginliyini aradan qaldırmaq və qolları aşağı sallayıb yellətmək. Qolları dirsəkdə büküb, əlləri yumruqda sıxmaq. Aşağı sallanmış əl və çiyinləri fasiləsiz tez-tez əsdirmək, qolları dirsəkdə bükmək, əlləri boş saxlamaq. Çiyinləri əsdirməklə əllərdən su çırpır kimi hərəkətlər etmək.

Gövdəni düz saxlayıb əlləri yana açmaq, kürək, boyun, çiyin əzələlərində gərginliyini aradan qaldırmaq üçün dizləri yüngülcə əyib, başı və qolları irəli uzatmaq, sonra başlanğıc vəziyyəti almaq. Kəkələyən uşaqlar nitq səslərinin xarakterinə uyğun olan bu və ya digər hərəkətləri yerinə yetirməklə onların düzgün tələffüz etmə vərdişini formalaşdırır: [A] səsinin kifayət qədər uzun və rəvan tələffüzü əllərin sinə qarşısında hərəkəti ilə birgə yerinə yetirilir. [O] səsi qollar aşağıdan yanlara sonra baş üzərinə qaldırılmaqla tələffüz edilir. [U] saiti əllər çiyin üzərindən yavaş-yavaş irəli uzadılmaqla tələffüzü yerinə yetirilir. [B] foneminin tələffüzü zamanı qolları dirsəkdən bükmək və gövdəni önə əymək, sərbəst əlləri yavaş-yavaş çırpıb ba-ba-ba hecasını tələffüz etmək lazım gəlir (American Psychiatric Association). [T] samitinin tələffüzü ilə eyni vaxtda yumruqda yığılmış əllər kəskin açılır. [D] səsinin düzgün tələffüz vərdişinin yaradılması zamanı uşaq da-da-da hecalarından sonuncu -da hecasını başı önə, sinə qarşında olan əlləri kəskin yanlara açmaqla tələffüz edir. [Q] samiti qa-qa-qa-qa hecasının eyni vaxtda hər iki əlin baş və şəhadət barmaqlarını bir neçə dəfə birləşdirib açmaqla tələffüz edilir.

Beləliklə, eyni vaxtda tələffüz və hərəkətlərin yerinə yetirilməsi kəkələyən uşaqda tənəffüs, tələffüz və nitq motorikasının inkişafına təkan verir. Musiqili ritmik məşğələlərdə yer alan fonetik ritmika kəkələyən uşaqlarda düzgün tələffüz vərdişlərinin yaranmasına, artikultasiya əzələləinin gərginliyinə və boşalmasına, əzələ hissiyatının artmasına kömək edir. Nitqdə sözün ritm tərəfi üzrə iş zamanı bir neçə dəfə sözün ritmini tələffüzü asan olan hecaların müvafiq hərəkətlərlə (əl çalma, stolu döşəməni döyəcləmə və s.) müşaiyət etmək, sonra isə həmin sözü sərbəst hərəkətlə birgə tələffüz etmək, hər bir hecanı dirijorluqla müşaiyət edib nitq vərdişini möhkəmləndirmək olar. Sözün ritm tərəfi üzrə işə paralel olaraq, loqoped öz şəxsi nitq nümunəsi və əyani − illüstrasiya materialları əsasında nitqin intonasiya tərəfini də inkişaf etdirir. Çalışmalarda uşağın loqopedlə birgə nitq materialının tələffüzü, loqopedin ardınca kontekst situasiya və ya şəkil üzrə əşya və ya fəaliyyətin adlandırmasından və s. istifadə olunur. Bu zaman xüsusi diqqət nitq elementlərinin rəvan işlənməsinə yönəldilir. Yəni tələffüz edilən bütün səslər uzadılaraq bir səs birləşməsi kimi ifadə edilir və loqoped sait birləşmələrin tələffüzü zamanı bir səsdən digərinə artikulyasiyanı dəyişmədən, fasiləsiz keçidinə, kəkələyən uşaqların samit birləşmələrində sait səslərin tələffüzünə verilən tələblərə riayət etmələrinə mütləq nəzarət edir:

- qısa (müxtəsər) cümlələr bir nəfəs verməklə tələffüz olunmalıdır;
- uzun (geniş) cümlələr sözlərin arasında fasilə etməklə 2-4 məna parçalarına ayırıb tələffüz edilməlidir.

tibbə məlum olmayan xəstəliklərin (legionelloz, koronavirus infeksiyası, prion xəstəlikləri, heyvanlardan keçən qrip və s.) aşkar edilməsi göstərir ki, infeksion xəstəliklərə görə sayıqlıq həmişə yüksək səviyyədə olmalıdır. Yadda saxlamaq lazımdır ki, müəyyən zaman dönəmində onlar kəmiyyət göstəricilərini azaltsalar da, keyfiyyətcə qorxulu, kütləvi və yüksək ölüm verən xəstəliklər olaraq qalırlar. Epidemiya və pandemiyalar xəstələnmə və ölüm faizini xeyli artırmaqla yanaşı, bu zaman tətbiq olunan məcburi karantin tədbirləri ölkələr və insanlar arasında əlaqələri pozaraq ciddi iqtisadi və humanitar böhrana səbəb olurlar (Foste, Osterman, 2007).

İnfeksion prosesin kəskin dövründə hər bir xəstəliyə xas spesifik ağırlaşmalar yüksək ölüm faizi verməklə infeksion xəstəlikləri kliniki təbabətin aktual sahəsinə çevirir. Məs., qarın yatalağı və paratiflər – bağırsaq deşilməsi və bağırsaq qanaxması, virus hepatitləri – kəskin qaraciyər çatışmazlığı və ensefalopatiya, leptospiroz, salmonelloz, şigelloz və vəba – kəskin böyrək çatışmazlığı, botulizm, poliomielit – kəskin tənəffüs çatışmazlığı və s. ilə ağırlaşır (Vəliyev, Əhmədova, İbrahimova, 2021:42).

Əksər hallarda infeksion xəstəliklərin ağır və xeyli ağır gedişi orqan və sistemlərin kəskin çatışmazlığını verir. Orqanizmin belə halı *kritik*, və ya *təxirəsalınmaz* vəziyyət adlanır və pozulmuş funksiyaların dərhal əvəz olunmasını, yəni süni tənəffüs aparatının, yüksək dozada qlükokortikosteroidlərin tətbiqi, rehidratasiya və reminerallaşma, lümbal punksiya və s. tələb edir (Lyamkin, 2012:27; Nesterov, 1992:145).

İnfeksion patologiyada kritik vəziyyətlər adətən aqressiv faktorun – mikrobun və ya onun toksininin təsirindən yaranır və ağırlaşır. Yəni orqanlarda baş verən patoloji proseslərin kəmiyyət dəyişiklikləri tədricən toplanaraq həyatla bir yerə sığmayan keyfiyyət dəyişikliklərinə − kritik vəziyyətlərə keçir. Bununla da somatik ölüm üçün şərait yaranır. Yəni daxili orqanlarda – qaraciyərdə, böyrəklərdə, ağ ciyərlərdə geridönməz patoloji dəyişikliklər beyinin ölümündən tez baş verir.

Deməli, bəzən infeksion xəstəliyin diaqnozunu dəqiqləşdirməkdən əvvəl kritik vəziyyəti və onun proqnozunu təyin etmək lazım gəlir. Buna nail olmaq üçün isə xəstəni intensiv nəzarətə götürməklə funksional pozğunluqları vaxtında üzə çıxarmaq olduqca vacibdir. Bu zaman müalicə tədbirlərinin uyğunluğu və effekti də uğurlu nəticə əldə olunmasına kömək edə bilər (Monarch, 2016:73).

İntensiv müşahidəyə kliniki, laborator və alətlərlə müayinə metodları aiddir. Onların köməyi ilə sinir sistemi, qan dövranı, tənəffüs, ekskretor orqanlar -böyrəklər, qaraciyər, habelə orqanizmin daxili mühiti (homeostaz), su-elektrolit, turşu-qələvi müvazinəti, hematokrit və hemostaz haqqında qiymətli məlumatlar əldə etmək olar (Cədvəl 1).

***Cədvəl 1.***

**İnfeksion xəstəliklərin ağır gedişində həyat üçün vacib orqan və sistemlərin funksional vəziyyətinin əsas göstəriciləri**

| Orqan və sistemlər | Müayinə metodları | | |
|---|---|---|---|
| | **kliniki** | **laborator** | **alətlərlə** |
| Sinir sistemi | Huşun vəziyyəti. Meningial simptom. Psixomator oyanıq. Qıcolmalar. Reflektor və hərəki funksiyaların vəziyyəti. Oftalmoplegiya | OBM-in, qanın biokimyəvi müayinəsi (şəkər, qalıq azotu, sidik cövhəri, kreatinin və s.) | OBK punksiyası. Rentgenoqrafiya, EEQ, Reoensefaloqrafiya, ExoEQ, USM, KT |
| Qan dövranı | Dərinin rəngi, dırnaq yatağının qanla dolması, periferik venaların vəziyyəti, töyşümə, nəbz. Auskultasiya və perkussiya. Bir saatlıq diurez. Dəri və düz bağırsaq temperaturunda fərq | Hematokrit, hemoqlobin, TQM, dövr edən qanın həcmi, kolloid-osmotik təzyiq. Viskozmetriya. Oksihemometriya | AT, mərkəzi venoz təzyiq, qanın dəqiqəlik həcmi, EKQ. Konyunktival biomikroskopiya. |
| Tənəffüs sistemi | Dəri və selikli qişaların rəngi. Tənəffüsün sayı, dərinliyi, ritmi. Töyşümə, oyanıqlıq. Auskultasiya, perkussiya, palpasiya | Saturasiya, TQM, $P_{02}$, $P_{CO2}$, Hb | Ağ ciyərlərin Rentgenoqrafiyası və KT-sı, BAL, Spiroqrafiya |

| | | | |
|---|---|---|---|
| Böyrək, qaraciyər | Anamnez məlumatları. Diurez. Sarılıq. Huşun pozulması, ağızdan qaraciyər iyi gəlməsi. | Sidiyin ümumi müayinəsi, qanda qalıq azot, kreatinin, protrombin, bilirubin. Qanda, sidikdə $K^+$, Na, $Ca^+$ elektrolitlər, ümumi zülal, albumin, Virus markerləri | Reohepatoqrafiya, KT, USM, MRT, Elastoqrafiya |
| Su-elektrolit balansı, TQM | Anamnez məlumatları. Susuzluq, dərinin quruması, əzələlərin qıcolması, nəbz, xəstənin bədən çəkisi, töyşümə, oliqoanuriya | Qanda K, Na TQM, hemotokrit, plazmanın nisbi sıxlığı, ümumi zülal | EKQ, AT, dövr edən qanın həcmi, mərkəzi venoz təzyiq və bir saatlıq diurez |
| Qanın laxtalanma sistemi | Hemorragik səpgi, qanaxma, tromboz əlamətləri | Laxtalanma vaxtı, protrombin, fibrinogen, fibrinolitik aktivlik, III antitrombin, etanol testi, fibrinogen | Elektrokoaquloqrafiya (tromboelastoqrafiya) |

Lakin laborator və alətlərlə müayinə metodları nə qədər dəqiq olsa da, onların nəticələrinin əldə edilməsinə çox vaxt tələb olunduğundan klinik əlamətlərə üstünlük verilməlidir. Məhz düzgün kliniki diaqnoz daha həssas müayinə üsulunu seçməyə və təxirəsalınmaz müalicə tədbirlərinə başlamağa imkan verir. Çünki əksər kritik vəziyyətlər infeksion prosesin erkən dövrlərində inkişaf edir.

Lakin infeksion xəstəliklərin başlanğıc dövrü üçün xarakter olan intoksikasion sindrom – qızdırma, halsızlıq, iştaha, yuxu pozğunluğu, oynaq-əzələ ağrıları nozoloji diaqnozu xeyli çətinləşdirməklə yanaşı, təcili müalicə tədbirlərini də ləngidir. Bunu şigellozun differensial diaqnozunda əyani şəkildə görmək olar (Cədvəl 2).

***Cədvəl 2.***

**Şigellozla diferensə olunan xəstəliklər**

| İnfeksion xəstəliklər və parazitozlar | Somatik xəstəliklər | Cərrahi xəstəliklər | Şiş xəstəlikləri |
|---|---|---|---|
| Salmonelloz | Qeyri-spesifik xoralı kolit | Mezenterial venaların trombozu, | Düz bağırsağın xərçəngi və polipi |
| Yersinioz | | bağırsaq invaginasiyası | Kəskin leykoz |
| Klebsielloz | Qıcıqlanmış bağırsaq sindromu | Appendisit | |
| Qida toksikoinfeksiyası | Xroniki enterit və kolitlər | Babasilin kəskinləşməsi | |
| Vəba | Uremiya koliti | Düz bağırsağın çatı | |
| Bağırsaq vərəmi | Kron xəstəliyi | | |
| Amöbiaz | Tireotoksikoz | | |
| Balantidiaz | | | |
| Askaridoz | | | |
| Ləmblioz | | | |
| Disbakterioz | | | |
| Psevdomembronoz kolit | | | |

Ancaq kliniki əlamətlərin düzgün təhlili, xəstəliyin inkişafında onların ardıcıllığı, kompleks klinik-epidemioloji məlumatlar kliniki diaqnozun erkən təyin olunmasına və ağır xəstələrə dərhal intensiv terapiya və ya reanimasiya tədbirləri tətbiq etməyə imkan verə bilər (Vəliyev, 2013:624; İsayev, 2009:215).

İntensiv terapiya xəstə kritik vəziyyətə düşdükdə və ya bunun baş verməsi üçün risk faktorları olan adamlara tətbiq edilir. Risk faktorlarına aşağıdakılar aiddir:

− xəstənin gec qospitallaşdırılması;
− xəstəliyin ağır olması, uzun gedişi və residivləri;
− birgə və ya assosiasiya etmiş infeksiya (B və C hepatitləri, vərəm);
− yanaşı xroniki xəstəliklər (şəkərli diabet, ağır ürək-damar xəstəlikləri) və hamiləlik;
− orqanizmin rezistentliyinin zəifləməsi – arıqlama, hipovitaminoz, stress vəziyyətlər;
− immun çatışmazlığı: anadangəlmə və ya qazanılan.

Risk faktoru olan infeksion xəstələrə ciddi nəzarət və qulluq təyin edilir, dərhal güclü etiotrop və patogenetik müalicə aparılır. Kritik vəziyyət əmələ gələn kimi xəstə intensiv terapiyaya keçirilir, nəzarət və qulluq gücləndirilir. Lakin, ilk növbədə, kritik vəziyyətin növünü müəyyən etməyə çalışmaq lazımdır.

Əsas kritik vəziyyətlərdən bunları göstərmək olar:
− infeksion-toksiki şok (İTŞ);
− infeksion-toksiki ensefalopatiya (İTE);
− serebral hipertenziya (SH);
− dehidratasiya hipovolemiya şoku (DHŞ);
− kəskin tənəffüs çatışmazlığı (KTÇ);
− anafilaksiya şoku (AŞ);
− kəskin qaraciyər çatışmazlığı (KQÇ);
− kəskin ürək-damar çatışmazlığı (KÜDÇ);
− kəskin böyrək çatışmazlığı (KBÇ);
− damar daxili laxtalanma sindromu (DDL);
− cərrahi ağırlaşmalar (CA).

İnfeksion xəstəliklərdə kritik vəziyyət, əslində xəstəliyin spesifik ağırlaşması hesab edilə bilər. Qarın yatalağında güclü endotoksinemiya – infeksion toksiki şok, bağırsaq limfa vəzilərinin nekrozu – bağırsağın deşilməsi və xora nahiyyəsindən güclü qanaxma – diffuz peritonit, posthemorragik hipovolemiya kimi kritik vəziyyətlər verir.

Odur ki, ilk növbədə, infeksion xəstəliyin klinik diaqnozunu müəyyən etməyə çalışmaq lazımdır. Belə olduqda, kritik vəziyyətin növünü tez təyin etmək və buna uyğun müalicə tədbirlərini düzgün seçmək olar (Cholera treatment, 2011).

Bəzən bir infeksion xəstəlik bir neçə kritik vəziyyət verə bilər. Məs., vəbada KBÇ, KTÇ, KÜDÇ, DDL, DHŞ, leptospirozda İTŞ, KQÇ, KBÇ və s. (Monarch disease ontology release, 2009). Odur ki, belə xəstələri kritik vəziyyətdən çıxarmaq üçün klinik təbabətin digər mütəxəssisləri də reanimasiya və intensiv terapiya tədbirlərinin icra olunmasına cəlb edilməlidirlər. Yadda saxlamaq lazımdır ki, çox vaxt infeksion xəstənin kritik vəziyyətə düşməsi yanaşı somatik xəstəliyin, məsələn, şəkərli diabetin, xroniki qlomerulonefritin ağırlaşması – hiper və ya hipoqlikemik koma, azotemik uremiya ilə əlaqədar ola bilər (Cədvəl 3).

***Cədvəl 3.***

**İnfeksion xəstəliklər və onların törətdiyi kritik vəziyyətlər**

| Xəstəliklər | İTŞ | KQÇ | KBÇ | İTE | SH | KTÇ | KÜDÇ | DDL | AŞ | DHŞ | CA |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| Qarın yatalağı | + | | | | | | | | | + | + |
| Salmonelloz | | | + | | | | + | | | + | |
| Şigelloz | + | | | | | | + | | | + | + |
| Botulizm | | | | | | + | | | + | | |
| Vəba | | | + | | | + | + | + | | + | |
| Amöbiaz | | | | | | | | | | | + |
| Taun | + | | + | | | + | + | | | | |
| Difteriya | + | | + | | | + | + | + | + | | |
| Qrip | + | | | | | + | | | | | |
| Legionelloz | + | | + | | | | + | | | | |
| Meninqokok infeksiyası | + | | | + | + | | | + | | | |

| | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| Hemorragik qızdırmalar | + | + | + | + | | | + | + | | | |
| Qara yara | + | | | | | | + | | | | |
| Qızılca | + | | | | + | + | | | | | |
| Koronavirus infeksiyası | | | | | | + | | | | | |
| Poliomielit | | | | | | + | | | | | |
| Leptospiroz | + | + | + | | | | | | | | |
| Malyariya | | | + | + | | + | + | | | | |
| Virus hepatiti | | + | | + | | | | | | + | |

Beləliklə, sürətlə yayılma təhlükəsinə, qorxulu ağırlaşmalarına, insanın uzunömürlüyünə, əmək və döyüş qabiliyyətlərinə, hamiləliyə və dölə mənfi təsirlərinə, böyük iqtisadi məsrəflərinə görə infeksion xəstəliklər həmişə dövlətin və cəmiyyətin diqqət mərkəzində olmalıdır. Kəskin dövründə ciddi ağırlaşmalar, bəzən davamlı qalıq əlamətləri, somatik, cərrahi və onkoloji xəstəliklər verməsi onları insanın ümumi patologiyasının aktual sahələrindən birinə çevirir.

Hər il dünyada milyonlarla insan virus hepatitləri, maylariya, şigelloz, qızılca, İİV – infeksiya, hemarrogik qızdırmalardan həyatını itirir. 2020-2022-ci illər ərzində koronavirusun müxtəlif variantları ilə 700 mln-dan çox insanın xəstələnməsi və 6 mln-dan çoxunun ölməsi qeydə alınmışdır. Xəstəliyin kəskin əlamətlər dövrü bahalı müalicə xərcləri, xəstəlikdən sonra isə uzunmüddətli reabilitasiya mərhələsi həm ölkələrin, həm də ayrı-ayrı fərdlərin ailə büdcəsinə böyük yük olur. Görülən bütün profilaktik tədbirlərə baxmayaraq, virusun genomunun dəyişilməsi və xəstəliyin epidemiya dalğaları davam edir. Koronovirus infeksiyası və lokal hərbi münaqişələr səbəbindən indi dünyada 1,4 mlrd insan aclıq keçirir. Yəqin ki, fəlakətin qarşısını almaq hələ çox vaxt və vəsait tələb edəcək.

Bəşəriyyətə qədimdə məlum olan taun, vəba, cüzam, leyşmaniozlar və qara yaranın hələ də kökü kəsilməyib (Vasil, 2002:3; Bogomolov, 2012:240; David, 2004:223). Hal-hazırda bu xəstəliklər sporadik şəkildə təsadüf edilir. Lakin təbii – ocaqlı, zoonoz infeksiya olaraq onların yayılma təhlükəsi heç vaxt istisna edilmir. Hətta vaxtilə insan üçün təhlükəsiz sayılan meymun çiçəyinin indi 68 ölkədə yayılmasına və 4000-dən çox insanda yoluxma verməsinə görə ÜST onun pandemiyasını elan etmişdir. Yaddan çıxarmaq olmaz ki, difteriya, tetanus, botulizm, qarın yatalağı, meningit və poliomielit indi az rast gəlsələr də kəskin dövrlərində spesifik ağırlaşmalar verməklə qorxulu kritik vəziyyətlər – infeksion-toksiki şok, dehidratasiya və serebral hipertenziya sindromu, kəskin ürək-damar, qaraciyər, ağciyər çatışmazlıqları və s. yaradırlar. Bruselloz, toksoplazmoz, şigelloz, virus hepatitləri isə xroniki formalara keçərək insanı uzun müddət əmək fəaliyyətindən, təhsildən, hərbi xidmətdən ayırır, bəzən hətta əlilliyə səbəb olurlar (Emond, Rowland, Welsby, 1998).

İnfeksion xəstəliklərin xeyli ciddi və heç bir müalicəyə tabe olmayan uzaq nəticələri də rast gəlir. Qızılca və qızılcayabənzər məxmərək (rubella) keçirənlərdə inkişaf edən panensefalitlər, prion infeksiyası buna misal ola bilər. Qızılca, rubella, bruselloz, toksoplazmoz, herpes infeksiyası, epidemik parotit, xlamidozlar ölü doğma, döldə eybəcərliklər, kişi və qadın sonsuzluğu kimi patologiyalar törədirlər.

İnfeksion xəstəliklər ölkənin demoqrafik göstəricilərinə də mənfi təsir göstərir. Epidemiya və pandemiyalar vaxtı yüksək ölüm faizi, xüsusilə uşaqlar arasında ölümün artması əhalinin orta yaş həddini xeyli aşağı salır.

İnfeksion xəstəliklərin qorxulu cəhətlərindən biri də onların törədicilərinin, ya toksinlərinin bioloji silah kimi istifadə olunma təhlükəsidir.

Tarixən qara yaranın, vəbanın, taunun düşmən tərəfindən əsgərlər və əhali arasında yayılması nəticəsində insanların kütləvi xəstələnmələri haqda məlumatlar var (Rudnev, 1956:87). 1905-ci il Rus-Yapon müharibəsi zamanı rus əsgərləri arasında qara yara (rusca “sibir yarası”) yayılmışdır. Məlum olmuşdur ki, rusların Yaponiyadan aldığı əsgər gödəkcəsənin yaxalığına tikilmiş qoyun dərisi əvvəlcədən qara yara mikroblarının sporları ilə çirkləndirilibmiş.

Son vaxtlar insanların həyatına və sağlamlığına zərər vurmaqla siyası və maddi uğur əldə etmək üçün patoloji biogen amillərin terror məqsədilə istifadə olunması təhlükəsi haqda məlumatlar tez-tez gündəmə çıxarılır. Bu hal insanlara böyük psixoloji təsir göstərməklə yanaşı, cəmiyyətdə ciddi təşviş yaradır.

İndi 40-a qədər müxtəlif infeksion törədicilərin və onların toksinlərinin terror məqsədilə istifadə olunması təhlükəsi göstərilmişdir (Stringer, 1998:92). Bunların arasında brusellozun törədiciləri xüsusi yer tutur. Belə ki, brusellalar bioterrorizmin yüksək əhəmiyyətli B qrupuna aid edilir. Buna əsas olaraq insanda brusellozun effektli və təhlükəsiz immun profilaktikasının olmaması, xəstələrin uzunmüddətli və bahalı müalicəsi göstərilir. Brusellalar yüksək inkefsion aktivliyə malik olmaqla yanaşı, onların kulturası hazırlanarkən, istifadə olunarkən və saxlanarkən xeyli dərəcədə davamlılıq göstərirlər. Xəstəlik bütün ölkələrdə rast gəldiyi üçün onun süni yaradılması endemik xəstəliyin yayılması kimi qəbul edilə bilər. Həm də spesifik kliniki əlamətlərinin olmaması, xəstəliyin kliniki gedişinin polimorfizmi erkən diaqnozu da çətinləşdirir (Vəliyev, 2021:83).

Belə güman olunur ki, brusellalardan ibarət 68 kq bioloji kütlə 500 min əhali yaşayan şəhərin üzərinə təyyarə ilə səpilərsə, 6 kv.mil sahədə 500 nəfərin ölməsi, 125 min adamın manifest forma brusellozа tutulması mümkün olar.

Xarici müəlliflərin hesablamalarına görə, *Br.melitensisin* aerozolu terror məqsədilə istifadə edilərsə, 100 nəfərə 477,7 min dollar iqtisadi zərər baş verə bilər. Belə terror hücumu zamanı 413 min adamın ölməsi, 82,5 min xəstənin çox bahalı müalicə tələb etməsi gözlənilir. Belə ki, bir xəstənin klinikada 7-10 günlük müalicəsi 5-7,5 min dollara başa gələ bilər. Yəni tibbi xərclər 10 dəfədən çox artar (Carbel, 2006:89).

Bioterrorizmin kənd təsərrüfatında tətbiqi nəticəsində qida ehtiyatlarının məhv edilməsi ölkənin iqtisadiyyatına böyük zərbə vurar. Bu, əsl iqtisadi müharibə deməkdir (Zubik, 1992).

Bioterrorizmin səbəblərindən biri də botulizmdir. Botulizm törədicilərinin ekzotoksini bütün bakterial və indiyə qədər məlum olan kimyəvi toksinlərdən (sian turşusu da daxil olmaqla) güclüdür. Onun insan üçün minimal letal dozası (MLD) 0,3 mg-dır. Yəni toksinin hazır qida məhsullarına əlavə edilməsi kütləvi zəhərlənmə təhlükəsi yaradır. Bu zaman baş verə biləcək kəskin tənəffüs çatışmazlığının aradan qaldırılması üçün süni tənəffüs aparatına və spesifik müalicə preparatı – yüksək dozada botulizm əleyhinə antitoksik zərdab lazım olacaq. Nəzərə alınmalıdır ki, intensiv terapiya və reanimasiya tədbirləri kifayət qədər olmadıqda botulizm 25-40% ölüm verir.

Keçən əsrin 80-ci illərində respublikamızın bölgələrindən birində iki gün ərzində 140-dan çox qoyunun ölməsi baş vermişdir. Hadisənin səbəbi araşdırılmadan zahirən keyfiyyətli görünən ət ucuz qiymətə əhaliyə satılmışdır. Sonrakı baytar-tibbi araşdırmalar nəticəsində heyvanlar arasında qırğının səbəbinin qara yara olduğu müəyyən edilmişdir. Belə ki, hadisədən 3-4 gün sonra heyvanları kəsən, soyan, əti doğrayan, ambara daşıyanlardan 37 nəfər, onlardan 7-si uşaq olmaqla, qara yaranın dəri formasına tutulmuşlar (Falak, 2004).

Xəstəlik ocağının tapılması üçün aparılan yoxlamalar nəticəsində müəyyən edilmişdir ki, qoyunlar otlayan yonca sahəsində əvvəllər qara yaradan ölmüş heyvan cəmdəyi qalıbmış. Beləliklə, ölmüş heyvanların lazımı qaydada zərərsizləşdirilməməsi (onu yandırmaq, yaxud 2 metr dərinlikdə basırıb həmin yerdə qazma işlərini qadağan etmək) cəsədin qaldığı yeri təhlükəli infeksiya ocağına (“lənətə gəlmiş otlaqlar”) çevirir (Center for diseases control and prevention, 2000).

Yadda saxlamaq lazımdır ki, taun, tularemiya, o cümlədən qara yara və digər zoonoz infeksiyalar heyvanlar arasında yayıldıqdan və ölüm verdikdən sonra insanların xəstələnməsi baş verir. Odur ki, əkin və otlaq sahələrində, vəhşi təbiətdə, çöl və səhra yerlərində gəmiricilərin cəsədlərinin aşkar edilməsi zoonoz infeksiyanın gəmiricilər arasında yayılmasını (epizootiya) göstərməklə insanların da bu xəstəliklərə tutulma ehtimalını yaradır (Kaufman, Mellser, 1992).

## Nəticə

İnfeksion xəstəliklərin törədiciləri insanlar və heyvanlar arasında daima mövcud olmaqla yeni epidemiya və pandemiya təhlükəsi yaradırlar. İlkin xəstələrin diaqnozunun erkən müəyyən edilməməsi və profilaktik tədbirlərin ləngiməsi infeksion xəstəliklərin geniş yayılması, ölüm faizinin artması kimi humanitar problemlər törətməklə yanaşı, infeksiyanın ləvğ edilməsi üçün daha böyük iqtisadi məsrəflərin sərf olunmasını tələb edə bilər.

## Ədəbiyyat

1. Foste, Y., Osterman, B. et al. (2007). Inf. I. Sist evol. Microbiol.
2. Vəliyev, Ə., Əhmədova, Ş.S., İbrahimova, G. (2021). Salmonelloz. Monoqrafiya. Bakı: Təbib nəş., 137 s.
3. Lyamkin, Y., Thenko, N. et al. (2012). Problems of especially dangerous infectious.
4. Nesterov, B. (1992). Emergency conditions. Moscow: Medicine.
5. Monarch disease ontology release. (2009).
6. Vəliyev, Ə. (2020). Qızdırmalı vəziyyət və infeksion xəstəliklərdə onun mənşəyinin araşdırılması haqqında. Azərbaycan Onkologiya jurnalı, s.23-24.
7. İsayev, C. (2009). Yoluxucu xəstəliklər. Bakı: Təhsil NPM.
8. Cholera treatment. (2011). Centers for disease control and prevention.
9. Vasil, N., Tarason, M., Ponlonsky, D. (2002). Biological terrorizm: past and future. Chemical and Biological Safety.
10. Bogomolov, B. (2012). Cholera: clinic, diagnosis, treatment.
11. David, S., Bradley, S. et al. (2004). Lancet.
12. Emond, R., Rowland, H., Welsby, F. (1998). Infectious diseases.
13. Rudnev, A. (1956). Karantinnye bolezni. Moskva: Meditsin.
14. Stringer, K. (1998). Biological weapons and agricultural terrorism.
15. Carbel, M. (2006). Brucellosis in humans and animals. WHO.
16. Zubik, T. (1992). Differential diagnosis of infectious diseases. Moskva: Medisina.
17. Falak, S. (2004). İnfeksion xəstəliklər. 700 s.
18. Center for diseases control and prevention. (2000). Biological and chemical terrorism. Morbidity and Mortality Weekly – Report (MMWR).
19. Kaufman, A., Mellser, M. et al. (1992). Weapons and military equipment.

Göndərildi: 15.07.2022 Qəbul edildi: 20.09.2022

DOI: https://doi.org/10.36719/2663-4619/83/113-117

**Şəhla Nihan qızı Əliyeva**
V.Y.Axundov adına Elmi-Tədqiqat
Tibbi Profilaktika İnstitutu
biologiya üzrə fəlsəfə doktoru
shahlaaliyeva1969@gmail.com

# ÜÇGÜNLÜK MALYARİYA TÖRƏDİCİSİNİN *İN VİTRO* KULTİVASİYASINDA RETİKULOSİTLƏRİN VƏ PRİMAT ERİTROSİTLƏRİNİN TƏTBİQİ

## Xülasə

Məlum olduğu kimi, üçgünlük malyariya törədicisi olan P.vivax-ın merozoitləri, əsasən, cavan retikulositlərə üstünlük verir. Bu, onların səthində çoxlu reseptorların olması ilə əlaqədardır (DARC, CD71 və s.). Retikulositlər normositlərə çevrilərkən bir çox reseptorlarını itirir, bu da P.vivax merozoitlərinin yetkin eritrositlərə daxil olmasına əngəl törədir.

P.vivax-ın kultivasiyası sahəsində gələcək işlər parazitin *in vitro* inkişafında cavan retikulositlərin səthindəki çoxsaylı reseptorlarının rolunu müəyyənləşdirməyə yönəlməlidir. Həmçinin P.vivax-ın retikulositlərə tropizminin əsasında duran reseptor-liqand əlaqələrinin araşdırılması da çox önəmlidir.

Bəzi primat növləri (S.boliviensis) Plasmodium vivax üçün *in vivo* sahib orqanizm hesab olunur. Bu səbəbdən törədici bu meymun eritrositlərində *in vitro* şəraitdə uzun müddət saxlanıla bilir. Göstərilən istiqamətdə tədqiqatların davam etdirilməsi üçgünlük malyariya törədicisinin molekulyar biologiyasının öyrənilməsi üçün çox əhəmiyyətlidir.

***Açar sözlər:*** *malyariya, P.vivax, fasiləsiz kultura, merozoitlər, invaziya, retikulositlər, meymun eritrositləri*

**Shahla Nihan Aliyeva**

## Application of reticulocites and erythrocytes of primats in cultivation of the three-day malaria in vitro

## Abstract

As is known, the merozoites of the three-day malaria pathogen P.vivax prefer young reticulocytes. This is due to the presence of many receptors on their surface (DARC, CD71, etc.). When reticulocytes become normocytes, they lose many of their receptors, which prevents P.vivax merozoites from entering mature erythrocytes.

Further work on the cultivation of P.vivax should be aimed at determining the role of multiple receptors on the surface of young reticulocytes in the development of the parasite *in vitro*. It is also very important to investigate the receptor-ligand relationships underlying P.vivax tropism for reticulocytes.

Some primate species (S.boliviensis) are considered *in vivo* hosts for Plasmodium vivax. For this reason, *in vitro*, the pathogen can persist for a long time in the erythrocytes of this monkey. Continued research in this direction is very important for studying the molecular biology of the causative agent of three-day malaria.

***Keywords:*** *malaria, P.vivax, continuous culture, merozoites, invasion, reticulocytes, monkey erythrocytes*

## Giriş

Üçgünlük malyariya törədicisi olan *Plasmodium vivax* geniş yayılmış insan malyariyası parazitlərindən olub, dünyanın 95 ölkəsində (Gething, Elyazar, Moyes, 2012:1814), (Howes, Battle, Mendis, 2016:15-34) milyonlarla insanın həyatını təhlükə altına qoymuşdur. Dünya əhalisinin təxminən 40%-i üçgünlük malyariyaya yoluxma riski ilə üz-üzədir. Parazitin özəl biologiyası, qaraciyərdə gipnozoid mərhələsinin mövcudluğu (Markus, 2017: 492-5), (Markus, 2018:1765-71) sümük iliyindəki gizli infeksiya rezervuarı (Obaldia, Meibalan, Sa, 2018:00625) xəstəliyin şiddətini daha da artırır. Sonda sadalananlar malyariya residivlərinin başlıca səbəbidir.

Üçgünük malyariya ilə effektli mübarizə üçün əvvəlcə törədicinin uzunmüddətli kulturası əldə edilməlidir. *P.vivax*-ın fasiləsiz kulturanın alınması parazitin biologiyasının öyrənilməsi, mövcud

dərmanlara həssaslığın araşdırılması, vaksin və yeni dərman preparatları hazırlanması baxımından çox əhəmiyyətlidir.

Hal-hazırda qarşıda duran əsas məsələlərdən biri *P.vivax*-ın fasiləsiz kulturasını təmin edə biləcək metodologiyanın işlənib hazırlanmasıdır (Golenda, Li, Rosenberg, 1997:6786-91).

Məlum olduğu kimi, digər plazmodium növləri (*P.falciparum, P.knowlesi* və *P.malariae)* yetkin eritrositlərə − normositlərə, *P.vivax* və *P.ovale* isə retikulositlərə üstünlük verir. *P.falciparum*-un uzunmüddətli kulturasının alınması invaziyanın qarşısını ala biləcək metodların işlənib-hazırlanmasına imkan verirkən (Cowman, Tonkin, Tham, 2017:232-245), (Draper, Sack, King, 2018:43-56) *P.vivax*-ın uzunmüddətli kulturasının olmaması bu şansdan məhrum edir (Kanjee, Rangel, Clark, 2018:109-115).

Tropik malyariyanın törədicisi olan *P.falciparum*-un *in vitro* uzunmüddətli kulturasının alınması parazitin həyat tsiklinin müəyyənləşdirilməsi, vaksin komponenti kimi tədqiq olunmuş bir çox zülalın aşkar olunmasına güclü təkan vermişdir. Əfsus ki, *P.falciparum*-un fasiləsiz kulturası üçün effektiv olan metod *P.vivax*-ın uzunmüddətli kulturasının alınmasında özünü doğrultmadı.

XIX əsrdən başlayaraq üçgünlük malyariya törədicisinin fasiləsiz kulturasının alınması üçün müxtəlif cəhdlər edilsə də, onların hamısı uğursuzluqla nəticələnmişdir. Yalnız 1980-ci ildə *P.vivax* kulturasını mühitə retikulosit əlavə edərək, bir ay müddətində saxlamaq mümkün olmuşdur. Bu zaman retikulositlər sağlam insanın və hemoxromatozlu xəstənin qanından alınmışdır. Həmçinin müəyyən edilmişdir ki, gələcəkdə *P.vivax*-ın *in vitro* kulturasının eritroblastların köməyilə stabil aparılması mümkündür.

Qeyd edildiyi kimi, *P.vivax,* əsasən, cavan eritrositləri (retikulositlər) zədələyir. Retikulositlər yetkin insanın periferik qanındakı eritrositlərin təxminən 1-2%-ni təşkil edir. Plazmodium merozoitləri yumurta formalı olub, ucları azca sivridir. Adhezinlər merozoitin apikal ucunda, rottir və mikronemlər kimi sekretor orqanellalar olan hissədə yerləşib, eritrositlərin spesifik reseptorları ilə birləşməni təmin edir və beləliklə parazit eritrositə daxil olur. *P.vivax*-ın fasiləsiz kulturasının alınmaması səbəblərindən biri merozoitlərin sahib hüceyrəyə daxil ola bilməməsidir. *P.vivax*-ın retikulositlərə meylliliyi 1930-cu illərdə aşkarlansa da, bu spesifikliyi şərtləndirən eritrosit komponentləri hələ də naməlum qalır və bu istiqamətdə tədqiqatlar davam etdirilir.

**Üçgünlük malyariya törədicisi kulturasında retikulositlər. *P.vivax*-ın retikulositlərə daxil olma yolları**

*P.vivax*-ın cavan retikulositlərə tropizmi daha dəqiq müəyyənləşdirilmiş retikulosit subpopulyasiyalarının istifadəsi ilə invaziyanın analizinə sövq etmişdir. Bunlar müxtəlif ekspressiya səviyyəli 4 populyasiyadır: $CD71^-$, $CD71^{low}$, $CD71^{medium}$, $CD71^{high}$. Bu retikulosit subpopulyasiyaları arasında kimyəvi və mexaniki fərqlər Mallaret və b. (Malleret, Xu, Mohandas, 2013:76062) tərəfindən qeydə alınmışdır. Tədqiqat nəticəsində *P.vivax* invaziyası üçün CD71-in yeganə reseptor kimi qəbul edilməsinin yanlış olduğu nəticəsinə gəlinib. Çünki CD71-ə monoklonal antitellərin təsiri ilə və ya tripsinizə edilmiş retikulositlərlə (CD71 tripsinə həssasdır) aparılan araşdırmalarda invaziya faizi dəyişməmişdir (Russell, Suwanarusk, Borlon, 2011:e74-e81).

Retikulositlərin $CD71^+$ fraksiyasına əsaslanan araşdırmalar çox vacib postinvazion modifikasiyanı aşkara çıxarmışlar. *P.vivax*-la invaziya yoluxmuş retikulositlərdən bir çox maddələrin (həmçinin CD71) xaric olunmasına gətirir. İnvaziyadan dərhal sonra yoluxmuş retikulositlərin böyük faizi $CD71^+$, yoluxmamış retikulositlərinki isə $CD71^-$ idi. İnvaziyadan sonra 3-6 saat ərzində *P.vivax*-la yoluxmuş $CD71^+$ retikulositlər güclü deformasiyaya uğramış $CD71^-$ qırmızı qan hüceyrələrinə çevrilmiş və retikulyar maddəni tamamən itirmişlər. Yoluxmamış retikulositlər üçün bu proses adətən 24 saat ərzində başa çatır. Üçgünlük malyariya törədicisi ilə yoluxmuş cavan retikulositlərin sürətli remodelləşməsi − yoluxma anından keçən 6 saat ərzində $CD71^+$ cavan retikulositlərin deformasiya olunmuş $CD71^-$ retikulositlərə çevrilməsi təəccüb doğurur.

Standart şərtlər daxilində yetişən retikulositlərdən CD71-in itməsi ekzositoz nəticəsində (ekzosomların iştirakı ilə) gedir. Yoluxmuş eritrositlərdə müşahidə olunan çıxıntılarsa ekzosomu yox, mikrovezikulu xatırladırdı (Raposo, Stoorvogel, 2013:373-383).

Tədqiqat nəticəsində *P.vivax*-la yoluxmuş retikulositlərin membran nanostrukturunda da dəyişiklik müşahidə edilmişdir. Belə ki, yenicə yoluxmuş $CD71^+$ retikulositlərin səthində mikrovezikulyar strukturlardan başqa 100 nm diametrli dəliklər də aşkar olunmuşdu. Lakin onların klatrin zülalları üçün və ya CVC (Caveolae vesicle complexes) üçün olduğu məlum olmamışdı.

*P.vivax* merozoitləri yalnız transferrin reseptorunun (CD71) ekspressiya səviyyəsinə görə müəyyənləşən retikulositlərin heterogen populyasiyasını invaziya edə bilirlər. Retikulositləri inkişaf

mərhələlərinə görə çeşidləməyə imkan verən protokolun işlənib hazırlanması ilk dəfə *P.vivax* merozoitlərinin invaziyasını öyrənməyə imkan vermişdir. Məhz cavan retikulositlər ($CD71^+$) parazit tərəfindən invaziya olunur, əsasən periferik qanda təsadüf edilən yetkin retikulositlər ($CD71^-$) isə nadir hallarda invaziyaya məruz qalır. Bu faktlar – parazitin cavan retikulositlərə seçiciliyi və sahib hüceyrələrin sürətli remodelizasiyası – *P.vivax*-ın patobiologiyasına aid olan vacib informasiyadır.

*P.vivax* merozoitlərinin $CD71^+$ retikulositlərinə tropizmi, $CD71^-$ retikulositlərinin isə invaziyaya müəyyən qədər davamlı olduğunun müəyyənləşməsi gözlənilməz idi. $CD71^-$ retikulositləri əsasən periferik qanda, $CD71^+$ cavan retikulositləri isə sümük iliyində lokallaşır (Malleret, Xu, Mohandas, 2013:76062). Bu fakt *P.vivax* invaziyasının əsasən qanda deyil, sümük iliyində getdiyi haqda fikir söyləməyə imkan verir.

*P.vivax* üçün retikulositlərin əsas reseptorunu identifikasiya etmək cəhdlərinə mane olan faktorlardan biri də retikulosit populyasiyasının heterogenliyidir. Bu heterogenlik ilk dəfə 1930-cu illərdə Heilmeyer tərəfindən təsnifləndirilmişdi. Retikulositlər 72 saat ərzində nüvəsini itirib bir sıra biokimyəvi, biofiziki və metabolik dəyişikliklərə məruz qalaraq normositlərə çevrilir. Kürəvi cavan retikulosit məhv olmuş orqanellalarını (retikulyar maddə) ataraq öz membran səthinin böyük hissəsini itirir. Çevrilmə prosesində retikulosit bir çox reseptorlarını da itirir (Blanc, Vidal, 2010:177-183). Normosit formalaşan zaman onda artıq transferrin reseptoru (CD71) olmur. Bu reseptor retikulositin yaşının dəqiq müəyyənləşdirilməsi üçün vacib biomarkerdir (Malleret, Xu, Mohandas, 2013:76062).

İlk dəfə Marchiafava və onun həmkarları 1880-ci illərdə malyariya parazitlərini sümük iliyində müşahidə etmişlər. Bu müşahidələr 1920-ci illərin əvvəllərində patogenlərin diaqnostikası üçün sternal punksiyanı (sümük iliyinin aspirasion biopsiyası) təklif edən Seyfarth tərəfindən təsdiqlənmişdi. Müəlliflər belə qərara gəlmişlər ki, malyariya parazitləri əgər qanda aşkar edilibsə, onlar sümük iliyində mütləq tapılacaq. Lakin bəzən onlar qanda müşahidə edilmədikdə də sümük iliyində lokallaşa bilirlər. Həqiqətən sümük iliyində parazitemiya periferik qandakından 2 dəfə çox olmuşdur. Qan yaxmaları neqativ göstərən bir çox pasientdə yalnız sternal punksiyadan sonra *P.vivax* ilə yoluxma aşkar edilmişdi. Bu müşahidələr sümük iliyinin *P.vivax*-ın toplandığı yer və iliyin parazitin patobiologiyasında mühüm rol oynadığı haqda mülahizə yürütməyə imkan verir.

*P.vivax*-ın CD71 daşıyan klatrin zülallarının itirilməsində rolu hələ məlum deyil. Parazitlə yoluxma çıxıntılı cavan retikulositlərin deformasiyasına səbəb olur. Belə güman olunur ki, yoluxmuş eritrositləri dalağın klirensindən qorumaq üçün adaptasiya prosesidir.

Retikulositlərin sümük iliyində və periferik qanda mövcud olan 2 müxtəlif sinfi vardır (Griffiths, Kupzig, Cogan, 2012:1150-1151). Sümük iliyi kompartmentində olan R1 retikulositləri nüvəsini itirmiş və hərəki formalıdır. R2 retikulositləri sümük iliyindən periferik qana keçiblər, stabil və hərəkətsizdirlər. Sümük iliyində və periferik qanda retikulositlər yetişən zaman onlar öz orqanellalarının hamısını və plazmatik membran səthinin 20%-ni itirir (Moras, Lefevre, Ostuni, 2017:1076). Retiklositlər bəzi səth zülalları ekspressə edir ki, bunlar da normositlərə dönüşürkən itir. CD71 (transferrin receptoru 1, TfR1), CD49d, CD151, CD81, CD82 yetkin eritrositlərlə müqayisədə yalnız cavan retikulositlərdə olur (Thomson-Luque, Wang, Ntumngia, 2018: 22-33).

Üçgünlük malyariya törədicilərinin retikulositlərə invaziyası retikulosit bağlayıcı zülallar (PvRBP) vasitəsilə həyata keçirilir. Bir neçə *P.vivax* izolyatlarının genom sıralaması (sequencing) PvRBP ailəsindən 11 zülal təyin etmişdir. *P.vivax* merozoitlərinin apikal qütbündə yerləşən 2 zülal (PvRBP-1a və PvRBP-2c) retikulositlərlə birləşib yüksək molekulyar kompleks yaradır.

Retikulositlərə daxil olmanın digər yolları da mövcuddur. 1970-ci illərdən məlumdur ki, *P.vivax*-ın eritrositlərə invaziyası Duffy Antigen Receptor for Chemokine (DARC) adlanan reseptordan asılıdır. Duffy zülalı xemokin reseptorudur, rəsmi olaraq atypical chemokine receptor 1 (ACKR 1) adlanır. *P.vivax*-da DARC-la əlaqə quran Duffy Binding Protein (PvDBP) mövcud olmalıdır. Zülal parazitin retikulositlərə keçməsini təmin edir. Lakin DARC həm normositlərdə, həm də retikulositlərdə mövcuddur. Bu səbəbdən də parazit tərəfindən retikulositlərin spesifik tanınmasını təmin edə bilməz. Buna baxmayaraq PvDBP və cavan retikulositlərdə DARC tanınmasına xidmət edən xüsusi mexanizmin olduğu və bu mexanizmin köməyilə parazitin əsasən cavan retikulositləri seçməsi haqda mülahizələr yürüdülür (Ovchynnikova, Aglialoro, Bentlage, 2017:1441-1444).

Uzun illər belə güman olunurdu ki, eritrosit səthində Duffy zülalının olmaması *P.vivax*-a qarşı təbii müdafiəni təşkil edir. Belə ki, Duffy qan qrupu əsas parazit liqandı olan *P.vivax* Duffy binding protein (PvDBP) üçün reseptor rolunu oynayır. 10 illər boyu gəlinən nəticəyə görə Afrika ölkələrində üçgünlük

malyariya demək olar ki, yayılmayıb, çünki bu regionun əhalisində parazitin eritrositə daxil olmasında əsas rol oynayan qırmızı qan hüceyrələri reseptoru – Duffy zülalı yoxdur. Son 20 ildə bu doqma şübhə altına alınıb, belə ki, Afrikanın özündə də, əhalinin böyük faizini Afrika mənşəlilər təşkil edən Cənubi Amerikada da Duffy reseptoru olmayan şəxslər arasında üçgünlük malyariyaya yoluxma halları qeyd olunmuşdu. İndi artıq məlumdur ki, parazit bu müdafiəni yarıb Duffy neqativ şəxslərdə də klinik malyariya törədə bilir. Bu prosesin mexanizmləri hələlik məlum deyil.

**P.vivax-ın kulturası üçün *ex vivo* primat eritrositlərinin tətbiqi**

*P.vivax*-ın fasiləsiz kultivasiyası üçün optimal şəraitin tapılması tədqiqatçıların diqqət mərkəzindədir (Noulin, Borlon, Van Den Abbeele, 2013:286-94), (Tham, Beeson, Rayner, 2017:111-118). Bu məqsədlə bir sıra araşdırmalarda *P.vivax* kulturası üçün primatların qanından istifadə edilmişdir.

Qolenda və Rozenberqin (Golenda, Li, Rosenberg, 1997:678691) işlərində kultura şəraitində həm retikulosit invaziyası, həm hüceyrələrdə parazitlərin yetkin şizonta qədər qorunması, həm də sahib hüceyrənin qorunması nəzərdə tutulurdu. Tədqiqatda Aotus cinsi meymunlarına adaptasiya olunmuş üçgünlük malyariya törədicisi daha yetkin mərhələlərə qədər inkişaf edib yenidən merozoit mərhələsində hemoxromatozlu xəstənin retikulositlərinə daxil ola bilmişdir. Onlar üçgünlük malyariya törədicisinin *Chesson* ştammını meymun eritrositlərindən insan retikulositlərinə keçirmiş, L-qlutamin, HEPES buferi, 20% AB+ insan qan zərdabı ilə modifikasiya edilmiş McCoy`s 5A qidalı mühitində kultivasiya etmişlər. Retikulositlər differensial sentrifuqə yolu ilə hemoxromatozlu xəstənin periferik qanından alınmışdı. Parazitlər hər 48 saatlıq tsikl boyu içində şam olan qabda statik mühitdə şizoqoniya mərhələsi başlayana qədər saxlanılmış, təxminən 36-40 saatdan sonra retikulosit əlavə olunaraq 10-12 saatlıq şeykerə keçirilib dinamik hala gətirilmişdi. Bu, parazit və sahib hüceyrə arasında maksimal kontaktı mümkün edirdi. Eritrositlərin invaziyası baş tutan kimi parazit üzük və cavan trofozoit mərhələsində böyümə və differensiasiya üçün yenidən statik kultura mühitinə keçirilmişdi. Aşkar olunmuşdu ki, Mons et al (Mons, Collins, Skinner, 1988:183-188) qeyd etdikləri kimi qarışdırılan kulturada invaziya sürətlənir. 10% retikulosit əlavəsi isə parazit sıxlığını 3 tsikldən sonra təxminən 2 dəfə artırmışdı.

Mons et al (Mons, Collins, Skinner, 1988:183-188) *P.vivax*-ın şeyker vasitəsilə həyata keçirilən dinamik kulturası üçün meymunlardan alınmış və retikulositlərlə zənginləşdirilmiş qandan istifadə etmişlər. *P.vivax*-la yoluxdurulmuş *Aotus nancymai* meymunları donor rolunu oynamış, izolə edilmiş parazitlər fasiləsiz çalxalanmaqla 20% AB+ qan zərdablı standart RPMİ-1640 qidalı mühitində saxlanmışlar. Yetkin şizontlar aşkar olunduqda kulturaya süni induksiya edilmiş meymun eritrositləri əlavə etmişlər. Fasiləsiz çalxalama və retikulosit əlavəsi *in vitro* şəraitdə güclü reinvaziya üçün lazım idi. Tədqiqat nəticəsində retikulosit faizi və *in vitro* invaziya arasında müsbət korrelyasiya müşahidə edilmişdir.

Bəzi araşdırmaçılar *Saimiri boliviensis* meymunlarının qanından istifadə etmiş (Anderson, Lapp, Barnwell, 2017:0182561) və aşkara çıxarmışlar ki, *P.vivax*-ın müəyyən qədər uzunmüddətli kulturası *S.boliviensis* eritrositlərində mümkündür (Mehlotra, Blankenship, Howes, 2017:442). Bu meymun *in vivo P.vivax* üçün sahib orqanizm hesab edilir. *İn vitro* parazitin bu meymunun eritrositlərində fasiləsiz saxlana bilməsi *P.vivax*-ın molekulyar biologiyasının öyrənilməsi üçün çox əhəmiyyətlidir.

## Nəticə

Üçgünlük malyariya törədicisinin fasiləsiz kulturasının əldə edilməməsi dünyanın 95 ölkəsində yayılmış bu malyariya növünə qarşı mübarizəni çətinləşdirir, xəstəliyə qarşı effektli dərman vasitələrinin və vaksinin hazırlanmasını mümkünsüz edir. *P.vivax,* əsasən, cavan eritrositləri (retikulositlər) zədələyir. Retikulositlər yetkin insanın periferik qanındakı eritrositlərin təxminən 1-2%-ni təşkil edir. Lakin retikulositlərdən, bahalı qidalı mühitlərdən, insan qan zərdabından, bir sıra bahalı bioloji aktiv əlavələrdən və dinamik kultura sistemindən istifadə etməklə də *P.vivax*-ın fasiləsiz kulturasını almaq mümkün olmayıb. Fasiləsiz kulturanın alınmamasında digər səbəb malyariya ilə yoluxmuş insandan izolə edilən nümunədə parazitemiyanın çox aşağı faizdə olmasıdır. Buna görə bəzi tədqiqatçılar *P.vivax*-ın *in vitro* kulturası üçün üçgünlük malyariya ilə yoluxdurulmuş primat eritrositlərindən istifadə etmişlər. Lakin retikulositlər çətin əldə edildiyinə, meymun eritrositlərinin isə tətbiqi maliyyə cəhətdən bahalı olduğuna görə *P.vivax*-ın *in vitro* fasiləsiz kultivasiyası metodunun optimallaşdırılması məqsədilə tədqiqat işləri davam etdirilir.

## Ədəbiyyat

1. Gething, P.W., Elyazar, I.R., Moyes, C.L. et al. (2012). A long neglected world malaria map: *P.vivax* endemicity in 2010. PLoS Negl Trop Dis., Vol.6, p.e1814.
2. Howes, R.E., Battle, K.E., Mendis, K.N. et al. (2016). Global epidemiology of *Plasmodium vivax*. Am J Trop Med Hyg., Vol.95, p.15-34.
3. Markus, M.B. (2017). Malaria eradication and the hidden parasite reservoir. Trends Parasitol., 33:p.492-5.
4. Markus, M.B. (2018). Biological concepts in recurrent *Plasmodium vivax* malaria. Parasitology, 145:p.1765-71.
5. Obaldia, N., Meibalan, E., Sa, J.M. et al. (2018). Bone marrow is a major parasite reservoir in *Plasmodium vivax* infection. MBio., 9:p.00625.
6. Golenda, C.F., Li, J., Rosenberg, R. (1997). Continuous *in vitro* propagation of the malaria parasite *Plasmodium vivax*. Proc Natl Acad Sci USA, 94:p.6786-91.
7. Cowman, A.F., Tonkin, C.J., Tham, W.H. et al. (2017). The molecular basis of erythrocyte invasion by malaria parasites. Cell Host & Microbe, 22:p.232-245.
8. Draper, S.J., Sack, B.K., King, C.R. et al. (2018). Malaria Vaccines: Recent Advances and New Horizons. Cell HostMicrobe, 24:p.43-56.
9. Kanjee, U, Rangel, G.W., Clark, M.A. (2018). Molecular and cellular interactions defining the tropism of *Plasmodium vivax* for reticulocytes. Current Opinion in Microbiology, 46:p.109-115.
10. Malleret, B., Xu, F., Mohandas, N. et al. (2013). Significant biochemical, biophysical and metabolic diversity in circulating human cord blood reticulocytes. PLoS ONE, 8:p.76062.
11. Russell, B., Suwanarusk, R., Borlon, C. et al. (2011). A reliable *ex vivo* invasion assay of human reticulocytes by *Plasmodium vivax*. Blood., 118 13:p.e74-e81.
12. Raposo, G., Stoorvogel, W. (2013). Extracellular vesicles: exosomes, microvesicles, and friends. J Cell Biol., 200 4:p.373-383.
13. Blanc, L., Vidal, M. (2010). Reticulocyte membrane remodeling: contribution of the exosome pathway. Curr Opin Hematol, 17, 3:p.177-183.
14. Griffiths, R.E., Kupzig, S., Cogan, N. et al. (2012). The ins and outs of human reticulocyte maturation: Autophagy and the endosome/exosome pathway. Autophagy, 8:p.1150–1151.
15. Moras, M., Lefevre, S.D., Ostuni, M.A. (2017). From erythroblasts to mature red blood cells: Organelle clearance in mammals. Frontiers in Physiology., 8:p.1076.
16. Thomson-Luque, R., Wang, C., Ntumngia, F.B. et al. (2018). In-depth phenotypic characterization of reticulocyte maturation using mass cytometry. Blood Cells, Molecules & Diseases., 72:p.22-33.
17. Ovchynnikova, E., Aglialoro, F., Bentlage, A.E.H., et al. (2017). DARC extracellular domain remodeling in maturating reticulocytes explains *Plasmodium vivax* tropism. Blood., 130:p.1441.
18. Noulin, F., Borlon, C., Van Den Abbeele, J. et al. (2013). 1912–2012: a century of research on *Plasmodium vivax in vitro* culture. Trends Parasitol., 29:p.286-94.
19. Tham, W.H., Beeson, J.G., Rayner, J.C. (2017). *Plasmodium vivax* vaccine research - we've only just begun. Int J Parasitol., 47:p.111-118.
20. Mons, B., Collins, W.E., Skinner, J.C. (1988). *Plasmodium vivax: in vitro* growth and reinvasion in red blood cells of Aotus nancymai. Exp Parasitol., 66(2), p.183-188.
21. Anderson, D.C., Lapp, S.A., Barnwell, J.W. et al. (2017). A large scale *Plasmodium vivax* − *Saimiri boliviensis* trophozoite − schizont transition proteome. PLoS ONE, 12:p.0182561.
22. Mehlotra, R.K., Blankenship, D., Howes, R.E. et al. (2017). Long-term *in vitro* culture of *Plasmodium vivax* isolates from Madagascar maintained in *Saimiri boliviensis* blood. Malar J.,16:p.442.

Göndərildi: 03.08.2022 Qəbul edildi: 10.09.2022

DOI: https://doi.org/10.36719/2663-4619/83/118-124

**Aidə Nizami qızı Əsgərova**
Heyvandarlıq Elmi Tədqiqat İnstitutu
texnika elmləri üzrə fəlsəfə doktoru
aida.asgarova1@gmail.com
**Tural Vaqif oğlu Abbasov**
Heyvandarlıq Elmi Tədqiqat İnstitutu
turalabbasov922@gmail.com
**Dilarə Əmirxan qızı Sultanova**
Heyvandarlıq Elmi Tədqiqat İnstitutu
dilara.sultanova.00@ bk.ru

# HOLŞTEYN-FRİZ CİNSLİ İNƏKLƏRİN YEM PAYINDA PREMİKS VƏ YEM MAYASINDAN İSTİFADƏNİN SÜD MƏHSULDARLIĞINA TƏSİRİ

**Xülasə**

Heyvandarlığın, o cümlədən iribuynuzlu qaramal yetişdirilməsi sahəsinin intensiv inkişaf etdirilməsinin ölkədə ərzaq təhlükəsizliyinin təmin edilməsi və əhalinin heyvan mənşəli qida məhsullarına olan tələbatının ödənilməsində böyük əhəmiyyəti vardır. Ət, süd, yumurta və digər bu kimi ərzaq məhsulları məhz heyvandarlıq sahəsində əldə olunduğundan, heyvandarlığın intensiv üsullarla inkişaf etdirilməsi bu sahədə çalışan alim və mütəxəssislər qarşısında duran ən vacib məsələdir. Fermerlərimizin qarşısındakı vacib problemlərdən ən əsası yemin xam komponentlərinin bahalı olmasıdır. Xüsusən də qaba yem qiymətlərinin bahalı olması, yüksək məhsul ala bilməyən təsərrüfatların istiqamət dəyişməsinə, yaxud bağlanmasına gətirib çıxarır.

Qeyd etmək lazımdır ki, heyvanların sağlam yetişdirilməsi, məhsuldarlığının artırılması və məhsulun keyfiyyətinin yaxşılaşdırılması bilavasitə onların yemləndirilməsindən asılıdır. Normal qidalanma heyvan sağlamlığının təmin olunmasında əsas amillərdən biri hesab edilir. Odur ki, tərtib olunan yem rasionları zəruri qida maddələri ilə balanslaşdırılmalı, heyvanlar üçün yemlərin tərkibi və strukturuna uyğun olaraq optimal qidalanma rejimi təşkil olunmalıdır.

***Açar sözlər:*** *ərzaq təhlükəsizliyi, yemləndirmə, məhsuldarlıq qabiliyyəti, yem rasionları, yem qiymətləri*

**Aida Nizami Asgarova**
**Tural Vagif Abbasov**
**Dilara Amirkhan Sultanova**

# The effect of the use of premix and feed yeast in feed share of Holstein-Fries cows on milk productivity

**Abstract**

Intensive development of animal husbandry, including cattle breeding, is of great importance in ensuring food security in the country and meeting the population's demand for food products of animal origin. Since meat, milk, eggs and other such food products, which are the most important and high-quality protein of the population, are obtained in the field of animal husbandry, the development of animal husbandry by intensive methods is the most important issue facing scientists and specialists working in this field. One of the most important problems facing our farmers is the high cost of raw feed components. In particular, high feed prices lead to the change of direction or closure of farms that cannot get high yields.

It should be noted that the healthy breeding of animals, increasing their productivity and improving the quality of the product directly depends on their feeding. Normal nutrition is considered one of the main factors in ensuring animal health. Therefore, the prepared feed rations should be balanced with the

necessary nutrients, and an optimal feeding regime should be organized according to the composition and structure of animal feeds.
***Keywords:*** *food security, feeding, productivity, feed rations, feed prices*

## Giriş

Heyvandarlığın intensiv üsullarla inkişaf etdirilməsi, bu sahədə çalışan alim və mütəxəssislər qarşısında duran ən vacib məsələdir. Ona görə də Azərbaycan xalqını kifayət qədər ekoloji baxımdan təmiz heyvandarlıq məhsulları ilə təmin etmək üçün elmi araşdırmalara böyük ehtiyac var (Zeynalov, 1989:23).

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin söylədiyi kimi: "Biz kənd təsərrüfatında islahatları dərinləşdirməliyik. Kənd təsərrüfatı elmi əsaslarla inkişaf etməlidir. Müasir texnologiyalar, yanaşmalar tətbiq olunmalıdır. Biz ərzaq təhlükəsizliyi ilə bağlı bundan sonra da mütləq ciddi iş aparmalıyıq, bu, prioritet məsələdir. Hesab edirəm ki, bu, yaxın gələcəkdə özünü göstərəcək".

Heyvandarlığın sürətli inkişafı fonunda yüksək məhsuldar cinslərin ölkəmizə idxal edilməsi, yüksək qidalılıq dəyərinə malik yem norması (payı) tələb edir (Uyğun Aksoy,2018:34).

Məlum olduğu kimi, canlı orqanizmin varlığı orqanizmdə daimi gedən maddələr mübadiləsi hesabına baş verir. Maddələr mübadiləsi zamanı isə canlı orqanizmdə mütəmadi olaraq qidalı maddələrin sintezi və parçalanması baş verir. Sintez – assimilyasiya, parçalanma isə dissimilyasiya adlanmaqla, maddələr mübadiləsinin əsasını təşkil edib, canlı orqanizmin yaşamasının, həyatının davam etməsinin əsasıdır. Heyvan orqanizmində maddələr mübadiləsinin normal getməsi, xarici mühit amillərindən çox asılıdır. Belə ki, heyvan orqanizmində maddələr mübadiləsinə ən çox təsir edən amil heyvanların yemləndirilməsidir. Yemlərlə orqanizmə daimi qidalı maddələr daxil olur və bunlar maddələr mübadiləsində fəal iştirak edirlər. Heyvan orqanizminə lazım olan əksər qidalı maddələr isə yemlərlə qəbul edilir. Bu yemlərin əsasını isə bitki mənşəli yemlər təşkil edir (Ağabəyli, 1975:15).

Qidalanma – heyvanların orqanizmasında mütəmadi olaraq maddələr mübadiləsinin getməsi üçün əsas şərtdir. Odur ki, heyvanların düzgün yemləndirilməsi çox vacibdir. Yemlərlə bərabər heyvan orqanizminə onun həyat fəaliyyətini davam etdirməsi və məhsul əmələ gətirməsi üçün (ət, süd, yun, yumurta və s.) kifayət qədər tamdəyərli yemləmə aparılmadıqda heyvan pis böyüyür, az məhsul verir. Heyvan orqanizminin normal mövcudluğu üçün hava, su və yemin orqanizma tərəfindən mənimsənilməsi vacibdir (Abdullayev, 2018:25).

Bitki və heyvan mənşəli yemlərdə olan kimyəvi elementlərin 20%-ə qədəri orqanizm üçün gərəklidir. Bu yemlərin tərkibində olan (98,5%) əsas bioloji elementlərdən karbon, oksigen, azot, kalsium 107 və fosfor çox dəyərlidir. K, S, Na, Cl, Mg, Fe, Y, Fr, Sn, Co, Mn, Mo, B, Al isə cüzi miqdardadır. Düzgün qidalanma, həmçinin heyvandan alınan məhsulun kəmiyyət və keyfiyyətinə də təsir edir. Yem südün tərkibinə (yağ, zülal, vitaminlər), ətin və piyin də kəmiyyət və keyfiyyətinə təsir edir. Gövşəyən heyvanların qidalanmasında işkənbədə mikrobların normal fəaliyyəti də nəzərə alınmalıdır. Belə ki, yemə mikroelement duzları və başqa maddələrin qarışdırılması mədə önlüklərində mikrobların fəaliyyətini yaxşılaşdırır. Biostimulyatorlar, antibiotiklər, hormonlar, toxuma preparatları, fermentlər və s. norma əsasında verildikdə maddələr mübadiləsi yüksəlir, böyümə enerjisi və məhsul istehsalı, ət və südün keyfiyyəti yaxşılaşmaqla bərabər, miqdarı da artır. Heyvanların normal, tam balanslaşdırılmış yemlərlə qidalanması bala hələ ana bətnində olarkən həyata keçirilməlidir. Məhsuldar heyvanların, inkişaf edən cavanların qidalanması üçün tam dəyərli qidalanma həyata keçirilməli, onların yem payı bütün qidalı maddələrlə zəngin olan yemlərdən tərtib olunmalıdır (Abdullayev, 2012:106-109).

Qeyd etmək lazımdır ki, yemlərin tərkibinə daxil olan bütün qida maddələrinin heyvan sağlamlığının, eləcə də məhsuldarlığın təmin olunmasında özünəməxsus yeri vardır. Lakin sellüloza və zülalların (proteinlər) əhəmiyyəti digər qida maddələri ilə müqayisədə xüsusi qeyd edilməlidir. Məsələn, gövşəyən heyvanlarda mədənin mürəkkəb (dörd kameralı) quruluşa malik olması rasiona qaba (lifli) yemlərin daxil edilməsi zərurətini yaradır. Belə ki, tərkibində sellülozanın miqdarı çox olan qaba yemlər mədə önlüklərində (xüsusilə işgənbədə) və bağırsaqlarda mövcud olan mikrofauna və mikrofloranın həyat fəaliyyətində böyük əhəmiyyət kəsb edir. Lifli yemlərin həzm prosesinə təsiri böyük olduğundan qaba yemlər qəbul etmədiyi halda, heyvanların sağlamlığında maddələr mübadiləsi ilə bağlı problemlər yaranır. Məlum olduğu kimi, sellülozanın parçalanması nəticəsində yaranan aralıq birləşmələr həm də

heyvan orqanizmində lipid, zülal və enerji mübadiləsinin tənzimlənməsində iştirak edir (Abdullayev, 2012:35).

Heyvanların qidalanmasında zülalların əhəmiyyəti daha böyükdür. Hüceyrə səviyyəsində orqan və toxumaların əsas struktur vahidlərindən biri olan zülallar orqanizmdə həyati əhəmiyyətli proseslərin (çoxalma, böyümə, inkişaf, məhsuldarlıq və b.) və biokimyəvi birləşmələrin (fermentlər, hormonlar, immun cisimlər və b.) əsasını təşkil edir. Aminturşu spektrindən asılı olaraq tam dəyərli zülalların tərkibinə demək olar ki, bütün əvəzolunmaz aminturşuları daxildir. Heyvandarlığın intensiv inkişaf etdiyi müasir dövrdə yemləmənin yalnız rasionun balanslaşdırılması deyil, sinxronluğunun təmin olunması kontekstində təşkil olunması önəmli hesab edilir. Rasionun tərkibindəki enerji və qida maddələrinin heyvan orqanizmi tərəfindən mənimsənilmə səviyyəsini və paralel olaraq məhsuldarlıq göstəricilərinə təsirini əks etdirən bu proses heyvan sağlamlığı təmin olunduğu təqdirdə yemlərin konversiya əmsalının optimallaşması və heyvanların məhsuldarlıq potensialının maksimum realizə olunması ilə nəticələnir.

Respublikamıza yüksək məhsuldar heyvanların gətirilməsi, yem qiymətlərinin kifayət qədər yüksək olması, əldə olan yemin maksimum səviyyədə həzməgedicilik qabiliyyətinə malik olması problemini qarşıya qoyur. Bu problem ölkəmiz üçün də aktualdır. İribuynuzlu heyvanların gündəlik yem rasionunun 55-70%-ni qaba yem təşkil edir. Qalan hissə qüvvəli yemlərin payına düşür. Yem dəyərlərinə görə sutkalıq yem payı tərtib edilsə də, gözlənilən nəticə əldə olunmur. Bunun başlıca səbəbi, yemlərin həzməgedicilik qabiliyyətinin nəzərə alınmamasıdır. Yemlərin birgə qarışdırılması zamanı qələvi-turşu balansı, kalsium-fosfor və s. ilə birgə yemin həzməgedicilik qabiliyyətini də nəzərə almaq vacibdir (Belikova, 2005:13).

Yem norması – yemlərin qidalılıq dəyəri nəzərə alınmaqla normalara uyğun tərtib olunmuş və heyvanların sutkalıq tələbatını ödəyən yem dəstidir. Rasionların tərkibinə daxil olan yemlər heyvanın təbiətinə uyğun seçilməli və rasionun quru maddəsinin miqdarı heyvanın həzm traktının tutumuna münasib olmalıdır. Belə olduqda orqanizmdə fizioloji proseslərin (həzm, mübadilə, mənimsənilmə) optimal gedişatı üçün əlverişli şərait yaranır ki, bu da dolayısı ilə heyvan sağlamlığının təmin olunmasına xidmət edir.

Əvvəllər yem vahidi ilə dəyərləndirilən yem rasionları müasir nomenklaturada enerji vahidi ilə (mübadilə enerjisi) qiymətləndirilir. Bu isə heyvan orqanizminin həyat fəaliyyəti və məhsuldarlığından asılı olaraq enerjiyə olan tələbatının tənzimlənməsində operativliyi təmin edir.

Ümumiyyətlə, heyvanlar üçün tərtib olunan yem normaları mahiyyət etibarı ilə üzvi və qeyri-üzvi maddələrin müxtəlif nisbətlərdə toplusunu əks etdirir. Üzvi maddələrə zülallar, yağlar, karbohidratlar, vitaminlər, azotsuz ekstraktiv maddələr, aminturşuları, amidlər, fermentlər, qeyri-üzvi maddələrə isə minerallar (makro və mikroelementlər), duz və su şamil edilir. Heyvanların növü, cinsi, cinsiyyəti, yaşı və fizioloji vəziyyətindən (boğazlıq, laktasiya dövrü və s.), həmçinin mövcud olan yem ehtiyatı və ilin mövsümündən asılı olaraq yem rasionlarının müxtəlif tipləri (qaba, şirəli, konsentratlı, vitamin, mineral və ya protein əsaslı və s.) mövcuddur. Heyvanların qida maddələrinə olan tələbatını ödəyən və keyfiyyətli yem komponentlərindən təşkil olunan rasionlar tam dəyərli və ya balanslı hesab edilir. Rasionların balanslaşdırılmasında əsas yemlərlə bərabər yem əlavələri, premikslər, biostimulyatorlar, adsorbentlər və digər bioloji aktiv maddələrdən geniş istifadə olunur. Heyvanların yemləndirilməsi problemlərinin aradan qaldırılması istiqamətində işlər aparılır və günbəgün yeni metod və üsullarla təkmilləşdirilmə işi davam etdirilir. Bu işdə fermerlər mütəxəssislərlə sıx əlaqədə olmalı, birgə fəaliyyət göstərməlidir. Bir sözlə, heyvanların yemləndirilməsi elmi əsaslarla təşkil edilməlidir (Levakhin, 2018:42).

Yem əlavələri – qida maddələri və bioloji aktiv maddələrin nisbətini tənzimləməklə heyvanın yem rasionunda balans yaratmaq üçün istifadə olunan istənilən əlavələrdir. Yem əlavələri yemin həzmolunma qabiliyyətini və heyvan orqanizmi tərəfindən mənimsənilmə (qan və limfa sisteminə sorulma) %-ni artırmaqla istehsal olunacaq heyvandarlıq məhsulunun səmərəliliyini və keyfiyyətini artırmaq üçün istifadə olunur (Musayev, 2016:14).

Yem əlavələrinin istehsalı texnologiyaları daim təkmilləşdirilir və daha yüksək keyfiyyətli məhsullar əldə etməyə imkan verir. Ümumiyyətlə, premikslərdən düzgün istifadə olunarsa, heyvanların məhsuldarlığını 5-8% artırmaq mümkündür (orqanizmdə metabolik prosesləri optimallaşdırmaq və yemin həzm qabiliyyətini artırmaqla). Digər tərəfdən, bu məsələyə məhəl qoymamaq, şübhəsiz ki,

metabolik pozğunluqlara və məhsuldarlığın 30-40% və ya daha çox azalmasına səbəb olacaqdır (Bokova, 2008:10).

Heyvanlar üçün yem payı tərtib edilərkən heyvanın süd məhsuldarlığı, köklük dərəcəsi, yaş qrupu ilə yanaşı, mədə-bağırsaq mikroflorası, yemi mənimsəmə qabiliyyəti mütləq nəzərə alınmalıdır. Yuxarıda qeyd etdiyimiz problemləri aradan qaldırmaq, məhsuldarlıq, dölvermə və heyvanın təsərrüfat əhəmiyyətini artırmaq üçün heyvanların rasionuna yem əlavələri (vitamin-premiks) və yem mayaları əlavə etmək məqsədəuyğundur.

Premikslər bu gün məhsuldarlığı, optimal fizioloji vəziyyəti, həmçinin heyvanların immun qorunmasını təmin edən heyvan yeminin əvəzsiz komponentidir. Premikslər heyvan orqanizmi üçün lazım olan bütün vitaminlər, mikro və makroelementlərindən ibarət qarışıq yemə vitamin-mineral əlavələridir. Premiks qarışıq yem istehsalında geniş istifadə edilir. Premikslərin tərkibi əsasən vitaminlər, mikroelementlər, fermentlər, dərmanlar, yaxşı dad verən aromatlar və kəpək qarışığından ibarətdir. Xüsusi reseptlərlə hazırlanıb, təyinatı üzrə qarışıq yemlərin hazırlanmasında geniş istifadə olunur (Belikova, 2005:13-16).

Premiksin komponentlərinin bioloji aktivliyi son dərəcə yüksəkdir. Onların əsas funksiyası heyvanların və quşların qida rasionunda mikroelementlərin (əsasları Cu, Zn, Mn, Co, I, Se) və vitaminlərin (A, D, K, E, B qrupu və s.) çatışmazlığını kompensasiya etməkdir. Az miqdarda premiks 500-600 kq ağırlığında bir inəyin yem payında yuxarıda göstərilən komponentlərin çatışmazlığını doldurmağa kifayət qədər qadirdir (Gulyayeva, 2011:9).

Yem mayası qiymətli zülal və vitamin mənbəyi olmaqla kənd təsərrüfatı heyvanlarının yemi üçün xüsusi olaraq yetişdirilən mayadır. Yem mayasının tərkibində heyvanlar üçün bütün əvəzolunan və az miqdarda əvəzolunmayan amin turşularınından ibarət təxminən 50% xam protein vardır. Həmçinin yem mayası B qrupunun vitaminləri, yağlar, provitamin D2 (erqosterol), minerallar, müxtəlif fermentlər, zülalların və karbohidratların mənimsənilməsini təmin edən hormonlar mənbəyidir (Petrukhin, 1989:165).

Yem mayası mal-qaranın qida rasionunda səmərəli istifadə olunur. Onlardan maksimum məhsuldarlıq əldə etmək, həmçinin heyvanların balanslaşdırılmış qida rasionunu hazırlamaq üçün istifadə olunur.

Yem mayasının becərilməsi əvvəlcə kağız, spirt və şəkər sənayesinin tullantıları üzərində aparılırdı. Maya daha çox B qrupunun vitaminləri ilə zəngindir və tərkibində aşağıdakı maddələr var: zülallar (təxminən 55%), vitaminlər, azotsuz komponentlər (təxminən 35%), kül (8%), yağlar (2%) və lif (təxminən 0-2%). Bununla belə, maya istehsalında standarta əsasən, karbamid və digər zülal olmayan azotlu komponentlərin istifadəsi yolverilməzdir. Bu cür əlavələr heyvanın orqanizmi tərəfindən yüksək qidalı olub, yaxşı həzm olunur. Lakin onları mal-qaranın qida rasionuna daxil edərkən nəzərə almaq lazımdır ki, onların tərkibində orqanizmin düzgün inkişafı üçün vacib olan $B_{12}$ vitamini yoxdur. Bu vitamin qidanın daha yaxşı həzm olunmasına kömək edir. Onun çatışmazlığı ilə müxtəlif xəstəliklər inkişaf edir, heyvanın bədənində düzgün metabolizm pozulur (Mukhina, 2008:125).

Yem mayası bəzi faydalı mikroelementləri əvəz edə bilər, lakin digər heyvan yemlərini tam əvəz edə bilməz. Beləliklə, 1 kq yem mayası tam yem qarışığının istifadəsinə təxminən 10-15% qənaət edə bilər. Onları yem payına daxil edərkən heyvanların xüsusiyyətlərini, eləcə də gündəlik istifadə tələblərini nəzərə almaq lazımdır. Yüksək məhsuldar süd verən inəklərin qida rasionunda yem mayasının istifadəsi süd məhsuldarlığını 2-5 kq artırır. Heyvanların qida rasionunda istifadə edildikdə heç bir zərərli təsirə rast gəlinmir. Yem mayasının yem əlavəsi kimi istifadəsi heyvanların böyüməsini və məhsuldarlığını əhəmiyyətli dərəcədə artıra bilər. Yüksək qidalılıq keyfiyyətlərinə görə yem mayası yüksək qiymətləndirilir. Yem mayası, əsasən zülaldan (55%-ə qədər) və çoxlu miqdarda vitaminlərdən ibarətdir, azotsuz maddələrin miqdarı təxminən 35%, 8% kül maddələri və təxminən 2% yağlardır. Lif tərkibi isə çox aşağı olub, 0,2% -ə qədərdir (Gulyayeva, 2011:9).

Bu məqsədlə Heyvandarlıq Elmi-Tədqiqat İnstitutunun Yardımçı Təcrübə Təsərrüfatında hər qrupda 2 baş olmaqla nəzarət və təcrübə qruplarında formalaşmış və sağmal inəklər üzərində təcrübə işləri aparılmışdır. Təcrübə dövründə (ilkin olaraq 6 ay ərzində) hər qrupun yem rasionuna xüsusi hazırlanmış (balanslaşdırılmış) yem norması daxil edilmişdir (Cədvəl 1, 2). Təcrübə qrupu yem rasionuna premiks və yem mayası daxil edilmiş, heyvanların süd məhsuldarlığı və südün yağlılıq faizinə nəzarət edilmişdir.

**Aparılmış elmi tədqiqat işinin təhlili və alınan nəticələr**

*Tədqiqat işində məqsəd* heyvandarlıqda əsas faktor olan yemləmənin səmərəsini artırmaq, yemin həzməgedicilik qabiliyyətini və heyvanın məhsuldarlığını (ət, süd, döl) artırmaq üçün heyvanların yem payına (xüsusən sağmal inəklərə) vitamin-premiks və yem mayası əlavə etməklə heyvanların süd məhsuldarlığının və südün yağlılıq faizinin öyrənilməsidir. Bu zaman heyvanlara verilmək üçün Amerika istehsalı "Cargill" firmasının premiksləri və mağazada satılan yem mayası istifadə olunur. Metodikaya uyğun olaraq heyvanların yem payına 1 baş inəyə 100 q premiks və 100 q yem mayası əlavə etmişik. Tədqiqat işinin aparılması zamanı heyvanların südünün tərkibi (yağlılıq, quru maddə, protein, sıxlıq, şəkər və s.) ayda 1 dəfə HETİ-nin süd laboratoriyasında "Lactoscan" aparatında analiz olunur.

***Cədvəl 1.***

**Təcrübə qrupu üçün yem rasionu**

| Yemin adı | Bir baş üçün (kq) | 1 kq yemin dəyəri (AZN) | Məbləğ (AZN) |
|---|---|---|---|
| Arpa | 1,5 | 0,48 | 0,72 |
| Buğda | 1 | 0,48 | 0,48 |
| Kəpək | 2,5 | 0,30 | 0,75 |
| Qarğıdalı | 1,2 | 0,55 | 0,66 |
| Pambıq jmıxı | 1,5 | 0,35 | 0,525 |
| Soya | 2 | 1,25 | 2,5 |
| Mərmər tozu | 0,1 | 0,035 | 0,0035 |
| Rupromin balance | 0,07 | 4,35 | 0,3045 |
| Vitamin-premiks | 0,1 | 6,5 | 0,65 |
| Duz | 0,03 | 0,4 | 0,012 |
| Qarğıdalı silosu | 19 | 0,12 | 2,28 |
| Baypass yağı | 0,05 | 7,9 | 0,395 |
| Yonca | 4 | 0,25 | 1 |
| Saman | 2 | 0,1 | 0,2 |
| Yem mayası | 0,1 | 10 | 1 |
| **Cəmi** | **35,15** | | **11,48** |

***Cədvəl 2.***

**Nəzarət qrupu üçün yem rasionu**

| Yemin adı | Bir baş üçün (kq) | 1 kq yemin dəyəri (AZN) | Məbləğ (AZN) |
|---|---|---|---|
| Arpa | 1,5 | 0,48 | 0,72 |
| Buğda | 1 | 0,48 | 0,48 |
| Kəpək | 2,5 | 0,30 | 0,75 |
| Qarğıdalı | 1,2 | 0,55 | 0,66 |
| Pambıq jmıxı | 1,5 | 0,35 | 0,525 |
| Soya | 2 | 1,25 | 2,5 |
| Mərmər tozu | 0,1 | 0,035 | 0,0035 |
| Duz | 0,03 | 0,4 | 0,012 |
| Qarğıdalı silosu | 19 | 0,12 | 2,28 |
| Yonca | 4 | 0,25 | 1 |

| | | | |
|---|---|---|---|
| Saman | 2 | 0,1 | 0,2 |
| **Cəmi** | **34,83** | | **9,1305** |

Bu ilin yanvar ayından başlayaraq 6 ay ərzində hər ay təcrübə və nəzarət qrupu heyvanlarının süd məhsuldarlığı və südünün yağlılıq faizinin dəyişilməsi izlənilmişdir (Cədvəl 3, 4).

*Cədvəl 3.*
**Süd məhsuldarlığının aylar üzrə cədvəli**

| **Qruplar** | **Yanvar** | **Fevral** | **Mart** | **Aprel** | **May** | **İyun** |
|---|---|---|---|---|---|---|
| Təcrübə | 22,4 | 24,6 | 26,8 | 27,4 | 28 | 30 |
| Nəzarət | 19,2 | 22,4 | 24,2 | 22,6 | 22,4 | 21 |
| Fərq | 3,2 | 2,2 | 2,6 | 4,8 | 5,6 | 9 |




**Şəkil 1. Süd məhsuldarlığının aylar üzrə diaqramı**

*Cədvəl 4.*
**Südün yağlılıq faizi (aylar üzrə)**

| Qruplar | Yanvar | Fevral | Mart | Aprel | May | İyun |
|---|---|---|---|---|---|---|
| Təcrübə | 4 | 4 | 4,1 | 3,9 | 3,99 | 4 |
| Nəzarət | 3,8 | 3,8 | 3,9 | 4,05 | 3,78 | 3,8 |
| Fərq | 0,2 | 0,2 | 0,2 | -0,15 | 0,21 | 0,2 |




**Şəkil 2. Südün yağlılıq faizinin (aylar üzrə) diaqramı**

## Nəticə

Tədqiqat işinin aparılması zamanı aşağıdakı nəticələr əldə olunmuşdur:

1. Təcrübə qrupu heyvanlarından nəzarət qrupları heyvanlarına nisbətən gün ərzində orta hesabla 5 l artıq süd sağılmışdır.
2. Südün yağlılıq faizi isə təcrübə qrupu heyvanlarında nəzarət təcrübə qrupu heyvanlarından orta hesabla 0,14 % artıq olmuşdur.
3. Təcrübə qrupundakı heyvanların məhsuldarlıq qabiliyyəti və alınan balaların dinamik inkişafı nəzarət qrupuna nisbətdə daha yaxşıdır.
4. Təcrübə qrupunun heyvanlarının köklük dərəcəsi norma daxilindədir. Nəzarət qrupundakı heyvanların köklük dərəcəsi nisbətən aşağıdır.

## Ədəbiyyat

1. Zeynalov, M.A. (2005). Heyvandarlıqda müasir yemləmə. Bakı: Şəms, 225 s.
2. Aksoy, U., Boz, İ., Eynalov, H., Quliyev, Y. (2018). Azərbaycanda orqanik kənd təsərrüfatı. Hazırkı durum və gələcək inkişaf potensialı. FAO. 106 s.
3. Ağabəyli, A.Ə. (1975). Kənd təsərrüfatı heyvanlarının yetişdirilməsi. Bakı: Maarif nəş., 103 s.
4. Abdullayev, Q.Q. (2018). Kənd təsərrüfatı heyvanlarının yetişdirilməsi. Dərslik. Bakı, 268 s.
5. Abdullayev, Q.Q. (2012). Heyvandarlığın əsasları. Bakı: Elm və təhsil, 331 s.
6. Abdullayev, Q.Q., Məmmədov, F.A., Bayramov, H.S., Həsənov, R.Q., Məmmədov, M.Ə. (2012). “Kənd təsərrüfatı heyvanlarının yemləndirilməsi”. Gəncə: “Gəncə Poliqrafiya” ASC, 248 s.
7. Belikova, A.S., Shuvarikova, A.S. (2005). Influence of protein-vitamin premix on the quality of lactis vaccae. Zootehniya. № 2, p.13-16.
8. Levakhin, G.I., Duskayev, G.K. (2018). Rubchovoe pishevarenie molodnyaka krupnogo rogatogo skota pod vliyaniyem razlichnykh faktorov kormleniya: Monografiya. Orenburg, 202 s.
9. Musayev, N. (2016). Heyvanların yemlənməsi. Modul dərs vəsaiti. Bakı, 80 s.
10. Bokova, T.I. Usus additivorum biologice activorum in victu animalium.
11. Gulyayeva, M.E. (2011). Kormovye drojji v pitanii laktiruyushikh korov. Molochno-khozyaystvennyy vestnik. № 2, s.8-9.
12. Petrukhin, I.V. (1989). Korma i kormovye dobavki. M.: Rosagropromizdat, 526 s.
13. Mukhina, H.V. (2008). Korma i biologicheskie aktivnye dobavki dlya jivotnikh. M: Kolos, 217s.

Göndərildi: 19.07.2022 Qəbul edildi: 13.09.2022

DOI: https://doi.org/10.36719/2663-4619/83/125-130

**Manaf Rizvan Manafov**
Institute of Catalysis and Inorganic Chemistry
Ph.D. in engineering
mmanafov@gmail.com
**Vafa Imran Karimli**
Institute of Catalysis and Inorganic Chemistry
miracle1990@list.ru
**Fatma Rashid Shikhiyeva**
Institute of Catalysis and Inorganic Chemistry
fatmashikhieva9981@gmail.com

# MODELS OF COALESCENCE AND FRAGMENTATION OF DROPS AND BUBBLES IN ISOTROPIC TURBULENT FLOW

## Abstract

Coalescence and fragmentation of drops in a turbulent flow are the basis of many chemical, oil refining processes, food and pharmaceutical technologies, and are mainly associated with changes in the number of spectra and particles in a single volume that determine the size of the mass and heat transfer phase. Coalescence due to collision and subsequent enlargement of drops is widely used in emulsions, suspensions and other multi-phase media in the processes of phase separation and stratification (sedimentation, surface emergence). Fragmentation of drops required for the growth of the interfacial surface in gas-liquid reactors, liquid extraction, absorption in mass transfer processes, dusting, combustion, etc. is used quite widely in processes.

***Keywords:*** *isotropic turbulent flow, fragmentation drops and bubbles, coalescence drops and bubbles, size of drops, frequency of fragmentation*

**Manaf Rizvan oğlu Manafov**
**Vəfa İmran qızı Kərimli**
**Fatma Rəşid qızı Şıxıyeva**

## İzotrop turbulent axında damlaların və qabarcıqların koalessensiya və parçalanma modelləri

## Xülasə

Turbulent axında damlaların koalessensiyası və parçalanması fiziki hadisələri bir çox kimyəvi, neft emal edən proseslərin, qida və əczaçılıq texnologiyasının əsasını təşkil edir, əsasən, kütlə və istilik ötürmənin fazalararası səthinin ölçüsünü müəyyən edən vahid həcmdə spektrin və hissəciklərin sayının dəyişməsi ilə əlaqədardır. Damlaların toqquşması və növbəti iriləşməsi ilə bağlı koalessensiya emulsiyalarda, suspenziyalarda və digər çoxfazalı mühitlərdə fazaların ayrılması və təbəqələşməsi (çökmə, suyun üzünə çıxma) proseslərində geniş istifadə olunur. Fazalararası səthin böyüməsi üçün lazım olan damlaların parçalanması qaz-maye reaktorlarda maye ekstraksiya, absorbsiya kütlədəyişmə proseslərində, toz halına salma, yanma və s. proseslərdə kifayət qədər geniş istifadə olunur.

***Açar sözlər:*** *izotrop turbulent axın, damla və qabarcıqların parçalanması, damla və qabarcıqların koalessensiyası, damlaların ölçüsü, parçalanma tezliyi*

## Introduction

The essence of the processes of coalescence and disintegration of drops and bubbles is the loss of aggregative and, in some cases, sedimentation stability of the entire dispersed system under the influence of internal forces or spontaneously.

The main features of these processes are the frequency of coalescence (collision) and fragmentation, and in this isotropic turbulent flow is determined by the dissipation energy and turbulence scale, as well

as the size and characteristics of the particles themselves and the environment (density, viscosity, surface tension) and is determined by the minimum and maximum dimensions of the bubbles. The minimum particle size characterizes the tendency of the dispersed system to coalescence of drops and bubbles, while the maximum size tends to deform and disintegrate. Another feature of the dispersed system in which coalescence and fragmentation processes take place is the rate of change of particle size and number, in other words, the movement of the separation function by size and time, and their theoretical and experimental studies are given in (Aksjanova, 1994:194; Blanchette, Bigioni, 2009: 333-350).

**Fragmentation frequency of drops and bubbles**

The fragmentation of drops and bubbles in an isotropic turbulent flow is an important factor in increasing the interfacial surface area and mass transfer rates in disperse systems. The mechanism of fragmentation of deformed particles is determined by a number of factors, including the following:

a) Turbulent pulsations that change the structure of drops and bubbles by affecting their surface. From (Davydova, Teplyakov, 2010:175; Narsimhan, 2004:197-218; Gudrat, Taghiyev, Manafov, 2021:201-236) the frequency of change in the structure of the drop surface is determined by the expression Relay.

$$\omega(k) = [(\frac{2\sigma}{\pi^2\rho_m\ a^3})(\frac{(k+1)(k+2)k(k-1)}{(k+1)\rho_d/\rho_m})]^{1/2} \quad (1)$$

when k = 2 drops and bubbles from this expression ($\rho_d << \rho_m$): $\omega(a) = \frac{2\sqrt{6}}{\pi}(\frac{\sigma}{\rho_m a^3})^{1/2}$, drops and bubbles ($\rho_d \gg \rho_m$) : $\omega(a) = \frac{4}{\pi}(\frac{\sigma}{\rho_d\ a^3})^{1/2}$ equations can be obtained to determine the frequencies corresponding to the fragmentation. As a result, minor deformations that do not take into account the structure of the drop are determined by the superposition of linear harmony.

$$r(t,\theta) = R[1 + \sum_k A_k \cos(\omega_k t) P_k(\cos\theta)] \ (2)$$

Here $P_k(cos\theta)$ − Legendary function, $A_k$ -$A_k = A_{ko}\exp(-\beta_k t)$ the coefficients of the sequence defined as, $\beta_k$- the attenuation coefficient is calculated as follows:

$$\beta_k = \frac{(k+1)(k-1)(2k+1)y_d + k(k+2)(2k+2)y_m}{[\rho_d(k+1)+\rho_m k]R^2} \quad (3)$$

b) General instability as a result of boundary instability on the surface of the drop or the maximum value of the size of the drop $a \geq a_{max}$ ;

c) Influenced by the external environment; In this case, the fragmentation of the drop is determined by the balance between the external conditions of the continuous phase (dynamic pressure) and the surface tension forces that resist the collapse of the drop (Kelbaliyev, Rasulov, 2020:123-145; Levich, 1969:700; Matveenko, Kirsanov, 2011:243-276). It should be noted that this condition can characterize the deformation of the structures of drops and bubbles;

d) As a result of mutually elastic collisions during intensive mixing of the system. It should be noted that any collision of drops and bubbles does not cause their coalescence and coalescence, and during the elastic collision of the drops can break into smaller pieces, thus changing the distribution spectrum of dimensions. A general overview of the fragmentation of drops and bubbles provides an analysis of the maximum and minimum dimensions and questions related to the nature of the distribution function according to the frequency of fragmentation and particle size studied. Despite the numerous mechanisms of fragmentation of drops and bubbles, the main parameter that characterizes this process is the frequency of fragmentation in turbulent flow, and many studies have been devoted to its determination (Mednikov, 1980:176; Patel, Vashi, 2010:1457-1483; Abiev, Galushko, 2021:369-391). In Study 11, the following expression is proposed for the frequency of fragmentation of drops and bubbles based on the analysis of surface energy and kinetic energy in a turbulent flow:

$$\omega(a) = c_1 a^{-2/3}\varepsilon_R^{1/3} exp(-\frac{c_2\sigma}{\rho_m s_R^{2/3} a^{5/3}}) \ (4)$$

In we consider the expression of turbulent diffusion by analytical solution of the mass transfer equation (4)

$$\frac{\partial N}{\partial t} = \frac{1}{r^2}\frac{\partial}{\partial r}(r^2 D_{tr}\frac{\partial N}{\partial r})$$

$$t = 0, r > R, N = N_0; t > 0, r = R, N = 0; t > 0, r \to \infty, N = N_0$$

$D_T \approx V_\lambda \lambda = \alpha(\varepsilon_R \lambda)^{1/3}\lambda$ - given the expression, we can write this expression as follows

$$\frac{\partial N}{\partial t} = \frac{\alpha}{r^2}\frac{\partial}{\partial r}\left(\mu_R^2 \varepsilon_R^{1/3} r^{10/3} \frac{\partial N}{\partial r}\right) \quad (5)$$

the solution to this expression is as follows:

$$N(r,t) = \sum_{n=1}^{\infty} A_n J_2 \left[\mu_n (r/R)^{\frac{1}{3}}\right] \exp(-\mu_n^2 t)$$

Here $A_n = \frac{2\int_0^F N_0 J_2[\mu_n (r/R)^{1/3}] r dr}{R^2 J_1^2(\mu_0)}$, $\mu_n - J_2(q_n) = 0$ expression $\mu_n = q_n (\varepsilon_R^{\frac{1}{3}} \alpha / 3R^{2/3})$ special units determined by the solution, $J_1(\mu_n)$ – first and second degree Bessel function. Thus, when the series is assembled quickly, it is sufficient to use the first term and determine the fractionation frequency as follows:

$$\omega(\alpha) = -D_{TP}\frac{\partial N}{\partial r}\Big|_{rR} \approx c_1 \varphi_0 \left(\frac{s_R}{\alpha^2}\right)^{\frac{1}{3}} \exp\left(-c_2 \frac{\sigma}{\rho_m s_R^{2/3} a^{5/3}}\right) \quad (6)$$

Here $\varphi_0$ -the volume fraction of particles at first this expression is analogous to (5) $\lambda > \lambda_0$ – is an expression of the fractional frequency. Although the decay time of drops and bubbles is defined in the work (Perrard, Riviere, Mostert, Deike, 2021) as $r \sim a^{2/3} / \varepsilon_R^{1/3}$, the expression $r \sim \sigma / (\rho_m \varepsilon_R a)$ is accepted.

When $\lambda > \lambda_0$ or rather, the decay frequency can be determined as follows by using the second expression (2) for the viscous flow:

$$\omega(a) = C_{01} N_0 a^3 \left(\frac{s_R}{V_m}\right)^{1/2} \exp\left[-C_2 \frac{\sigma}{(V_m s_R)^{1/2} a p_m}\right] \quad (7)$$

As can be seen from this expression, the frequency of drops and bubbles in the viscous field or liquid medium is inversely proportional to the viscosity of the medium $\sim V_m^{-1/2}$

$$\omega(a) = c_8 n erfc \left(c_9 \frac{\sigma^{3/2}}{n^3 d_t^3 \rho_m^{3/2} a^{3/2}}\right)^{1/3} \quad (8)$$

The latter expression determines the frequency of disintegration of drops and bubbles in mixing devices and depends on the mixing parameters. In multiphase systems, the frequency of disintegration of drops and bubbles with a volume fraction $\varphi$ can be determined as follows:

$$\omega(a) = c_{10} \frac{s_R^{1/3}}{a^{2/3}(1+\varphi)} \exp\left(-c_{11} \frac{(1+\varphi)^2 \sigma}{\rho_d a^{5/3} s_R^{2/3}}\right) \quad (9)$$

The rate of disintegration of drops and bubbles in an isotropic turbulent flow is characterized by a constant rate determined as follows:

$$Re_d < 1 \quad k_R = A_0 \frac{s_R^{1/3}}{a^{2/3}} \exp\left(-\frac{A_1 \sigma}{\rho_m s_R^{2/3} a^{5/3}}\right) \quad (10)$$

$$Re_d > 1 \quad k_R = A_0 \frac{\rho_m a^{2/3} \varepsilon_R^{1/3}}{\eta_m} exp\left(-\frac{A_1 \sigma}{\rho_m \varepsilon_R^{2/3} a^{5/3}}\right)$$

The parentheses express the surface energy ($E_\sigma \sim \pi a^2 \sigma / a \sim \pi a \sigma$) to the turbulent flow energy ($E_T \sim \pi a^2 (\Delta P_T,\ \Delta P_T = c_1 \rho_m (\varepsilon_R a)^{2/3})$ indicates the ratio and characterizes the efficiency of the fragmentation process.

$$\frac{E_\sigma}{E_T} \sim \frac{\sigma}{\rho_m \varepsilon_R^{2/3} a^{5/3}}$$

Analysis of the expressions (7) and (10) shows that for the condition $\lambda > \lambda_0$ the decay frequency in the isotropic turbulent flow is mainly turbulence parameters (specific dissipation energy, scale of turbulent pulsations), the density of the medium is the surface tension, and the viscous flow $\lambda < \lambda_0$ is determined by its viscosity. It should be noted that the fragmentation of drops and bubbles in an isotropic turbulent flow allows the deformation of their structures, so that the fact that $W_e$ can be expressed at fairly small values of high $M_o$ can take the structures.

The coalescence of drops and bubbles plays a key role in the course of various technological processes of chemical technology, first of all, in the reduction of the interfacial surface, in the stratification and

separation of particles of different sizes accompanied by subsidence or eruption. The mechanism of coalescence of drops and bubbles is determined by the following stages:

The collision of particles in the flow occurs for various reasons:

a) Due to the convective Brown diffusion of finely dispersed particles, which is characteristic of laminar flow, mainly at small values of the Reynolds number.

b) At the expense of turbulent flow and turbulent diffusion. If the colmogor scale of turbulence is comparable to the size of drops and bubbles in a small or viscous flow area $\lambda_0$, the process is accompanied by turbulence, which results in turbulent diffusion, similar to Brownie. However, turbulent diffusion may be characteristic for large particle sizes at large $\lambda$ distances due to the high intensity of turbulent pulsations and the non-uniformity of the hydrodynamic field.

c) The effect of adhesion resulting from the convective transmission of small particles of a large fragment is the capture of small particles by large particles.

For the coalescence processes of drops and bubbles, the retention coefficient, which determines the difference between the particle retention and the geometric cross section of the rel, plays an important role.

$$\mathrm{P} = \frac{I}{\pi(L+R)^2 N_0 V_\infty} \quad (11)$$

During convective diffusion, the relationship between the Sherwood number and the retention coefficient is as follows:

$$Sh = \frac{1}{2} Pe\mathrm{P}\left(1 + \frac{R}{L}\right)^2 \quad (12)$$

The eclipse coefficient is determined as follows:

$$\mathrm{P} \approx \frac{4}{Pe}\left(1 - \frac{N_L}{N_0}\right) b_* (1 + b_o Pe), Pe \ll 1 \quad (13)$$

$$\mathrm{P} \approx \left(1 - \frac{N_L}{N_0}\right) Pe^{-2/3}(1 + 0{,}738 Pe^{-1/3}), Pe \gg 1$$

Here $N_L$ − radius r = L the concentration of particles on the surface of the sphere;

d) Due to the heterogeneity of the temperature and pressure fields, which lead to the formation of forces proportional to the temperature and pressure gradient and the forces that affect the reduction of these parameters. For the finely dispersed composition of the dispersed flow, their displacement due to thermodiffusion and barodiffusion as a result of the action of these forces is characteristic, which leads to their collision and coalescence;

e) In addition to these events, physical phenomena (evaporation of drops and bubbles, condensation) also cause coalescence and these events are evaporating drops and bubbles (Stefan flow) formation of hydrodynamic thrust (Fassi effect) or is accompanied by the formation of a force acting in the opposite direction during the growth of the drop as a result of condensation.

It is assumed that the dynamic pressure affects a certain part of the surface of the drop and may therefore be related to the coefficient of resistance. From the condition of equality of these forces

$$C_D = (Rc_d)\frac{\rho_c U^2}{2} = \frac{4\sigma}{a_s} \quad (17)$$

If Morton number $M_0 > 10^{-7}$ and $0{,}1 < Re_d < 100$ at that time based on the experimental data and, we obtain $c_D = 16/Re_d$ and then the maximum size of the drops will be determined in this way.

$$a_{max} \approx 0{,}354\gamma^{-3}\left(\frac{U}{v_c}\right)^{3/2}\left(\frac{\sigma}{\rho_m^{1/3}\rho_d^{2/3}}\right)^{3/2}\varepsilon_R^{-1} \quad (18)$$

**Result and Discussion.** If Morton number $M_0 > 10^{-7}$ and $0{,}1 < Re_d < 100$ at that time expression can be used with a coefficient of 0,192 , if $100 \le Re_d < 400$ at that time a coefficient of 0.068 can be used. Basically for bubbles for $2 < Re_d < 10^3$, it can be assumed that $c_D = 14/Re_d$ as a result of which the expression (18) takes the following form:

$$a_{max} \approx 0{,}619\gamma^{-12/7}\left[\left(\frac{U}{v_c}\right)^{1/2}\left(\frac{\sigma}{\rho_m^{1/3}\rho_d^{2/3}}\right)\right]^{6/7}\varepsilon_R^{-4/7} \quad (19)$$

Expression (19) corresponds to the experimental data.

***Table 1.***
**Comparison of experimental data with calculated values (19)**

| U, m/c | $Re_d$ | $\varepsilon_R\left(\frac{W}{kg}\right)$ | $a_{max}$x $10^3$m (experimental) | $a_{max}$x $10^3$m (2.1.11) |
|---|---|---|---|---|
| 3,50 | 1000 | 6,5 | 4,3 | 4,5 |
| 3,98 | 820 | 13,3 | 3,1 | 3,1 |
| 4,59 | 670 | 32,6 | 2,2 | 2,0 |
| 6,04 | 604 | 69,3 | 1,5 | 1,5 |

The minimum particle size in an isotropic stream characterizes the hydrodynamic resistance of drops and bubbles to disintegration under certain conditions and their tendency to intense collision and coalescence at high particle concentration.

## Conclusion

Adjustments made to calculate the minimum and maximum sizes of deformed particles (drops, convex) can be used to solve the problem of separation of coalescence, fragmentation and dispersed systems with a certain accuracy. Numerous theoretical and experimental studies of the state of deformable particles in the turbine flow allow us to propose different formulas for estimating the maximum and minimum sizes of dispersed particles so that as can be seen from the research, these dimensions depend primarily on the specific dissipation energy of the properties of the medium and the particles, the coefficient of resistance of the particles, and in some cases the crisis values of the We number. The use of the coefficient of resistance in the expression of equality allows to expand the area of adequate description of the maximum and minimum particle sizes.

**Symbols**

K – wave number
I – mass flow to the surface of the separated part
L – characteristic scale of distance
$V_\infty$ – the speed of the environment.
$\omega$ – frequency of fragmentation.
$R_k$ – contact surface radius
$P_m$ – maximum value of compression pressure
$k_1, k_2$ – coefficient of elasticity of drops and bubbles
$a_r = {a_1 a_2}/{(a_1 + a_2)}$ – average size of drops and bubbles
$a_1 a_2$ – diameters of drops and bubbles
$b_i$ – coefficients
$D_{TR}$ – coefficient of turbulent diffusion of particles
$D_T$ – coefficient of turbulent diffusion of liquid
$\lambda_f$ – the initial length of the turbulence scale
$\alpha$ – coefficient
$C_D$ – resistance coefficient
$\sigma$ – surface tension coefficient
$a_{max}$ – maximum size of drops
$a_{min}$ – minimum size of drops
$\rho_m$ – the density of the medium

$\rho_d$ – the density of the drop
$\varepsilon_R$ – energy dissipation

## Acknowledgments

This work was supported by the Science Foundation of «SOCAR» under the grant project 13LR – AMEA (05/01/2022) at the Institute of Catalysis and Inorganic Chemistry named after Acad. M.F.Nagiyev.

The authors are grateful to Professor G.I.Kelbaliyev (M.Nagiyev Institute of Catalysis and Inorganic Chemistry, NAS of Azerbaijan) for censorious remarks.

## References

1. Aksjanova, A.V. (1994). Issledovaniye tsiklicheskikh adsorbirovannykh processov ochstki stochnykh vod. Diss. kand. tekhn. nauk. Kazan, 194 s.
2. Blanchette, F., Bigioni, T.P. (2009). Dynamics of drop coalessence at fluied intefaces. Journal of fluied mechanics, V.620, № 6, p.333-350.
3. Davydova, S.L., Teplyakov, V.V. (2010). D13 Ekologicheskie problemy neftepererabotke: Ucheb. posobie. M.: RUDN, 175 s.
4. Narsimhan, G. (2004). Model for drop coalescence in a locally isotropic turbulent flow field. Journal of colloid and interface science, V.272, №1, p.197-218.
5. Gudrat, K.I., Taghiyev, D.B., Manafov, M.R. (2021). Rheology of structured oil emulsion. In book: Nano-and Micro-Encapsulation – Techniques and Applications. London: IntechOpen (Web of Science), Chapter 7, p.201-236.
6. Kelbaliyev, G.I., Rasulov, S.R. (2020). Matematicheskoe modelirovanie processov osazhdenija i vsplytija tverdykh chastic, kapel i puzyrey v izotropnom turbulentnom potoke. Izvestiya Uralskogo gosudarstvennogo gornogo universiteta, № 4 (60), s.123-145.
7. Levich, V.G. (1969). Khimicheskaya gidrodinamika. M.: Izdatelstvo fiziko-matematicheskoy literatury, 700 s.
8. Matveenko, V.I., Kirsanov, S.V. (2011). Vyazkost i struktura dispersnykh sistem. Vestn. Mosk. Un-ta, ser. Himija, T.2, №1, s.243-276.
9. Mednikov, E.P. (1980). Turbulentny perenos i osazhdenie ayerozoley. M.: Nauka, 176 s.
10. Patel, H., Vashi, P.T. (2010). Treatment of textile waster water by adsorption and coagulation. E-Journal of Chemistry, V.7, № 4, p.1483-1487.
11. Abiev, R.Sh. & Galushko, A.S. (2021). Bubbles size and mass transfer in a pulsating flow type apparatus with gas-liquid mixture. Journal of Flow Chemistry, Volume 11, p.369-391.
12. Perrard, S., Riviere, A., Mostert, W., Deike, L. (2021). Bubble deformation by a turbulent flow. Journal of Fluid Mechanics, Volume 920, 10 august, p.20-30. DOI: https://doi.org/10.1017/jfm.2021.379

Received: 23.07.2022 Accepted: 22.09.2022

DOI: https://doi.org/10.36719/2663-4619/83/131-136

**Bəxtiyar Cümi oğlu Məhərrəmov**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
Cəlilabad filialı
meherremovb092@gmail.com

# CƏNUB BÖLGƏSİNİN – LƏNKƏRAN TƏBİİ VİLAYƏTİNİN LANDŞAFTLARININ MÜHAFİZƏSİ

## Xülasə

Cəmiyyətin sürətlə inkişaf etdiyi və böyük elmi-texniki tərəqqi dövrü olan XXI əsrdə təbiətlə insan arasındakı münasibətlər pozulmuşdur. Bu isə ekologiyamız üçün təhlükəli vəziyyət yaratmışdır. İnsanlar təbii komponentlərə, yəni torpağa, suya, bitki örtüyünə, heyvanat aləminə, atmosferə və s. güclü təsir gostərmiş, təbiətə sağalmaz yaralar vurmuşdur.

Bütün bunların qarşısını almaq üçün xalq arasında ekoloji bilikləri artırmaq, ekoloji təhsili genişləndirmək elm adamları və dövlət qarşısında duran ən aktual problemlərdəndir. Son dövrlərdə Azərbaycanda turizm və rekreasiya işləri ilə bağlı təbiətin bütün komponentlərinə antropogen təsirlər artmışdır. Buna görə də respublikamızın ərazisində bir sıra bitki növləri azalmış, heyvanat aləmində bəzi növlərin nəsli kəsilmək təhlükəsi ilə üz-üzə qalmışdır.

Bu tədqiqat işində Lənkəran təbii vilayətində landşaftların mühafizəsi istiqamətində yaradılan qoruq və yasaqlıqların təbii ehtiyatlarının qorunmasına dair məlumatların informativliyi qiymətləndirilmişdir.

***Açar sözlər:*** *qoruq, yasaqlıq, Milli Park, azonallıq, intrazonallıq, dəmir ağacı, relikt, endemik, rekreasiya, ekologiya*

**Bakhtiyar Jumi Maharramov**

## Landscape protection of the southern region – Lankaran natural province

## Abstract

In the 21st century, which is a period of rapid development of society and a period of great scientific and technical progress, the relationship between nature and man has been disrupted. This has created a dangerous situation for our ecology. Humans depend on natural components, i.e. soil, water, vegetation, animal world, atmosphere, etc. had a strong impact and inflicted irreparable wounds on nature.

In order to prevent all this, increasing environmental knowledge among the people and expanding environmental education are among the most urgent problems facing scientists and the state. In recent times, anthropogenic effects on all components of nature have increased in connection with tourism and recreation in Azerbaijan. Therefore, a number of plant species have decreased in the territory of our republic, and some species in the animal world are facing the threat of extinction.

In this research work, the informativeness of the information on the protection of the natural resources of the reserves and sanctuaries created in the direction of the protection of landscapes in the Lankaran natural province was evaluated.

***Keywords:*** *reserve, sanctuary, National Park, azonal, intrazonal, ironwood, relict, endemic, recreation, ecology*

## Giriş

Cənub bölgəsinin − Talışın təbiətinin təbii landşaftlarının öyrənilməsi Azərbaycanın xalq təsərrüfatının yaxşılaşmasında mühüm əhəmiyyətə malikdir. Azərbaycan hökuməti elmin qarşısında təbiəti mühafizədə mövcud metodların daha da təkmilləşdirilməsi, yeni, daha əhəmiyyətli metodların aparılması və təbii sərvətlərdən kompleks istifadə etməklə ətraf mühitin mühafizəsi məsələsini qarşıya qoymuşdur. Qəbul olunmuş dövlət proqramında təbiəti mühafizə haqqında deyilir: "Torpaq örtüyünü, onun dərin qatlarını, bitki və heyvanat aləmini, hava və su hövzələrinin mühafizəsini genişləndirmək" (Budaqov, 1977;73).

Lənkəran təbii vilayəti müxtəlifliyi və kənd təsərrüfatının inkişafının perspektivləri ilə Azərbaycanda diqqəti cəlb edən fiziki-coğrafi rayonlardan biri hesab olunur. Cənub bölgəsi − Lənkəran fiziki-coğrafi rayonu respublikamız üçün çox böyük iqtisadi əhəmiyyətə malikdir.

Burada iqlim şəraiti, torpağın müxtəlifliyi, müxtəlif təsərrüfat sahələrinin − çayçılığın, subtropik bitkiçiliyin, çəltikçiliyin, tərəvəzçiliyin, maldarlığın inkişafına şərait yaratmışdır. Cənub bölgəsi − Talışın təbii landşaftlarının mühafizəsi istiqamətində qoruq, yasaqlıq və Milli Parkların yaradılması istiqamətində dövlət proqramları hazırlanır və ciddi işlər görülür (Daşdıyev, 2010:140).

1928-30-cu illərdən başlayaraq günümüzədək təbii komponentlərə antropogen təsirləri nəzərə alaraq respublikamızda təbiətin mühafizəsi sahəsində xeyli işlər görülmüşdür. Bunlardan ən önəmlisi respublikamızın ayrı-ayrı ərazilərində qoruq və yasaqlıqlar yaradılmışdır. Respublikamızda təbii mühafizə obyektlərinin ümumi sahəsi 485029 hektar və ya ərazimizin 5,1%-ni təşkil edir. Azərbaycan Respublikasının nadir bitki və heyvanat növlərini və eləcə də landşaftların digər komponentlərini qoruyub saxlamaq məqsədilə 11 qoruq, 24 yasaqlıq və 9 Milli Park təşkil olunmuşdur (Əliyev, 1982:176).

Cənub bölgəsi – Talışın təbiətinin mühafizəsi məqsədi ilə ərazidə qoruq və yasaqlıqlar təşkil olunmuşdur. Məqalədə cənub bölgəsinin əsas qoruq və yasaqlıqları, həmçinin təbiətin mühafizəsi istiqamətində görülən işləri işıqlandırmağa çalışacağıq.

**Qızılağac dövlət qoruğu** − Xəzərin qərb sahilində Azərbaycanın ərazisində 38°50` ilə 39°20` şimal enlikləri və 48°50`- 49°13` şərq uzunluqları arasında yerləşir (İbrahimov, 2011:255).

Hazırda qoruğun sahəsi 88 min hektardır. Bunun 52% su sahəsindən, 48% quru sahəsindən ibarətdir. Qoruğun ərazisi inzibati cəhətdən Lənkəran rayonu ərazisindədir. Qızılağac qoruğu Böyük körfəzi tamamilə, Kiçik körfəzi isə qismən əhatə edir. Qoruğun ayrılmaz hissəsi olan və Qızılağac körfəzindən cənub-qərbə doğru dil şəklində uzanan Sarı yerləşir. Coğrafiyaşünas Z.Şirvani yazır: “Sarı Xəzər dənizi içərisində Salyan limanından beş fərsəx məsafədə olan kiçik bir adadır (İbrahimov, 2006:95).

Rusiyadan gələn gəmilər üçün dayanacaq yeridir. O, təxminən 2 əsr bundan qabaq, təxminən 1745 və 1746-cı illərdə abad olmuşdur” (Kərəmov, 1977:182).

Hazırda Sarı yarımadasının şimal hissəsi körfəz boyunca sahilə doğru uzanır, cənub hissəsi isə körfəzi iki hissəyə ayırır:

1. Kiçik Qızılağac
2. Böyük Qızılağac

Qızılağac qoruğunun coğrafi mövqeyi, relyefi onun iqliminin formalaşmasına böyük təsir göstərir. Ərazi Aralıq dənizi subtropik iqlim qurşağında yerləşməklə iqlim xüsusiyyətlərinə görə həmin qurşağa çox oxşayır. Ərazinin şimal və cənub hissələrinin iqlimi bir-birindən fərqlənir:

a) Cənub hissəsi Lənkəran ovalığının rütubətli subtropik iqlimi;
b) Şimal hissəsi Salyan çölünün quru subtropik iqlimi.

Qoruğun ərazisində ümumi günəş radiasiyanın illik miqdarı 130-135 kkal bərabərdir. Qoruqda ən yüksək temperatur iyul-avqust aylarında müşahidə olunur. Bu aylarda orta aylıq temperatur +25°C çatır. Qışda temperatur kəskin aşağı düşür. Yanvarın orta temperaturu +3,7°C olur. Qoruqda orta illik temperatur +14,9°-dən aşağı düşür. Havanın rütubətliyi, temperaturu, buxarlanma, kondensasiya prosesləri hava kütlələrinin tərkibi və onların intensivliyi ilə bağlıdır. Nisbi rütubətliyin bu yüksək qiyməti qış aylarında müşahidə olunur (Məmmədov, Xəlilov, 2005:879).

Qoruğun torpaqları Azərbaycanın düzən torpaqları içərisində öz təbii tarixi şəraitinə görə fərqlənmir. Şimal-qərb hissədə qoruğa qovuşan Salyan çölünün bir hissəsi yaxın geoloji dövrdə dəniz sularından azad olmuşdur. Bu isə ərazinin torpaq və bitki örtüyünün formalaşmasında əsas rol oynamışdır. Ümumiyyətlə, qoruğun düzənlik relyefində çox da dərin olmayan qalın torpaq qatında bozumtul, qleyli, plastik və gilli torpaq növləri vardır. Qoruğun alçaq relyef sahələrində boz-çəmən torpaqları geniş yayılmışdır. Bu torpaqlar içərisində tünd-çəmən, açıq çəmən, allivüal çəmən torpaqları yayılmışdır.

Ərazinin təbii şəraitinin inkişaf tarixi bitki örtüyünün formalaşmasına, rəngarəngliyinə, növ tərkibinin müxtəlifliyinə böyük təsir göstərmişdir. Qoruğun ərazisində 157-yə qədər bitki növü mövcuddur. Qoruğun dəniz dalğalarının altında qalan hissələrində bitki aləmi demək olar ki, yoxdur. Dənizdən azad olan hissələrdə: İran sarmaşığı, Hindistan bağayarpağı, smolevka bitkisi, böyürtkən, nazikyarpaq qumotu, dəvəyarpağı bitir. Kiçik körfəz bitki örtüyü ilə zəngindir. Belə bitkilərdən suçiçəyi, buynuzyarpaq su lələyi, su qamışını göstərmək olar. Qoruğun bitki aləmi xüsusən onun çöllük hissəsində daha zəngindir.

Qoruğun ətraf sahələrində ağac bitkiləri nar, əncir, talkik və çinar ağacları geniş yayılmışdır (Mustafayev, 1970:199).

Yer kürəsinin ən zəngin guşələrindən olan Qızılağac qoruğu quş və heyvan növlərinin yaşaması və yayılması üçün əlverişlidir. Qızılağac qoruğunu "quşlar diyarı" adlandırmaq daha düzgün olar. Burada Avropanın şimalından, Sibirdən, Uraldan, Qazaxıstandan, Qara və Ağ dəniz sahillərindən qışlamaq üçün milyonlarla su və bataqlıq quşları uçub gəlir. Aparılan tədqiqatlar nəticəsində müəyyən olunmuşdur ki, bu qoruqda 180-190 növə qədər müxtəlif quşlar qışlayır. Bunlardan 60 növü su, 33 növü bataqlıq, 34 növü meşə, 32 növü çəmən və cəngəllik, 16 növü isə çöl quşlarıdır. Körfəzin sahil boyu ərazilərində yerli sığırçınkimilər, torağayın müxtəlif növləri, boz, çöl və tarla kəkilli və oynayan çoxraxçıl səciyyəvidir. Qamış və bataqlıq sahələrdə ancaq Azərbaycanda yaşayan və kəklik boyda olan turaca rast gəlinir. Qoruğun ərazisində dəstə halında 200 mindən çox çaydanlar və kürək ayaqlılar yaşayır. Burada ağ vağ, qarıldağ, misir vağları, kiçik qarabatdağ və s. yaşayırlar. Qoruğun ətraf sahələrində müxtəlif növ qağayılara, cüllütlərə rast gəlinir. Qoruqda qazların 4 növü: boz, qaşqa ağbaş qaz və qırmızıdöş qazlar yaşayır.

Qoruğun su hissəsində 31 növ balıq vardır. Kiçik Qızılağac körfəzində 25 növ balığa təsadüf edilir. Onlardan 12 növü vətəgə əhəmiyyətli balıqlardır. Bunlara gülmə ziyad və çəki balıqlar aid edilir. Qoruğun ərazisində suda-quruda yaşayanlardan yaşıl quru qurbağası, göl qurbağası və ağac qurbağası yayılmışdır. Ən çox yayılan sürünənlərdən isə bataqlıq tısbağası, zolaqlı kərtənkələ, oxbaş ilan, koramal, su ilanı, gürzə misal ola bilər.

1931-1932-ci illərdə qoruğa yeni heyvan növü – qunduz buraxdılar. Bu isə müsbət nəticə vermədi. 1935-ci ildə şaxtalar nəticəsində qunduzlar məhv oldu. 1959-cu ildə Kiçik körfəzin şimal-şərq hissəsinə yenidən qunduz buraxdılar. Qunduzlar yerli şəraitə uyğunlaşaraq çoxaldı və sayları ildən ilə artdı. Qoruğun ərazisində yırtıcı heyvanlar da yaşayır. Burada ən çox yayılan canavar, tülkü, çaqqal və çöl pişikləridir. Bu vəhşi heyvanlar qoruğun ornitofaunasına – quşlara o qədər də təhlükə yaratmır.

**Hirkan qoruğu** – Lənkəran və Astara inzibati rayonlarının ərazisində 1936-cı ildə dekabr ayında rütubətli subtropik landşaftı mühafizə etmək məqsədi ilə təşkil olunmuşdur. Qoruğun sahəsi bir neçə dəfə dəyişdirilmiş və 886 hektardan 2906 hektara çatdırılmışdır. Qoruğun 2815 hektarı, yəni 96,9% dağlıq əraziləri əhatə edir və dəniz səviyyəsindən 15-20 metrdən 980 metrə qədər yüksəkliklərə çatır. Qoruğun düzən hissələrində olan meşəliklərdə uzun müddət Moskva alimləri və tələbələri tədqiqat işləri aparmışlar. Həmin ərazi xalq arasında *"Moskva meşəsi"* adlanır. Bu ərazi təxminən 91 hektar və ya 3,1% ərazini əhatə edir. Burada MDB ərazində yeganə Hirkan tipli düzən relikt məşqləri geniş yayılmışdır. Qoruğun ərazisi dağlıq və düzənlik relyef formasına malikdir. Qoruğun ərazisindən Vaşarud, Telman, Dızdaru və başqa kiçik çaylar keçir. Bu çaylar ərazini kəskin parçalamış və geniş dərələr əmələ gətirmişdir.

Qoruğun iqlimi Talışın rütubətli subtropik iqlimi ilə səciyyələnir. Havanın orta illik temperaturu 12-14°, yanvar ayının orta temperaturu 1-3,7° arasında dəyişir. Ən isti ay iyul ayıdır. İyulun orta temperaturu+ 22°-24° arasındadır. Mütləq maksimum temperatur +38° olur. Yağıntıların illik miqdarı 900-1400 mm arasında dəyişir.

Qoruğun torpaqları şaquli istiqamətdə dəyişir. Düzən ərazilərdə qleyli, podzol- sarı torpaqları, tədricən yuxarı qalxdıqca dağ-meşə sarı torpaq tipləri yuxarılarda boz-dağ-meşə torpaqlarından təşkil olunmuşdur.

Hirkan qoruğunun bitki örtüyü zəngindir. Əsasən meşələrdən ibarətdir. Qoruğun 99,8% meşə ilə örtülüdür. Qoruğun faunasını təşkil edən 150 növün 36 növü endemik və relikt bitkilərdən ibarətdir. Bir çox kol və ağac növləri keçmiş SSRİ-nin "Qırmızı kitabı"na düşmüşdür. Bunlardan Lənkəran güləbşirini, məxməri gərməşor**,** xəzərlələyi, şabalıdyarpaq palıdı, vələsyarpaq azat, əncir, meyvəqanadlı yabanqoz, ürək yarpaq, qızılağac, dəmirağac, Hirkan şümşadı, Qafqaz xurması, nar, Hirkan bizotu, enliyarpaq murdarça, Postuxov daşsarmaşığı, Hirkan pirkalı və s. göstərmək olar. Hirkan meşələri çoxyarusludur. 1-ci yarusda 30-35 metrə çatan şabalıdyarpaq palıd və Qafqaz gələsi yer tutur. 2-ci yarusda 15-20 metr hündürlüyə çatan dəmirağacı və 3-cü yarusda yemişan bitkisinin müxtəlif növləri yer alır. Hirkan meşələrində "yaşlı" ağaclar geniş yayılmışdır. Belə ki, palıd 150 il, vələs 130, dəmirağacı 120 il yaşaya bilir. Qoruğun düzənlik hissələrində, əsasən, şabalıdyarpaq palıd, azat, Hirkan qovağı, ağcaqayın, dəmirağac, söyüd, göyrüş, yalanqoz və s. bu kimi ağaclar qarışıq halda bitir. Ağaclarla yanaşı burada ot bitkilərinə də rast gəlinir (İbrahimov, Əsədov, 2015:335).

Qoruğun heyvanat aləmi, əsasən, məməlilərdən, quşlardan, onurğasızlardan, reptellərdən, suda-quruda yaşayanlardan təşkil olunmuşdur. Burada yaşayan heyvan növlərindən bəziləri hələ də zəif öyrənilmişdir. Qoruqda 40-a qədər quş növü qeydə alınmışdır. Bunlardan 25 növü daimi "sakinlər"dir. Hirkan qoruğunda 18 növ məməli qeydə alınmışdır. Qaban, cüyür, porsuq, qamış pişiyi, tülkü, canavar, çaqqal, oxlu kirpi, gəlincik, daşlıq dələsi, su samuru, vaşaq, bəbir, qonur ayı, zolaqlı kaftar, xallı maral və yenot yaşayır. Son zamanlarda Hirkan meşələrində qurulmuş kameralarda pələng qeydə alınmışdır. Əvvəllər burada pələngin yaşaması ədəbiyyatlarda qeyd olunmuşdur. Son zamanlarda onlar yoxa çıxmışdır. Təbiətin mühafizə olunması pələngin yenidən Hirkan meşələrində yaşamasını təmin etmişdir (Əliyev, Həsənov, 1972:99).

Respublikamızda təbiətin mühafizəsi istiqamətində daim dövlət proqramları qəbul olunmuş və qoruqların yaradılması ilə yanaşı müvəqqəti qorunan sahələr − yasaqlıqlar da yaradılmışdır. Yasaqlıqların başlıca vəzifə və funksiyaları ərazinin təbii heyvan, quş və bitkisini qorumaq, onların bərpasını və səmərəli artımını təşkil etmək, kompleks biotexniki tədbirlər həyata keçirmək, ov heyvanları və quşların sıxlığını, buna müvafiq ov normalarını müəyyənləşdirmək, digər qabaqcıl yasaqlıqların təcrübəsini yaymaq, ov təsərrüfatı ilə əlaqədar olan elmi-istehsalat tədbirləri görmək və s. ibarətdir. Bizim cənub bölgəsində − Lənkəran təbii vilayətinin təbiətini mühafizə etmək məqsədi ilə yasaqlıqlar da təşkil olunmuşdur.

**Zuvand yasaqlığı** − 1969-cu ilin iyulunda Lerik və Yardımlı rayonları ərazisində yaradılmışdır. Yasaqlıq Talış dağlarının şimal-şərq yamacında, Lənkəran və Viləşçay hövzəsinin yuxarı hissəsində yaradılmışdır. Yasaqlıq 1400-2500 metr mütləq hündürlüklər arasındadır. Yasaqlıq dağ-quru bozqır şəraitində bezoar keçisi, kəklik və s. heyvan və quşların qorunması məqsədi ilə yaradılmışdır. Yasaqlığın ümumi sahəsi 15 min hektara bərabərdir. Bu respublika ərazisinin 0,17%-ni və respublikamızdakı yasaqlıqlarının ümumi sahəsinin isə 6,2%-ni təşkil edir. Yasaqlığın ərazisi quru bozqır sahələrin əsasən müxtəlif otlu və seyrək arid kollu təbii landşaft sahələrindən ibarətdir. Yasaqlıq dağlıq relyefə malik olan Zuvand çökəkliyində yerləşir. Çökəklik qərb hissədə Ərdəbil çökəkliyi vasitəsi ilə İran yaylasına keçir. Zuvand çökəkliyi çox vaxt xüsusilə yay aylarında cənubdan gələn isti hava kütləsinin təsirinə məruz qalır.

Bununla əlaqədar Zuvand çökəkliyinin iqlimi-yayı quraq keçən dağ-yarımsəhra və quru bozqır iqlimə malikdir. Burada yay isti quru, qışı isə sərin və az rütubətliyi ilə səciyyələnir. Havanın orta illik temperaturu +8°-yə bərabərdir. Yanvar ayı (0-4°), iyul ayında 16-18° temperatura malikdir. İllik yağıntının miqdarı 400 mm, buxarlanma 700 mm-dən artıqdır.

Zuvand yasaqlığı bitki örtüyü ilə kasıbdır. Əsasən quru bozqır bitkiləri və dağ kserofit bitkiləri üstünlük təşkil edir. Tərkib etibari ilə yabanı dənli və paxlalı-dənli bitki qruplarından ibarətdir. Dağ kserofit kolluqlarda gəvən, akanfilimon, itburnu və tək-tək hallarda ardıc kollarına rast gəlinir.

Torpaqları, əsasən, dağ-şabalıdı torpaqlardır. Zuvand çökəkliyinin mərkəzi hissəsində dellüvial yamaclarda tipik şabalıdı torpaqlar mövcuddur.

Yasaqlığın ərazisində heyvanat aləmi kasıbdır. Burada dağ keçisi, çöl donuzu, dovşan, canavar, tülkü və s. heyvanlar, quşlardan isə ən çox kəklik yaşayır.

Zuvand çökəkliyində landşaftın azonallığı müşahidə olunur. Zuvand çökəkliyində landşaftın qorunması üçün lazımi tədbirlərin görülməsi vacibdir. Yasaqlıq elm adamları tərəfindən daha dəqiq öyrənilməli və antropogen təsirin azalması istiqamətində dövlət tədbirləri aparılmalıdır.

**Kiçik Qızılağac yasaqlığı** − Kiçik dövlət təbiət yasaqlığının sahəsi 10,7 min hektara bərabərdir. Yasaqlıq 1978-ci ilin fevralında Lənkəran rayonu ərazisində Kiçik Qızılağac körfəzinin orta və cənub hissəsində yaradılmışdır. Kiçik Qızılağac yasaqlığı Qızılağac qoruğunun tərkibində 1976-cı ildə UNESCO-nun siyahısına əsasən su quşlarının yaşama yerləri kimi beynəlxalq əhəmiyyəti olan sulu-bataqlıq yerlər haqqında Konvensiyanın su-bataqlıq regionunun biri kimi daxil edilmişdir. Yasaqlıq Kür-Araz və Lənkəran ovalıqlarında yerləşmişdir. Yasaqlığın şimal hissəsi mülayim və mülayim-isti iqlim, cənub hissəsi isə mülayim quru və yay iqlimi şəraitində yerləşir. Yasaqlığın ərazisində boz çəmən və çəmən bataqlıq torpaqları mövcuddur. Körfəzin sahilləri isə duzlu şoran torpaqlarla örtülmüşdür. Yasaqlığın yerüstü florası nisbətən kasıbdır. Bataqlıq əraziləri qamış və kollarla örtülüdür.

Kiçik Qızılağac körfəzinin sahəsi 15 min hektara bərabərdir. Körfəzin şimal hissəsinin 5 min ha-ı Qızılağac dövlət qoruğunun ərazisinə daxildir. Qalan hissə isə Kiçik Qızılağac yasaqlığına aiddir. Kiçik Qızılağac yasaqlığında su çiçəkləri, buynuzyarpaq, suləlayi və s. sualtı bitki örtüyü yaranmışdır. Yasaqlıq

ərazisində siyənək, kütüm, çəki, baxa, sıf, çapaq, kefal, xul və s. balıq növləri yaşayır. Yasaqlıqda köçəri və yerli-daimi yaşayan quşlardan turac, dovdaq, mərmər cücə, dəniz qartalı, məzar qartalı, sultan toyuğu, ərsindimdik, qırmızıdöş qaz və s. vardır. Heyvanlardan − məməlilərdən canavar, tülkü, çaqqal, qamış pişiyi, porsuq və s. yaşayır.

Kiçik Qızılağac Dövlət Yasaqlığı əsasən burada yerli və köçəri quşların qorunması məqsədi ilə yaradılsa da, təbiətin bütün fauna və florası qorunur. Burada təbiətin mühafizəsi istiqamətində gələcəkdə görüləcək işlər hələ də çoxdur və bu istiqamətdə dövlət tədbirləri həyata keçirilməlidir.

**Hirkan Dövlət Təbiət Yasaqlığı** − Yasaqlıq Lənkəran və Astara inzibati rayonlarının ərazisində 2005-ci ilin dekabrında yaradılmışdır. Yasaqlığın ərazisi 1553 hektara bərabərdir. Əsasən meşə fondundan olan ərazilərdə yaradılmışdır. Yasaqlığın əsas məqsədi Hirkan Milli Parkı ilə həmsərhəd meşələrin mühafizəsidir. Lakin Azərbaycan Respublikasının "Qırmızı kitabı"na daxil edilmiş nadir və nəsli kəsilmək təhlükəsi altında olan heyvan növlərinin miqrasiya yollarının, həmin ərazidə ekosistemin bütövlüyünün və bioloji müxtəlifliyin qorunub saxlanılmasıdır.

**Rvarud Dövlət Təbiət Yasaqlığı** − Yasaqlığın ərazisi 510 hektara bərabərdir. Bu isə respublikadakı yasaqlıqların ümumi sahəsinin 0,13%-ni, Azərbaycan ərazisinin isə 0,006%-ni təşkil edir. Yasaqlıq Azərbaycan Respublikası Nazirlər kabinetinin 02 oktyabr 2009-cu il sərəncamına əsasən, Lerik rayonunun inzibati ərazisində yaradılmışdır. Yasaqlığın əsas məqsədi ərazidə kompleks landşaftın mühafizə olunmasıdır. Yasaqlığın ərazisində flora və fauna kompleks şəkildə qorunur.

**Hirkan Milli Parkı** − Azərbaycan Respublikası Prezidentinin sərəncamı ilə 9 fevral 2004-cü il tarixində yaradılmışdır. Milli Park Azərbaycanın cənub-şərqində, Lənkəran inzibati rayonu ərazisində yerləşir. Milli Parkın yaradılmasında əsas məqsəd həmin ərazidə təbiətin kompleks şəkildə qorunması, üçüncü dövrün relikt və endemik bitki növlərinin mühafizəsi, Azərbaycan Respublikasının "Qırmızı kitabı"na daxil olan tipik flora və fauna növlərinin qorunub saxlanılması, ətraf mühitin monitorinqinin həyata keçirilməsi məqsədini daşıyır. Eləcə də ictimaiyyətin məlumatlandırılması, tədqiqatların aparılması turizm və istirahət üçün şəraitin təşkil olunmasıdır. Parkın ərazisinin çox hissəsi meşələrlə örtülüdür. Parkın sahəsi 40,358 hektara bərabərdir. Landşaftı əsasən meşə və dağ-meşə landşaftından ibarətdir. Burada Budaqlı danaya, Hirkan bigəvəri, Postuxod dağsarımsağı, Buasye armudu, qanadneyvə, yalanqoz, ürəkyarpaq qızılağac, şabalıdyarpaq palıd, vələsyarpağ azatağacı, vələs, şərq fıstığı və s. relikt və endemik bitkilər yayılmışdır. Heyvanat aləmində qara leylək, hirkan arıquşu, qaratoyuq, sığırçın, çöl muymulu, Talış qırqovulu, Türküstan qırğısı, çöl donuzu, porsuq, yenok, canavar tülkü və s. yayılmışdır. Hirkan Milli Parkında "Qırmızı kitaba" düşmüş bir çox bitki və heyvanat aləminin müxtəlif növləri yaşayır. Bunlara Hirkan şimşəsi, Hirkan qozası, Lənkəran gülxətmisi, giləmeyvəli qara cökə, Talış uzunbığı, Talış məxməri kəpənəyi, qara leylək, cırtdan qartal, tirəkdaz, önasiya bəbiri, vaşaq, zolaqlı kaftar və s. göstərmək olar (Qarayev, 1987:75).

**Qızılağac Milli Parkı** − 2018-ci ilin sentyabrında − 99060 hektarlıq bir ərazidə Qızılağac Dövlət Təbiət Qoruğunun bazasında yeni milli park − Qızılağac Milli Parkı yaradılmışdır. Milli Park Lənkəran − Masallı və Neftçala inzibati rayonlarının ərazisindədir. Əsasən su bataqlıq ərazisi və Xəzər dənizi sahili landşaftını əhatə edir.

Milli Parkın ərazisində bitkilərdən Xəzər şanagülləsi, ağ suzanbağı, ucyarpaq və oxuyarpaq qamış, dəniz liğvəri, ciyən, ətirli yovşan, xəzər salısevdisi, xəzər sarıbaşı və s. geniş yayılmışdır.

Heyvanlar və quşlardan turac, qamışlıq fərəsi, kiçik ağ dağ, çöl donuzu, canavar və s. yaşayırlar. "Qırmızı kitaba" daxil olan flora və fauna mövcuddur. Bunlara qamışlıq pişiyi, adı qızılqaz, ağqaşqaz, adi göydimdik, mərməri ördək, adı bəzgək, çöl heyif misal ola bilər.

Milli Parkın ərazisində turistləri cəlb edən, "Şeyx Zahid" türbəsi, "Xəlifə" türbəsi, "Dairəvi Qaza" ("Zindan") memarlıq abidəsi, "Mirəhməd xanın evi", "Lənkəran mayakı", "Bəlləbur qalası" mövcuddur (12).

Milli Parkın ərazisində turistlərin nəzərini çəkən 4 növ az yayılan və 3 növ Qafqaz endemik bitkisi (yalnız Qafqaz regionunda rast gəlinir) – hibrid qovağı, sapvari bağayarpağı, Qrossgeym topgülü və bir növ endemik buruncuğlu turp qeydə alınmışdır. Bu cür tarixi yerlərin olması və ərazidə endemik və relikt bitkilərin olması gələcəkdə burada turizmin inkişafına geniş imkanlar yaradır.

## Nəticə

Qoruqlar, milli parklar və yasaqlıqlar vasitəsilə respublikanın təbiəti rütubətli subtropik, arid, bozqır və yarımsəhra ərazilərinin quru, dəniz, göl, bataqlıq və çay sahələrinin təbiət kompleksləri, flora, fauna, torpaq və su sərvətləri qorunur. Eləcə də cənub bölgəsi − Lənkəran təbii vilayətinin təbii kompleksləri ərazidə yaradılmış milli parklar, qoruqlar və yasaqlıqlar vasitəsilə qorunur. Bütün bunlara baxmayaraq, Hirkan Dövlət Qoruğunda qiymətli ağac növləri − dəmirağac, şümşad, Qafqaz xurması və s. bu kimi endemik və relikt ağaclar yerli əhali tərəfindən qanunsuz kəsilir, meşə sahəsində il boyu mal-qara otarılır. Meşəliyi əhatə edən təsərrüfatlar da meşəyə mənfi təsir göstərir. Yerli əhali meşədən plansız istifadə edir. Bu da meşənin təbii bərpasına mənfi təsir göstərir.

Qızılağac Dövlət Qoruğu ərazisində yaradılan balıqçılıq təsərrüfatı qoruğun flora və faunasına mənfi təsir göstərir. Köçəri və yerli quş növləri də mövsümündən kənar dövrlərdə ovlanır. Bu da quşların nəslinin kəsilməsinə gətirib çıxarır. Balıq ovu il boyu yerli əhali tərəfindən icazəsiz həyata keçirilir.

Bütün bunların qarşısını almaq məqsədilə cənub bölgəsi Lənkəran təbii vilayətində yeni meşəlik və balıqçılıq təsərrüfatları yaradılmalıdır. Dövlət əraziyə tam nəzarət etmək üçün yeni-yeni qorunan ərazilər yaratmalıdır.

## Ədəbiyyat

1. Budaqov, B. (1977). Təbiət qoruyaq. Bakı: Elm, 73 s.
2. Daşdıyev, R. (2010). Landşaftın ekologiyası. Bakı: MBM, 140 s.
3. Əliyev, H. (1982). Həyəcan təbili. Bakı: Azərnəşr, 176 s.
4. İbrahimov, T. (2011). Azərbaycan qoruqlarının ekoloji problemləri. Bakı: Mars-Print, 255 s.
5. İbrahimov, T. (2006). Qızılağac dövlət qoruğu. Bakı: Mars-Print, 95 s.
6. Kərəmov, N. (1977). Qırx il səyahətdə. Bakı: Azərnəşr, 182 s.
7. Məmmədov, Q., Xəlilov, M. (2005). Ekologiya və ətraf mühit. Bakı: Elm, 879 s.
8. Mustafayev, Q. (1970). Təbiətin qorunması. Bakı: BDU, 199 s.
9. İbrahimov, T., Əsədov, K. (2015). Azərbaycanın Milli Parkları. Bakı: TEAS, 335 s.
10. Əliyev, H., Həsənov, N. (1972). Talışın landşaftı. Bakı: Elm, 99 s.
11. Qarayev, İ. (1987). Azərbaycanın relikt ağacları. Bakı: Azərnəşr, 75 s.
12. https://eco.gov.az

**Rəyçi: coğ.ü.e.n. Kərəm Bayramov**

Göndərildi: 09.08.2022 Qəbul edildi: 18.09.2022

## DƏQİQ ELMLƏR

## EXACT SCIENCES

DOI: https://doi.org/10.36719/2663-4619/83/137-143

**Ramazan Əzizxan oğlu Eyyubov**
Bakı Slavyan Universiteti
riyaziyyat üzrə fəlsəfə doktoru
eyyubov 54@mail.ru
**Günel Vahid qızı Əkbərova**
Bakı Slavyan Universiteti
akberzadeg@mail.ru
**Çinarə Nəriman qızı Məmmədova**
Bakı Slavyan Universiteti
m.n.chinara@gmail.com
**Zəhra Nurbala qızı Abdullayeva**
Bakı Slavyan Universiteti
zaxra_abdullayeva@mail.ru

# MƏSƏLƏ HƏLLİ VƏ ONUN NÖVLƏRİ

**Xülasə**

İşdə qeyd edilir ki, məntiqi təfəkkürün inkişafına birinci sinifdən başlamaq məsləhətdir, çünki həssas dövrün əsas hissəsi ibtidai məktəbə düşür, inamla ifadə etmək olar ki, ibtidai məktəbdə bu istiqamətdə əlavə işlərin görülməsi zəruridir.

İşdə istifadə olunan iş üsulları və formaları məntiqi düşünmə üsullarının (təhlil və müqayisə, ümumiləşdirmə, təsnif, bənzətmə) daha uğurlu inkişafına kömək edir. Məntiqi məsələlər hər bir uşağın şəxsiyyətinə təsir etmək üçün çox güclü bir vasitədir.

İnsan həyatında məntiqi məsələlər vacib bir rol oynayır və eyni zamanda gənc bir tələbənin gələcək işində çox lazım olan yaradıcı təxəyyülün inkişafına böyük təsir göstərir.
***Açar sözlər:*** *əyləncəli məsələ, kəmiyyət, məsələ həlli, ölçü, sürət, şagird, zaman*

**Ramazan Azizkhan Eyyubov**
**Gunel Vahid Akbarova**
**Chinara Nariman Mammadova**
**Zahra Nurbala Abdullayeva**

# Problem solving and its types

**Abstract**

It is noted that it is advisable to start the development of logical thinking from the first grade, because the main part of the sensitive period falls on the primary school, it can be confidently stated that additional work in this direction is necessary in the primary school.Work methods and forms used in the work contribute to the more successful development of logical thinking methods (analysis and comparison, generalization, classification, analogy). Logical problems are a very powerful tool to influence the personality of any child. Logical issues play an important role in human life and at the same time have a great influence on the development of creative imagination, which is very necessary in the future work of a young student.
***Keywords:*** *fun problem, problem solving, quantity, size, speed, student, time*

## Giriş

İbtidai siniflərdə riyaziyyatın tədrisi prosesində məsələ həllinin çox böyük əhəmiyyəti vardır. Məhz məsələ həlli nəticəsində tədris olunacaq bölmə şagirdlər tərəfindən daha yaxşı mənimsənilir. Öyrədiləcək mövzu məsələ vasitəsilə əhatəli şəkildə tədris edilə bilər. Ancaq bunun üçün eyni tip məsələlərdən deyil, müxtəlif növ məsələ tiplərindən istifadə oluna bilər. Riyaziyyatın tədrisi prosesində məsələ anlayışı bir neçə funksiya yerinə yetirməklə uşaqların məntiqi-riyazi təfəkkürünün inkişafı məqsədini daşıyır. Məsələlərin həlli ardıcıllığı ibtidai siniflərdə riyaziyyat fənninin tədrisinin məzmunu və quruluşuna uyğun olmaqla həm nəzəri, həm də praktik materialın bir-birilə qarşılıqlı əlaqə yaratmasında mühüm rol oynayır. Şagirdlər öyrəndikləri nəzəri bilikləri məsələ vasitəsilə praktikada tətbiq etməklə öyrəndiklərini daha da dərinləşdirirlər (Bondarenko, 1981:96). Həmçinin məsələnin şərtindəki verilənlərin ətraf mühitdən götürülməsi isə məsələ vasitəsilə təlimin həyatla əlaqələndirilməsini təmin edir. Bu yol isə uşaqlar üçün daha maraqlı, daha asan olması ilə fərqlənir. Məsələn, bazardan alınan meyvə-tərəvəz, ərzaqlar və s. qiymətini hesablamaq, hərəkətə aid məsələlərdə qət ediləcək məsafəni, sürəti öyrənmək, vaxta aid məsələlərdə zamanı düzgün təyin etmək bacarıqları, kütləyə, ölçməyə aid məsələlər və s. Məsələ həlli vasitəsilə şagirdlər həm yeni biliklər əldə edir, həm də əvvəl öyrəndiklərini möhkəmləndirirlər.

Məsələ həlli ibtidai sinif şagirdləri üçün onların dünyagörüşünü düzgün formalaşdırmaqda mühüm əhəmiyyət kəsb edir. Məsələlər öz məzmununa görədir ki, şagirdlər üçün tərbiyəvi əhəmiyyət daşıyır. Belə ki, məsələdə verilənlər həyatdan götürülməklə dünyada baş verən yeniliklərdən, elm və texnikada baş verən dəyişikliklərdən, insanların əldə etdiyi nailiyyətlərdən, həmçinin şagirdlərin maraq dairəsində olan hadisələrin təsviri və s. ilə bağlıdır.

Əslində məsələ anlayışı ümumi bir anlayış (iqtisadi məsələ, tədris məsələsi, siyasi məsələ və s.) olmasına baxmayaraq, bütün məsələlərin hamısının həlli ardıcıllığı riyazi mənaya söykənir. Riyaziyyatın tədrisində tətbiq olunan məsələlər riyazi məsələlərdir ki, ona bu cür tərif vermək olar:

*Məsələ − kəmiyyətlər arasındakı asılılıqlara və kəmiyyətlərin məlum qiymətinə əsasən, məchul qiymətini tapmaq tələbinə deyilir.* Bu cür məsələlər, əsasən, cümlələr şəklində ifadə olunmuş mətn şəklində olur (Qaralov, 2004:185).

Bugünkü təhsil sistemində riyaziyyatın tədrisi prosesində məsələ həllinə daha çox yer verilməsi ön plana çəkilir. Bunun səbəbi isə odur ki, məsələ həlli təlim prosesində müasir üsul və vasitələrin tətbiqi imkanlarını genişləndirir.

Metodistlərdən bəziləri – Y.M.Kolyagin, A.M.Pişkalo, S.S.Həmidov və s. "tədris məsələsi" anlayışı ilə "məsələ" anlayışını fərqləndirirlər. Doğrudan da, məsələ daha ümumi, həmçinin geniş anlayışdır. Təlimdə praktik cəhətdən tətbiq olunan riyazi məsələləri fərqləndirmək üçün "tədris məsələsi" anlayışı daha konkret olmaqla, tətbiqolunma mexanizmini göstərir. Ancaq məsələnin tədris və qeyri-tədris məsələsi olması onun həlli üsuluna təsir etmir. Belə ki, hər konkret məsələnin müəyyən sayda həlli yolu ola bilər ki, bu da didaktik baxımdan böyük əhəmiyyət kəsb edir.

Məsələlərin hər biri mövcud olan müxtəlif üsul və metodlarla həll olunur. Riyaziyyatın tədrisi metodikasında "tip məsələ" anlayışı da vardır. İ.K.Andropov, A.M.Pişkalo, S.S.Həmidov, N.İ.Kazımov və başqaları həll metodu eyni olan məsələləri müxtəlif qruplara ayıraraq bunları "tip məsələlər" adlandırmışlar. Amma pedaqoqlardan fərqli olaraq A.K.Mordkoviç, N.B.İstomina, A.S.Adıgözəlov, V.V.Statnevir və başqaları "tip məsələ" anlayışının məzmununa, həm də "xüsusi üsullarla həll olunan məsələlər" ifadəsini də əlavə etməyi düzgün hesab edirlər. Bütün bu yanaşmalardan əldə olunan nəticə isə odur ki, həll etmə üsuluna görə məsələlər müxtəlif siniflərə bölünür və ayrılıqda hər bir sinfə aid olan məsələlərin də yalnız bir həll üsulu mövcuddur, yəni buna uyğun bir metod, yol tətbiq olunur. Məlumdur ki, bütün bu deyilənlər mürəkkəb məsələlərə aiddir və hər bir mürəkkəb məsələ isə öz növbəsində iki sadə məsələdən ibarət olur. Bu mürəkkəb məsələnin həlli isə sonda həmin sadə məsələlərin həllinə gətirib çıxarır. Pedaqoq S.S.Həmidov tədqiqatlarının nəticəsində "tam sadə məsələ" və "natamam sadə məsələ" ifadələrini işlədir. Həqiqətən də məsələnin əgər iki veriləni varsa deməli, onun həlli üsulu mövcuddur və bu tam sadə məsələ hesab olunur. Bu xüsusiyyətləri nəzərə alaraq məsələnin həlli ardıcıllığını tapmaq üçün onu düzgün təhlil etmək, nəzərdən keçirmək lazımdır (Perelman, 1998:46).

Yeni növ məsələ həllinin axtarılmasında ən səmərəli üsullardan biri məsələnin təhlil edilməsidir. Məsələnin təhlili dedikdə, onun həlli üsullarının axtarılması, verilən kəmiyyətlərlə axtarılan kəmiyyətlər

arasındakı münasibətlərin aşkar edilməsi, həmin münasibətlər əsasında mürəkkəb məsələnin sadə məsələlərə ayrılması, onların həlli ardıcıllığının müəyyən edilməsi başa düşülür.

Ümumiyyətlə, məsələlərin aşağıda göstərilən təhlil üsulları vardır:

1) Məsələnin analitik üsulla təhlili;

2) Məsələnin sintetik üsulla təhlili.

Bəzi hallarda hətta elə olur ki, mürəkkəb məsələlərin təhlilində hər iki metod eyni bir məsələdə növbə ilə tətbiq olunur. Məsələnin bu cür təhlilinə isə analitik-sintetik üsulla təhlil deyilir (Məmmədova, 2015:250).

**Məsələnin analitik üsulla təhlili**

Bu təhlil üsulu "məchuldan məluma" və ya "naməlumdan məluma" istiqamətində aparılır. Buna həmçinin sualdan verilənlərə doğru aparılan təhlil də deyirlər. Bu zaman "məsələdə nə soruşulur?" sualı verilir və "bunu müəyyən etmək üçün nəyi bilmək lazımdır?" sualına cavab axtarılır. Bu üsulla isə bir neçə natamam sadə məsələdən sonra tam sadə məsələyə gəlib çıxılır:

Aşağıdakı məsələni nəzərdən keçirək:

Bir mağaza bir gündə 15 kiloqram şəkər tozu satdı. Bu, ikinci mağazanın satdığı şəkər tozundan 5 kiloqram çox idi. İkinci mağaza satdığı şəkər tozunu eyni çəkidə olmaqla 5 alıcıya satdı. Hər alıcı neçə kiloqram şəkər tozu almışdı?

Məsələni analitik üsulla təhlil edək:

- Məsələdə nə soruşulur? (Hər alıcı neçə kiloqram şəkər tozu almışdı?);
- Bu sualı cavablandırmaq üçün nəyi bilmək lazımdır? (İkinci mağazanın nə qədər şəkər tozu satdığını);
- Bunun üçün nə etmək lazımdır? (15 kq − 5 kq =10 kq);
- Sonda isə məsələnin sualına cavab tapılır (10:5=2 kq).

*Məsələnin sintetik üsulla təhlili* dedikdə isə "məlumdan naməluma" və ya verilənlərdən suala doğru aparılan təhlil hesab olunur.

Aşağıdakı məsələni nəzərdən keçirək:

Pambıqçılar üç günə 180 kiloqram pambıq yığdılar. Birinci gün 50 kiloqram, ikinci gün isə bundan 10 kiloqram çox pambıq yığılmışsa, bu hesabla, pambıqçılar üçüncü gün neçə kiloqram pambıq yığmışlar?

İndi isə məsələni sintetik üsulla təhlil edək:

- Pambıqçılar üç günə neçə kiloqram pambıq yığmışlar? (180 kq);
- Pambıqçılar ikinci gün neçə kiloqram pambıq yığmışlar? (50 kq +10 kq = 60 kq);
- Pambıqçılar iki gün ərzində neçə kiloqram pambıq yığmışlar? (50 kq + 60 kq = 110 kq);
- Məsələnin sualına cavab vermək üçün nə etmək lazımdır? (180 kq −110 kq = 70 kq).

Məsələnin analitik və sintetik üsullarla təhlilinin həm müsbət, həm də mənfi cəhətləri vardır. Əgər məsələ sintetik metodla təhlil olunubsa, bu zaman şagirdlərin mühakimə aparması asanlaşır. Belə ki, verilənə uyğun sual qoymaq verilən suala cavab tapmaqdan asandır. Sintetik təhlildə bütün iş məlumdan məchula doğru aparılır. Analitik təhlildə isə məchuldan məluma doğru gedir. Ancaq məsələnin sintetik metodla təhlili zamanı şagird elə bir cüt ədəd seçə bilər ki, lazım olmayan artıq həll alına bilər. Burda isə məsələnin sualı xüsusi rol oynayır, o, istiqamətləndirici vəzifə daşıyır. Sintetik metodla təhlildə analiz metodu da iştirak edir. Belə ki, şagird məsələ şərtindən bir cüt ədəd seçərkən onun düzgünlüyünü məsələnin sualına əsasən müəyyən edir. Bundan isə belə nəticə çıxarmaq lazımdır ki, tip məsələ həll edərkən məsələnin həllinə istiqamətləndirən hissəsinə diqqət etmək lazımdır (Perelman, 2000:32).

Mürəkkəb və tip məsələnin analiz metodu ilə təhlili əsas sualdan başlanılır. Sadə məsələ üçün hər sonrakı sual özündən əvvəlki suala istinad etdiyindən artıq düzgün sualın qoyulmaması ehtimalı aradan qalxır.

*Analitik metod* – şagirdlərin məntiqi təfəkkürünü inkişaf etdirən bir metoddur. Buna baxmayaraq analitik metodun da mənfi xüsusiyyətləri vardır. Belə ki, şagird bu metodla məsələ təhlil edərkən ondan böyük gərginlik tələb olunur. Şagird məsələnin sualına cavab verərkən şagirdə lazım olan verilənləri seçməkdə çox çətinlik çəkə bilər (Novruzova, 2017:240).

Xülasə, şagirdlər bu üsulla məsələ təhlil edərkən çalışmaq lazımdır ki, aşağıdakı kimi mühakimə aparsınlar:

"Məsələnin sualı nədir; sualı cavablandıra bilmək üçün hansı verilənlər olmalıdır; məsələnin həlli üçün gərəkli olan verilənlər varmı; hansı üsullardan istifadə etmək lazımdır ki, məsələdə çatışmayan verilənləri tapmaq mümkün olsun?"

Məsələnin həlli:

Məsələnin həlli üçün şifahi olaraq plan tərtib ediləndən sonra onun həllinə başlanılır. Bəs məsələni həll etmək nə deməkdir? Məsələni həll etmək − həllin məlum olan planına uyğun hesab əməllərini yerinə yetirmək deməkdir. Məsələnin 2 həll üsulu vardır: şifahi və yazılı həll. Hələ birinci və ikinci sinifdə uşaqların yazı vərdişləri inkişaf etmədiyindən onlarla daha çox şifahi həll üsulu ilə məşğul olunur. Artıq getdikcə isə məsələnin həlli planı yazılır və plana uyğun mümkün olan əməllərin nəticəsi qısa izahlar şəklində müşayiət olunur (Pichugin, 1989:175).

Məsələnin şifahi həllindən fərqli olaraq yazılı həllində isə əməllər yazılır və buna müvafiq olaraq onların izahatlarını yazmaq da olar və ya şifahi söyləmək də.

İbtidai siniflərdə məsələnin həlli üsullarının müxtəlif yazılış formaları mövcuddur:

1) məsələ uyğun ifadə tərtib edib onun ədədi qiymətinin tapılması;
2) məsələyə uyğun tənlik tərtib edib onun həll edilməsi;
3) məsələ həllinin ayrı-ayrı əməllərə uyğun olaraq yazılması.

Lakin məsələ həllində aşağıdakı yazılış formalarının həyata keçirilməsi daha məqsədəuyğun və səmərəli hesab olunur:

1) məsələ həllinin plana uyğun olaraq yazılması; plan isə sual cümlələri formasında verilir;
2) məsələnin ayrı-ayrı əməllərə uyğun olaraq həll edilməsi və onlara uyğun izahın verilməsi;
3) məsələyə uyğun olaraq ifadənin hazırlanması və onun qiymətinin tapılması;
4) məsələyə uyğun olaraq tənlik tərtib edilməsi və onun həll edilməsi.

İbtidai siniflərdə hesab məsələlərinin planının tərtibinin əsasən sual cümləəri şəklində verilməsi daha səmərəlidir. Belə ki, bu zaman məsələdə lazım olan əsas tələb sual cümləsi şəklində tərtib olunur və bu üslub isə şagirdlər üçün daha çox tanışdır. Həmçinin məsələ həlli zamanı da sual cümlələrindən istifadə olunur. Məsələnin bu formada tərtib edilməsi, şagirdləri bunlarla tanış etməkdə əsasdır (Sadıxov, Kazımov, 1989:92).

Bu yazılış üsulları məsələyə uyğun olan ifadə qurmağa, həmçinin tənlik qurmaqla məsələni tərtib etməklə məsələnin həlli üçün işi daha da asanlaşdırır.

Məsələ cavabının verilməsi, həmçinin onun yazılması didaktik əhəmiyyətə malikdir. Belə ki, bunun nəticəsində şagirdlər məsələnin əsas sualının nə olduğunu yada salır, alınan ədədi əvvəlcədən verilmiş sualla müqayisə edirlər. Bunun nəticəsində məsələ və onun əsas mahiyyəti haqqında şagirdlərdə tam təsəvvür yaranır (Podlasy, 1989:56).

Hal-hazırda ibtidai siniflərdə məsələ həlli işi müxtəlif növ məsələlər üzərində deyil, həlli verilənlərlə axtarılanlar arasında olan eyni bir əlaqəyə əsaslanan məsələ növləri üzərində qurulur. Burda əsas məqsəd odur ki, şagirdlər kəmiyyətlər arasında olan asılılıqları şüurlu surətdə dərk edib, tətbiq etməyi də bacara bilsinlər.

Hansı riyazi məsələlər əyləncəli hesab olunur? Riyaziyyatın ibtidai siniflərdə tədrisi prosesində təlimin mənimsənilməsi üçün şagirdlərdə tədris olunacaq materialların məzmununun daha yaxşı mənimsənilməsi və onu öyrənməyə həvəslə yanaşılması əsas şərtlərdən biridir. Bunun üçün isə əsas vasitələr əyləncəli çalışmalardır.

Məktəb pedaqogikası və psixologiyasında oyunların uşaqların tədrisi və öyrəndiklərinin praktiki olaraq tətbiq edə bilməsində əhəmiyyəti xüsusi olaraq qeyd olunur. Biz tez-tez olduğumuz ictimai müəssisələrdə riyaziyyat təlimi ilə bağlı olan insanlardan "əyləncəli oyun", "əyləncəli iş", "əyləncəli məsələ" kimi ifadələr eşidirik. Bəs bu ifadələr nə məqsədlə işlədilir, niyə məhz onlar əyləncəli hesab olunur? Bilirik ki, əyləncə, oyun uşaqların həyatında xüsusi əhəmiyyət daşıyır. Məhz oyunun sayəsində uşaq ətraf mühiti, həyatda baş verənləri həm əyləncəli olaraq dərk edir, həm də öyrəndiyinə maraqla yanaşır. Necə deyərlər, həm əylənir, həm öyrənir. Bununla yanaşı uşaq, həmçinin ətrafda olan real aləmin quruluşu, miqdari münasibətlərini də öyrənir. Riyaziyyat dərslərində oyunların təşkil edilməsi dərsləri maraqlı edir. Bunun nəticəsində isə uşaqların öyrənməyə olan həvəsi artır, onlar dərsdə fəal iştirak edirlər. Təhsil, tədris sahəsinə aid edildikdə isə ümumilikdə götürüləndə "əyləncə" sözü şagirdlərin təlimə, riyaziyyat fənninə, dərsdə olan çətin məsələlərə olan marağı artırmaq məqsədi ilə istifadə olunur. Bir çox

hallarda maraqlı və ya əyləncəli məsələlərdə həyatda baş verə bilən və ya ümumiyyətlə, qeyri real, ağlagəlməz məqamlarla bağlı olan riyazi münasibətlər, kəmiyyətlərin ədədi qiymətləri verilir və məlum olmayan, naməlum qiymətin tapılması tələb olunur. Həm ibtidai sinif, həm də bağça yaşı dövründə riyazi məzmunlu oyunlardan da istifadə edilir. Bu oyunların uşaqların nəsə öyrənməsində çox böyük didaktik əhəmiyyəti vardır. Məhz buna görə də didaktik oyunların bu cür əhəmiyyəti nəzərə alınaraq həmin oyunlar sistemləşdirilərək tədris olunur (İbrahimov, 2006:38).

Həyata keçirilən tədqiqatlar və əldə edilən nəticələrə əsasən sübut olunmuşdur ki, əyləncəli formada olan məsələ və misalları keçirilən dərslərdə tətbiq etdikdə onların şagirdlər tərəfindən maraqla qarşılanması və həlli effektivliyi artır.

Riyaziyyatın tədrisi üçün nəzərdə tutulmuş olan "məsələ" anlayışı metodist alimlər tərəfindən müxtəlif formada, müxtəlif mənalarda izah edilir. Məsələn, L.M.Fridmana görə "məsələ" – problemli situasiyanın modelidir. Ümumi formada desək, məsələ − başlanğıc verilənləri olan bir situasiyadır ki, bu da verilənlərə əsasən məsələdə verilmiş olan sualın tapılmasıdır.

Bəzi metodistlərə görə isə tədris məsələsi üçün həm obyektiv, həm də subyektiv xüsusiyyətlər ola bilər (Vilenkin, 1998:384). Obyektiv xüsusiyyətlərə − fəaliyyət predmeti, həllin məntiqi quruluşu, məsələ şərtlərinin sayı (müəyyənlik və qeyri-müəyyənlik) və s. aiddir. Məsələnin subyektiv xüsusiyyətlərinə isə məsələnin həlli üçün olan üsul və qaydaları aid etmək olar.

Sadalanan bu xüsusiyyətləri, həmçinin əyləncəli məsələlərə də tətbiq etmək olar. Bəzi metodistlər əyləncəli məsələ anlayışına aşağıda sadalananları aid edir:

- Məsələnin ifadə forması;
- Məsələnin sujeti;
- Məsələnin illüstrativ materialının əyləncə xarakter daşıması.

Əyləncəli məsələdə bəzən elə olur ki, cavab heç ağıla gəlməyən formada, əslində çox asan və rahat üsulla alınır. Bu da şagirdlərin marağına səbəb olur.

Bütün bu sadalananlardan sonra əyləncəli məsələlər üçün xarakterik olan əlamətlərin hansılar olduğunu demək olar? Bu əlamətlər aşağıdakılardır:

- İnkişafetdirici xüsusiyyət;
- Verilənlər hər zaman tətbiq olunan formada icra olunmur, bunun üçün tam fərqli metod və üsullardan istifadə olunur;
- Verilənlər, həmçinin təsvir edilən məqamlar həm real, həm də uydurulmuş ola bilər;
- Bu cür məsələlər, əsasən, mühakimə əsasında həll olunur, bunun üçün isə heç bir riyazi yazılış tətbiq olunmur;
- Bu cür məsələlərin sualı da standart formada deyil, qeyri-adi şəkildə ifadə olunur.

*Məsələ 1*: Tamaşaya bilet almaq üçün növbəyə düzülərkən mən gələndə beşinci idim. Bileti almaq üçün mən daha neçə nəfərin bilet almasını gözləməli idim?

*Məsələ 2*: Gülnar yeni əkilən səmənini gün ərzində hər 3 saatdan bir sulamalı idi. Bu hesabla, Gülnar bir gün ərzində səmənini neçə dəfə sulamış olar?

Bu tip məsələlərin cavabını tapmaq üçün şagirddən mühakimə, müşahidə, hesablama tələb edilmir, sadəcə bir qədər diqqətli olub düzgün cavabı tapmaq lazımdır (Həmidov, 2002:22).

Əyləncəli məsələlərin bölgüsünü nəzərdən keçirdikdə aydın olur ki, bu bölgü eynilə ibtidai siniflərdə keçirilən hesab məsələlərinin bölgüsü ilə eynilik təşkil edir. Buna aşağıdakılar daxildir:

1) Məsələ həllində həyata keçirilən əməllərin sayı;
2) Məsələdə olan şərtlərin sayı;
3) Məsələ şərtinin ifadə tərzi.

Bundan əlavə məsələləri *ifadə formasına görə* də təsnif etmək olar. Belə ki, burada məsələdə informasiyanın verilməsi üsuluna görə olan təsnifat nəzərdə tutulur ki, buna da aşağıdakılar aid ola bilər:

- Kəmiyyətlər arasındakı riyazi münasibətlərin də olduğu situasiyanın sözlərlə ifadəsi (mətnli məsələ);
- Məsələdəki situasiyanın qrafik və ya cədvəl şəklində təsviri;
- Şəkillər vasitəsilə təsviri.
- Məsələləri həm də *həlli üsullarına görə* təsnif etmək olar. Bu bölgü isə aşağıdakı kimi ola bilər:
- hesab üsulu ilə həll olunan məsələlər;

- cəbri üsulla həll olunan məsələlər;
- həndəsi üsulla həll olunan məsələlər;
- qrafik üsulla həll olunan məsələlər.
- Məsələləri *təlim məqsədlərinə görə* təsnifini isə aşağıdakı kimi bölmək olar:
- didaktik funksiyalı məsələlər;
- idraki məsələlər;
- inkişafetdirici məsələlər və s.
- Bəzi metodistlər məsələləri məsələdə iştirak edən komponentlərdən neçəsi məlum deyil prinsipinə uyğun olaraq 4 qrupa ayırır:
- Məsələnin bütün komponentləri məlumdur;
- Məsələnin yalnız bir komponenti naməlumdur;
- Məsələnin iki komponenti naməlumdur;
- Məsələnin üç komponenti naməlumdur.

Sadalananlardan olan 4-cü növ məsələlər əlavə məlumat olmadan çətin həll olunur. Bəs məsələnin komponenti nədir? Məsələnin komponenti dedikdə bunlar nəzərdə tutulur: məsələnin şərtləri, nəticəsi, məsələnin həlli.

Ədəbiyyatlarda məsələlərin başqa təsnifatları da vardır. Bu cür təsnifatı verənlərdən biri də İ.V.Yeqorçenko olmuşdur. O isə məsələləri belə təsnif etmişdir:

- Standart tətbiqi məsələlər;
- Standart olmayan tətbiqi məsələlər;
- Standart olmayan qeyri tətbiqi məsələlər;
- Ümumiyyətlə, məsələ olmayan təklif və ya mətn.

Bu cür təsnifatı verən zaman pedaqoq məhz əyləncəli məsələləri nəzərdə tutur və bu zaman standart olmayan məsələ həlli prosesini ənənəvi olaraq qəbul edir:

1) məsələnin qoyuluşu;
2) həll prosesi;
3) cavabın qeyd olunması;
4) həllin yoxlanılması.

Bu mərhələdən əlavə növbəti mərhələnin – *tərs məsələlərin* də olması daha məqsədəuyğun olardı. Belə ki, şagirdlər məsələ tərtib etməklə məsələnin riyazi strukturunu daha yaxşı mənimsəyir və daha yaxşı yaradıcı qabiliyyətləri inkişaf edir (Volodarskaya, 2006:245).

Bəzi metodistlərin təsnifinə əsasən birinci növ məsələlərə aşağıdakı göstərilən məsələlər aid edilir:

- verilənləri kifayət edəcək qədər olmayan və ya məsələ həlli üçün artıq verilənləri olan məsələlər;
- sualı aydın formada qoyulmayan məsələlər;
- yalnız əyani – illüstrativ şəkildə verilən məsələlər (şəkil, sxem, diaqram, analitik və ya ədədi ifadə, tənlik şəklində verilən məsələlər);
- analogiya və ya ümumiləşdirmə əsasında həll olunan məsələlər;
- oyun, praktik iş və ya laborator işi şəklində verilən məsələlər;
- bu və ya hansısa digər təklifi əsaslandırmağa aid məsələlər.

Onu da qeyd edək ki, ibtidai siniflərdə həll edilən məsələlər əsas etibarilə praktiki, tətbiqi xarakter daşıyır. Ona görə ki, elə əsasən ibtidai siniflərdə tətbiq edilən riyaziyyat təlimi bunu tələb edir. Belə ki, əgər bunun əksinə olsaydı, onsuz da qəliz olan riyaziyyat uşaqlar üçün daha da anlaşılmaz olardı. Elə buna görədir ki, burda "tətbiqi" sözünü xüsusi olaraq vurğulamağa ehtiyac yoxdur. Ancaq elə ibtidai sinifdən başlayaraq riyaziyyatdan induktiv yolla ümumiləşdirmə aparmağa və ya analogiya üsulu ilə məsələlərin həll edilməsinə də yer vermək lazımdır. Bunu 3-cü, 4-cü siniflərdən başlamaq olar. Məhz belə olduqda şagirdlər məsələləri həll edən zaman mühakimə aparmaq, bir-birilə əlaqələndirmək kimi məntiqi əməliyyatlara yavaş-yavaş yiyələnmiş olurlar (Vilenkin, 1998:384).

İ.V.Yeqorçenko kəmiyyətlər arasında olan qarşılıqlı əlaqəyə əsaslanan məsələləri tətbiqi olmayan məsələlər adlandırır. İbtidai siniflərdə keçilən bütün kəmiyyətlər məsələ həlli vasitəsilə öyrədilir. Buraya bir obyekt kimi nəzərdə tutulan (maddi varlıq) kəmiyyətlər və hadisə olan (vaxt, temperatur) kəmiyyətlər aiddir. Lakin bu halların hər ikisində praktika əsas rola malikdir. Belə ki, bu mövzular yalnız praktikada tətbiq olunan zaman şagird tərəfindən mənimsənilir.

## Nəticə

Birinci sinifdə riyaziyyatın əsas vəzifələrindən biri uşaqlara toplama və çıxma işlərinin öyrədilməsidir. Bu mövzuda uşaq bağçalarında əsasən hazırlıq işləri aparılır. Uşaqlar hesab məsələləri tərtib edərək və həll etməklə hesab öyrənirlər. Bu iş hesab əməliyyatların mənasını anlamağa və onlara şüurlu şəkildə müraciət etməyə, kəmiyyətlər arasında əlaqələr qurmağa imkan verir.

Bundan əlavə, uşaqlara hesab məsələləri həll etməyi öyrətmək məntiqi təfəkkürün, ixtiraçılığın, zəka, iradənin formalaşması, əzmkarlıq, müstəqillik öyrətmək kimidir.

## Ədəbiyyat

1. Bondarenko, S.M. (1981). Uşaqlara müqayisə etməyi öyrət. Bakı: Bilik, 96 s.
2. Qaralov, Z. (2004). Riyaziyyat I-IV. Bakı: Elm, 185 s.
3. Perelman, Ya.İ. (1998). Canlı riyaziyyat. Bakı: Maarifçilik, 242 s.
4. Məmmədova, T. (2015). İbtidai sinif riyaziyyat dərslərində modelləşdirmə metodunun tətbiqinin inkişafetdirici funksiyaları. Müəllim hazırlama siyasəti və problemləri. V Beynəlxalq Simpozium, Bakı, 250 s.
5. Perelman, Ya.İ. (2000). Əyləncəli hesab. Bakı: Maarifçilik, 198 s.
6. Novruzova, X.T. (2017). İbtidai siniflərdə şagirdlərin fəza təsəvvürlərinin inkişaf etdirilməsində modelləşdirmə. Konfrans materialları. Bakı: SDU, 240 s.
7. Pichugin, L.F. (1989). Riyaziyyatın tədrisində şagirdlərin təhsili. Moskva, 175 s.
8. Sadıxov, N.A., Kazımov, H.C. (1989). Ədəd anlayışının genişləndirilməsi, kəmiyyətlər və onların ölçülməsi. Bakı, 92 s.
9. Podlasy, İ.P. (1989). Effektiv dərsi necə hazırlamaq olar. Kiyev, 245 s.
10. İbrahimov, F. (2006). İbtidai məktəbdə riyaziyyat tədrisinin bəzi məsələləri. Bakı, 214 s.
11. Həmidov, S. (2002). İbtidai siniflərdə riyaziyyatın tədrisi metodikası. Bakı: ADPU.
12. Volodarskaya, İ. (2006). Modelləşdirmə və problemin həllində onun rolu. Kiyev, 245 s.
13. Vilenkin, N.Y. (1998). Riyaziyyat. Moskva, 384 s.

Göndərildi: 05.08.2022 Qəbul edildi: 12.09.2022

## TEXNİKA ELMLƏRİ

## TECHNICAL SCIENCES

DOI: https://doi.org/10.36719/2663-4619/83/144-149

**Kifayət Əliqamət qızı Dolxanova**
Bakı Slavyan Universiteti
kifayat.dolxanova@yandex.com

# TƏHSİL SİSTEMİNDƏ YENİ İNFORMASİYA TEXNOLOGİYALARINDAN İSTİFADƏ METODLARI

**Xülasə**

Məqalədə məqsədim müasir təhsil sistemində informasiya texnologiyalarından istifadənin xüsusiyyətlərini nəzərdən keçirmək, informasiya texnologiyalarından istifadə edərək tələbələrin idrak fəaliyyətinin aktivləşdirilməsinin psixoloji və pedaqoji xüsusiyyətlərinin öyrənilməsidir. Müasir təhsilin inkişafında informasiya texnologiyaları mühüm rol oynayır. Təhsil almaq insanın həyatında mühüm mərhələdir, çünki insanın müasir cəmiyyətin həyatında uğurlu iştirakının əsası, məhz məktəb təhsilində qoyulur.

İşin məqsədi təhsildə informasiya texnologiyalarından istifadənin xüsusiyyətlərini nəzərdən keçirməkdir. Tədris prosesinin informasiyalaşdırılmasının müsbət və mənfi tərəflərini müəyyən etmək, onun vəzifəsinin öhdəsindən gələ bilməkdir. Hazırda cəmiyyətdə həyatın demək olar ki, bütün sahələrinin fəal kompüterləşdirilməsi və informasiyalaşdırılması prosesi gedir, çünki müasir cəmiyyət uğurlu həll yoluna keçid istiqamətində sürətlə inkişaf edir. Bütün səviyyələrdə təhsilin keyfiyyətinin və əlçatanlığının yaxşılaşdırılmasına öz töhfəsini verəcəkdir. İnformasiya ehtiyatları, onların saxlanması və ötürülməsi texnologiyaları burada əsas rol oynayır. Belə ki, İT məktəbdən təlim sistemlərinə və mütəxəssislərin yenidən hazırlanmasına, milli təhsil sisteminin dünya birliyinin elmi, istehsalat, sosial və mədəni informasiya infrastrukturuna inteqrasiyası, saxlanması və yayımıdır.

***Açar sözlər:*** *informasiya texnologiyaları, obyekt, informasiya prosesləri, hadisə, pedaqoji texnologiya*

**Kifayat Aligamat Dolkhanova**

## New information in the education system methods of using technologies

**Abstract**

In the article, my goal is to consider the features of the use of information technology in modern education, the study of the psychological and pedagogical features of enhancing the cognitive activity of students using information technology. The purpose of the work was to consider the features of the use of information technology in education.

Find out how important and necessary information resources are in modern education. The work tells in detail about the use of information technology in education, about the methods of using information technology in the classroom. We also managed to cope with the task of identifying the advantages and disadvantages of informatization of the educational process.

At present, an active process of computerization and informatization of almost all aspects of life is taking place in society, as modern society is rapidly developing in the direction of the transition to an information society, in which information resources, technologies for their storage and transmission play a key role.

***Keywords**: information technologies, object, information processes, event, pedagogical technology*

## Giriş

İnformasiya texnologiyalarının tarixi XX əsrdə meydana çıxan müasir informatika elminin yaranmasından xeyli əvvələ təsadüf edir. İnformasiya texnologiyaları obyektin, prosesin və ya hadisənin vəziyyəti haqqında yeni keyfiyyətli məlumat əldə etmək üçün məlumatların toplanması, emalı və ötürülməsi, üsul və vasitələrinin öyrənilməsi ilə əlaqələndirilir.

Bəşəriyyətin inkişafı nəticəsində məlumatların emalına artan tələbatını nəzərə alaraq, məlumat əldə etmək vasitələri ən erkən mexaniki ixtiralardan müasir kompüterlərə qədər təkmilləşdirilmişdir. Həmçinin informasiya texnologiyaları çərçivəsində hazırda müasir anlayışları formalaşdıran əlaqəli riyazi nəzəriyyələrin inkişafı müşahidə olunur. “İnformasiya texnologiyası” termini ilk dəfə 1958-ci ildə Harvard Business Review (Harvard Business) jurnalında dərc olunmuş məqalədə ortaya çıxdı; müəlliflər Harold J. Leavitt və Thomas L. Whisler şərh edirdilər ki, “yeni texnologiyanın hələ vahid, müəyyən edilmiş adı yoxdur. Biz bunu informasiya texnologiyaları adlandıracağıq”. Onların tərifi üç kateqoriyadan ibarətdir: emal üsulları, qərar qəbul etmək üçün statistik və riyazi metodların tətbiqi və kompüter proqramları ilə yüksək səviyyəli düşüncənin modelləşdirilməsi (Robert, 2009:114).

İlk informasiya sistemlərinin yaranması və inkişafı ilə yanaşı, 1960-cı illərdən etibarən informasiya texnologiyaları fəal şəkildə inkişaf etməyə başladı. İnternetin inkişafı, eləcə də infrastruktur və xidmətlərə investisiyalar 1990-cı illərin sonlarında informasiya texnologiyaları sənayesinin sürətli böyüməsinə səbəb oldu. Tədqiqatımızın obyekti təhsildə informasiya texnologiyalarından istifadəyə yönəlmiş məktəb təhsilində tədris prosesidir.

Son 10 ildə kompüterdən istifadə etməyi bacaran uşaqların sayı təxminən 10 dəfə artıb. Əksər tədqiqatçıların qeyd etdiyi kimi, təhsildən asılı olmayaraq bu tendensiyalar sürətlənəcəkdir. Bununla belə, uşaqlar əsasən oyun kompüter proqramları ilə tanış olurlar və əyləncə üçün kompüter texnologiyasından istifadə edirlər. Eyni zamanda, kompüterlə işləmək üçün idrak, xüsusən də təhsil motivləri ilk növbədə deyil. Beləliklə, idrak və təhsil problemlərini həll etmək üçün kompüterdən kifayət qədər istifadə edilmir. İnformasiya texnologiyaları indi təhsil prosesi üçün zəruri şərtdir (Kiselev, Bochkova, 2014:297).

İnformasiya texnologiyalarının tarixi XX əsrdə meydana çıxan müasir informatika intizamının yaranmasından xeyli əvvələ təsadüf edir. İnformasiya texnologiyaları obyektin, prosesin və ya hadisənin vəziyyəti haqqında yeni keyfiyyətli məlumat əldə etmək üçün məlumatların toplanması, emalı və ötürülməsi üsul və vasitələrinin öyrənilməsi ilə əlaqələndirilir. Bəşəriyyətin artan həcmdə məlumatların emalına artan tələbatını nəzərə alaraq, məlumat əldə etmək vasitələri ən erkən mexaniki ixtiralardan müasir kompüterlərə qədər təkmilləşdirilmişdir. Həmçinin informasiya texnologiyaları çərçivəsində hazırda müasir anlayışları formalaşdıran əlaqəli riyazi nəzəriyyələrin inkişafı müşahidə olunur (Stolyarenko, Samygin, 2010:139).

Müasir mənada “informasiya texnologiyası” termini ilk dəfə 1958-ci ildə Harvard Business Review (Harvard Business) jurnalında dərc edilmiş məqalədə ortaya çıxdı; müəlliflər Harold J. Leavitt və Thomas L. Whisler şərh edirdilər ki, “yeni texnologiyanın hələ vahid, müəyyən edilmiş adı yoxdur. Biz bunu informasiya texnologiyaları adlandıracağıq”. Onların tərifi üç kateqoriyadan ibarətdir: emal üsulları, qərar qəbul etmək üçün statistik və riyazi metodların tətbiqi və kompüter proqramları ilə yüksək səviyyəli düşüncənin modelləşdirilməsi. Saxlama və emal üçün istifadə olunan texnologiyalara, əsasən, informasiya texnologiyalarının inkişafının dörd fərqli mərhələsini ayırd etmək olar: mexaniki (e.ə. 3000 - eramızdan əvvəl 1450), mexaniki (1450-1840), elektromexaniki (1840-1940) və elektron (1940) - indiki) (Kiselev, Bochkova, 2014:112).

İlk informasiya sistemlərinin yaranması və inkişafı ilə yanaşı, 1960-cı illərdən etibarən informasiya texnologiyaları fəal şəkildə inkişaf etməyə başladı. İnternetin inkişafı, eləcə də infrastruktur və xidmətlərə investisiyalar 1990-cı illərin sonlarında informasiya texnologiyaları sənayesinin sürətli böyüməsinə səbəb oldu. Tədqiqatımızın obyekti olaraq təhsildə informasiya texnologiyalarından istifadəyə yönəlmiş məktəb təhsilində tədris prosesidir (Rüstəmov, 2013:7).

İnformasiya texnologiyaları bunlardır:

- istifadəçi üçün mövcud olan istənilən daşıyıcıda istənilən formada verilmiş məlumatın qəbulu, ötürülməsi, kodlaşdırılması, emalı və çoxaldılması üsulları;
- informasiya yaratmaq, toplamaq, ötürmək, saxlamaq və emal etmək üçün istifadə olunan elmi və mühəndis bilikləri, metod və alətlər sistemi;

- informasiya ilə işləmək üçün xüsusi metodlardan, proqram və texniki vasitələrdən istifadə edən pedaqoji texnologiya.
- Təhsilin informasiya texnologiyası xüsusi metodlardan, proqram və texniki vasitələrdən istifadə edən pedaqoji texnologiyadır (Suvorova, 1990:137).
- İnformasiya texnologiyalarından istifadənin pedaqoji məqsədləri:
- şəxsi inkişaf (təfəkkür, estetik tərbiyə, eksperimental tədqiqat fəaliyyətində bacarıqların inkişafı, informasiya mədəniyyətinin formalaşdırılması);
- sosial sifarişin yerinə yetirilməsi (istifadəçinin ümumi məlumat hazırlığı, müəyyən sahədə mütəxəssis hazırlığı);
- təhsil prosesinin intensivləşdirilməsi (təhsilin səmərəliliyinin və keyfiyyətinin yüksəldilməsi, idrak fəaliyyətinin motivlərinin təmin edilməsi, informasiya və fənn hazırlığının inteqrasiyası yolu ilə fənlərarası əlaqələrin dərinləşdirilməsi) (Tixonov, 2007:111).

Məktəbin tədris prosesində informasiya texnologiyalarının tətbiqinin əsas istiqamətləri bunlardır:

- müxtəlif məqsədlər üçün pedaqoji proqram təminatının hazırlanması;
- təhsil saytlarının hazırlanması;
- metodiki və didaktik materialların işlənib hazırlanması;
- qlobal və lokal şəbəkələrdə müxtəlif formalı informasiyanın axtarışı, onların toplanması, yığılması, saxlanması, emalı və ötürülməsi;
- elektron kitabxanaların yaradılması;
- tələbələrin intellektual asudə vaxtlarının təşkili.

İş tapşırıqları:

- təhsildə informasiya texnologiyalarından istifadəni müəyyən etmək;
- dərsdə informasiya texnologiyalarından istifadə üsul və üsullarını öyrənmək;
- tədris prosesinin informasiyalaşdırılmasının üstünlüklərini və mənfi cəhətlərini müəyyən etmək;
- informasiya texnologiyalarından istifadə etməklə şagirdlərin idrak fəaliyyətinin aktivləşdirilməsinin psixoloji-pedaqoji xüsusiyyətlərini öyrənmək (Fedotova, Fedotov, 2010:221).

Müasir texnologiyalar və telekommunikasiyalar tədris prosesinin təşkilinin xarakterini dəyişməyə, şagirdi informasiya-təhsil mühitinə tamamilə cəlb etməyə, təhsilin keyfiyyətini yüksəltməyə, informasiyanın qavranılması və biliklərin mənimsənilməsi proseslərini stimullaşdırmağa imkan verir.

Yeni informasiya texnologiyaları müxtəlif fəaliyyət sahələrində, o cümlədən təhsildə təşkili və idarə olunması üçün kompüter və telekommunikasiya dəstəyi üçün mühit yaradır. Ölkədə aparılan məktəb islahatı təhsilin məzmununun müasir elmi bilik səviyyəsinə uyğunlaşdırılmasına, bütün tədris işlərinin səmərəliliyinin artırılmasına və şagirdlərin informasiya cəmiyyətinə keçid şəraitində fəaliyyətə hazırlanmasına yönəlib. Buna görə də informasiya texnologiyaları təhsilin məzmununun ayrılmaz tərkib hissəsinə, təhsil prosesinin optimallaşdırılması və səmərəliliyinin artırılması vasitəsinə çevrilir, eyni zamanda inkişaf təhsilinin bir çox prinsiplərinin həyata keçirilməsinə kömək edir (Shchukina, 1971:217).

Son onillikdə dünya çox dəyişdi... Elm təbiəti bilməkdə irəlilədi, sənaye çoxlu sayda yüksək ixtisaslaşdırılmış sənaye sahələri ilə meydana çıxdı və inkişaf etdi. Bu proses sürətlə inkişaf edir və daha da sürətlə inkişaf edəcəkdir, çünki o, bəşər sivilizasiyasının inkişafının obyektiv qanunauyğunluqlarına əsaslanır. Cəmiyyət birdən-birə elm və texnikanın çox dar sahələrində milyonlarla mütəxəssisə və eyni zamanda, bu ən çətin şəraitdə iqtisadiyyatı idarə etməyə qadir olan milyonlarla menecerə ehtiyac duydu. Amma biz hələ də bu milyonların ixtisaslarının daim təkmilləşdirilməsini təmin etməliyik! (Novruzova, 2017:83).

Demək olar ki, bütün inkişaf etmiş ölkələrdə müstəqil olaraq zəruri məlumatları əldə etmək, problemləri təcrid etmək və onların rasional həlli yollarını axtarmaq, əldə edilmiş bilikləri tənqidi təhlil etmək və yeni problemlərin həllində tətbiq etmək bacarığının öyrənilməsi istiqamətində kəskin dönüş yaranmışdır. İdeal təlim sistemi aşağıdakıları etməlidir:

- Şagirddə öyrənmək istəyini və öyrənmə məqsədini formalaşdırmaq;
- Hər bir tələbəni fərdi olaraq uyğunlaşdırılmış tədris vəsaitləri ilə təmin edin;
- Öyrənmə və yaradıcılıq üçün motivasiyanı qoruyun;
- Hər bir tələbəyə fərdi cədvəl üzrə təhsil almaq imkanı verin;
- Təlim nəticələrini davamlı olaraq qiymətləndirin.

